Bu kitab "Qarabağnamə " (Bakı, Azərbaycan Elmlər Akademiyası nəşriyyatı, 1950) və "Qarabağnamələr. I kitab" (Bakı, Yazıçı, 1989) nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır

Tərtib edəni: **Akif Fərzəliyev**

Elmi redaktoru: **Nazim Axundov**

**947.54-dc22**
**AZE**
**Qarabağnamələr. I kitab.** Bakı, "Şərq-Qərb", 2006, 216 səh.

Bu kitabda Azərbaycanın XIX əsr maarifpərvər tarixçiləri Mirzə Adıgözəl bəyin, Mirzə Camal Cavanşir Qarabağinin, Əhməd bəy Cavanşirin Qarabağ haqqında tarixi, ədəbi-bədii, publisistik oçerkləri toplanmışdır.

**ISBN10 9952-34-068-0**
**ISBN13 978-9952-34-068-6**

## TƏRTİBÇİDƏN

Azərbaycan MEA M.Füzuli adına Əlyazmaları İnstitutunda Qarabağ tarixinə dair böyük əhəmiyyət kəsb edən onlarla əsər və tarixi sənədlər saxlanılır. Təəssüf ki, Qarabağa göz dikən erməni ekstremistlərinin haqsız tələblərinin cılızlığını və əsassız olduğunu bir daha açıb göstərən və sübuta yetirən bu mənbələrin çoxu çap olunmamış və lazımınca araşdırılmamışdır.

Bu boşluğu aradan qaldırmaq üçün "Qarabağnamə"lər adlı bu kitabı üç kitabda çap etməyi nəzərdə tutmuşuq.

Birinci kitaba XVIII-XIX əsrlər Qarabağ tarixini əhatə edən üç mənbə daxil edilmişdir. Bunlardan Mirzə Adıgözəl bəyin "Qarabağnamə"si, Mirzə Camal Cavanşir Qarabağinin "Qarabağ tarixi" və Əhməd bəy Cavanşirin "Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair" əsərləri çox az tirajla 1950, 1959, 1961-ci illərdə çapdan çıxmış və indi nadir kitablar sırasına daxildir[1].

Mirzə Adıgözəl bəy öz əsərini Azərbaycan dilində, Mirzə Camal Cavanşir fars və Əhməd bəy Cavanşir isə rus dillərində yazmışlar. Yuxarıda adı çəkilən müəlliflərin əsərləri Azərbaycan MEA M.Füzuli adına Əlyazmaları İnstitutunda saxlanılır. Buraya Mirzə Adıgözəl bəyin "Qarabağnamə"sinin 1862-1914-cü illərdə üzü köçürülmüş beş əlyazma nüsxəsi[2], Mirzə Camalın "Qarabağ tarixi"nin 1877-ci ildə katib tərəfindən köçürülmüş M-195 şifrli nüsxələri daxildir.

Mirzə Adıgözəl bəyin əsərindən fərqli olaraq, Mir Mehdi Xəzaninin "Qarabağ tarixi"ndə bəzi çox çətin anlaşılacaq yerlərin müasir dilə çevrilməsini nəzərə almasaq, demək olar ki, müəllifin öz dilini saxlamışıq.

"Qarabağnamə"lərdə müəlliflər əsasən Qarabağın tarixi coğrafiyasını, etnik tərkibini, Qarabağda və onun ətrafında baş vermiş siyasi hadi-

---

1 Mirzə Adıgözəl bəy. Qarabağnamə (müqəddimə və Mirzə Adıgözəl bəyin tərcümeyi-halına aid materiallar V.N.Leviatovundur), Bakı, 1950; Mirzə Camal Cavanşir Qarabaği. Qarabağ tarixi (farscadan tərcümə, müqəddimə, qeydlər və adlar göstəricisi. F.Babayevindir), Bakı, 1959; Əhməd bəy Cavanşir. Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair (Əhməd bəy Cavanşirin tərcümeyi-halı, ruscadan tərcümə və qeydlər Ə.B.Şükürzadənindir), Bakı, 1961.

2 Azərbaycan MEA M.Füzuli adına Əlyazmaları İnstitutunda saxlanılan nüsxələrin şifrləri bunlardır: B-1150, M-87, B-2382, B-3336, B-6312.

sələri, o cümlədən Azərbaycanın bu gözəl, mənzərəli guşəsində tikilib ucaldılan milli abidələrimiz, Qarabağ xanları tərəfindən yeni salınmış yaşayış məskənlərini geniş şəkildə qələmə alırlar.

Bu günümüzlə səsləşən ən vacib məsələlərdən biri, ermənilərin bu torpağa sonradan gəlmələri də bu mənbələrdə öz əksini tapmışdır. Məsələn, Dizaq məliki Yegan Qarabağa Loridən qaçıb gəlmişdir. Nadir şaha müticəsinə itaət etdiyinə görə Dizaqda ona məliklik verilmişdir. Vərəndə məliki Şahnəzər Göyçədən, Çiləbörd məliki Allahqulu Mağavizdən, Talış məliki Usub Şirvandan qaçaraq Qarabağda özlərinə sığınacaq tapmış, Nadir şaha qulluqlarına görə Qarabağda məliklik əldə etmişlər. Xaçın isə o dövrdə Yesai Həsən Cəlalyanın (1702-1728-ci illərdə alban katolikosu) övladına verilmişdir[1]. Buradan aydın olur ki, Allahqulu, Yegan(ə), Şahnəzər, Usub və mənbələrdə adı çəkilən digər Qarabağ məliklərinin əsli-nəsəbi, xristian dinini əldən verməmək üçün erməni dilini qəbul etmiş albanlardırlar. Bu da görkəmli Azərbaycan alimləri akad. Ziya Bünyadovun[2], akad. İqrar Əliyevin[3] və başqalarının fikirlərini tamamilə bir daha sübut etməyə əsas verir.

---

1 Mir Mehdi Xəzani. "Kitabi-tarixi Qarabağ", Azərbaycan MEA M.Füzuli adına Əlyazmaları İnstitutu, B-518 şifrli əlyazma, vər. 13b-17b.

2 Есаи Хасан Джалалян. Краткая история страны Албанской (1702-1722). Предисловие акад. З.Бунятова, 1989, стр. 4

3 Играр Алиев. Нагорный Карабах (история, факты, события), Баку, 1989,стр. 70-75.

## MİRZƏ ADIGÖZƏL BƏYİN TƏRCÜMEYİ-HALINA AİD MATERİALLAR

"Qarabağnamə" müəllifi Mirzə Adıgözəl bəy öz həyatı haqqında olduqca qısa məlumat verir. Buna görə, onun bu məlumatlarını həyat və fəaliyyətinin müxtəlif dövrlərini işıqlandıran materiallarla tamamlamağı lazım bildik.

Mirzə Adıgözəl bəy "Qarabağnamə"nin əlyazısının son səhifələrində öz tərcümeyi-halından bəhs edərkən, Qarabağda anadan olduğunu yazır. Təəssüf ki, hansı ildə anadan olduğunu göstərmir. Lakin tərcümeyi-halında bir sıra faktlara işarə edilmişdir ki, bunlar da onun təxmini olaraq hansı ildə anadan olduğunu təyin etmək üçün imkan verir. Mirzə Adıgözəl bəy yazır ki, o, Şuşa şəhərində məktəbdə oxuyarkən Ağa Məhəmməd şah öz qoşunları ilə Qarabağa daxil olaraq Şuşa qalasını mühasirəyə aldı. Lakin şəhəri zəbt edə bilməyib Gürcüstana tərəf yollandı və Tiflis şəhərini tutdu.

Bu hadisələr, yəni Şuşanın mühasirəsi 1795-ci ilin yayında, Tiflsin İran qoşunları tərəfindən alınması isə həmin il sentyabr ayının 12-də baş vermişdir. Beləliklə, Mirzə Adıgözəl bəyin 1795-ci ildə məktəbli yaşında, yəni 9 ilə 14 yaşları arasında olduğunu təsəvvür etsək, onun XVIII əsrin səksəninci illərində və daha doğrusu, səksəninci illərin əvvəllərində anadan olduğunu təyin etmək çətin deyildir; çünki tərcümeyi-halda verilən başqa məlumatlardan görünür ki, Mirzə Adıgözəl bəy 1799-cu ilin axırları və 1800-cü ilin əvvəllərində Tiflisdə Gürcüstan padşahı nəzdində olan Rusiya nazirinin yanında qulluq edirdi. Buna görə də, onun bu zaman 18-20 yaşlarında olduğunu güman etmək olar.

Yuxarıdakı mülahizələr Mirzə Adıgözəl bəyin yetmişinci illərin sonunda və ya səksəninci illərin başlanğıcında anadan olduğu fikrinin düzgünlüyünü göstərir.

Bu zaman Rusiya hökumətinin Azərbaycan xanlıqları ilə olan münasibətində böyük bir dönüş yarandı. II Yekaterina hökuməti Azərbaycan xanlıqlarının işinə getdikcə daha artıq qarışmağa başladı. Nəhayət, səksəninci illərin birinci yarısının sonlarında, Şimali Azərbaycan xanlıqlarını Rusiya ilə birləşdirmək məqsədilə bu xanlıqları öz himayəsi altına almaq siyasətinə keçdi. Quba xanı Fətəli xan qüdrətli Şimal dövləti ilə əlaqə saxlamağın lazım olduğunu hiss edərək, vaxtın tələbinə görə, getdikcə daha artıq Rusiyaya istinad etmək siyasətinə meyil edirdi. Həştərxan və onun vasitəsilə Rusiyanın başqa şəhərləri ilə olduqca möhkəm iqtisadi əlaqələrdə olan Şamaxı, Bakı və Dərbənd tacir və sənətkarlarının mühüm hissəsi ona rəğbət bəsləyirdi.

Beləliklə, Adıgözəl bəy hələ fəaliyyətinin ilk zamanlarında Rusiya ilə daha geniş əlaqə saxlamağa cəhd edən və öz nəzərlərini Şimala çevirmiş olan adamlarla yaxınlaşa bilərdi.

Adıgözəl bəy öz tərcümeyi-halında yazır ki, Ağa Məhəmməd şahın qoşunları yaxınlaşdığı zaman, onun atası ailəsilə və onlara tabe olan Araz çayı kənarındakı "İyirmi dörd" mahalında yaşayan köçərilərlə birlikdə Qarabağı tərk edərək Gürcüstana qaçmışdı. Adıgözəl bəygilin ailəsi də, İran qoşunlarının vəhşi hərəkətlərindən canlarını qurtarmaq məqsədilə doğma yurdlarını tərk edərək Şirvan, Şəki oblastlarına və Gürcüstana qaçmış Qarabağ əhalisinin əksəriyyəti kimi, böyük əziyyətlər çəkmişdilər.

Ağa Məhəmməd şahın basqınından qaçan qaçqınlar yollarda ağır əziyyətə rast gəlirdilər. Qarabağdan qaçarkən Adıgözəl bəygilin ailəsi çəkdiyi bütün əziyyətlər başqa qaçqınların da başına gəldi.

Xalqın geniş təbəqələri İran hakimiyyətinə nifrət edirdilər və ona tabe olmamaq üçün öz əmlak və evlərini, əziz və doğma yurdlarını ataraq yaxınlaşan İran qoşunlarından qaçırdılar. Qarabağın Aran sahələri əhalisinin doğma yurdlarından kütləvi surətdə qaçması, xalq kütlələrinin İran qoşunları basqınına nə cür əlaqə bəslədiyini aydınca göstərir.

Bildiyimizə görə, Ağa Məhəmməd şah Rusiya qoşunlarının hərbi - Gürcüstan yolu ilə Gürcüstan əhalisinin köməyinə gələ biləcəyindən qorxaraq, Tiflisdə yalnız 8 gün qalmış və sonra Gəncədən keçərək Muğan düzünə getmişdi.

1796-ci ilin yayında Adıgözəl bəy artıq Gürcüstanda idi. 1796-cı il yaz fəslinin əvvəllərində Ağa Məhəmməd şah öz qoşunları ilə Astarabad və Xorasana getdi.

1796-cı ilin yayında II Yekaterina hökuməti tərəfindən göndərilmiş Rusiya qoşunları Şimali Azərbaycana daxil oldular. Onlar Quba, Şamaxı, Bakı, Gəncə şəhərlərini tutdular. Lakin həmin 1796-cı ilin payızının axırlarında, II Yekaterinanın ölümündən sonra, I Pavelin fərmanına əsasən, Rusiya qoşunları Azərbaycan torpaqlarından çəkilməyə başladılar və 1797-ci ilin yazında Azərbaycanı tamamilə tərk etdilər.

1797-ci ilin yazında Ağa Məhəmməd şah yenidən Qarabağa soxuldu. 1795-ci ildə, İran qoşunlarının ölkəni tarmar etməsi nəticəsində intişar etmiş aclıq və taun xəstəliyi davam edirdi. Şuşanı ikinci dəfə müdafiə etmək üçün hərbi qüvvə və vəsaitə malik olmayan Qarabağ xanı İbrahim xan Şuşa qalasını tərk edərək Car vilayətinə çəkildi. Ağa Məhəmməd şah öz qoşunları ilə heç bir maneəyə rast gəlmədən Şuşanı zəbt etdi və 1795-ci ildə Şuşanı müdafiə etmiş şəhər əhalisini və Rusiyaya istinad etmək təmayülü tərəfdarlarını təqib və edam etməyə başladı.

Bütün bu müddət ərzində Adıgözəl bəygilin ailəsi ona tabe olan köçərilərlə Gürcüstanda qalmaqda idilər. Şübhəsiz ki, bütün bu hadisələr Adıgözəl bəyə məlum idi. Yəqin ki, o bu hadisələrin şahidi və iştirakçısı olmuş, müxtəlif adamlarla görüşmüşdü. Doğma vətəninin talan edilməsi, aclıq, əhali

kütlələrinin iztirabı, İran hakimiyyəti tərəfindən törədilən fəlakətlər, yəqin ki, Adıgözəl bəyin şüurunda dərin iz buraxmışdı.

Mirzə Adıgözəl bəy öz tərcümeyi-halında yazır ki, Gürcüstan Rusiya ilə birləşdikdən sonra nazir Kovalenski XII Georginin diplomatik məktublarını yazan katiblərinə inanmadığı üçün, osmanlı dilini bilən bir adam axtarırdı. Adıgözəl bəyi Kovalenskiyə nişan verdilər; nazir onu gizli məktublar ilə əlaqədar olan işlər üçün öz yanına xidmətə qəbul etdi. Adıgözəl bəy Kovalenskinin yanında gizli surətdə xidmət edir və donluq alırdı.

Adıgözəl bəy bu məxfi vəzifədə, ancaq 1799-cu ilin axırlarında və bütün 1800-cü il boyu xidmət edə bilərdi. Mirzə Adıgözəl bəyin həyatında bu dövrün böyük əhəmiyyəti olmuşdu. Əgər bu vaxta qədər Adıgözəl bəy öz vətənində baş vermiş tarixi hadisələri müşahidə etmək və onlara qiymət verməklə öz siyasi təmayülünü müəyyən etmişdisə, nazir Kovalenskinin yanına xidmətə girdikdən sonra isə, o öz siyasi təmayulünü tamamladı və möhkəmləndirdi. Adıgözəl bəy öz gələcək taleyini Zaqafqaziyada olan Rusiya divanxanası və ordusu ilə əlaqələndirdi. Məlum olduğu kimi, Adıgözəl bəy 1800-cü ildə özünü Rusiya tərəfdarı kimi tanıtdıra bilmişdi. Buna görə, nazir Kovalenski onu inanılmış bir adam sayıb diplomatik işlərlə əlaqədar olan gizli məktubları ona tapşırmışdı.

Bu münasibətlə belə bir sual ortaya çıxır: Adıgözəl bəy rus dilini nə vaxt və harada öyrənə bilmişdir? Belə güman etmək olar ki, Adıgözəl bəy nazir Kovalenskinin yanında xidmət edərkən rus dilini başa düşürdü. Ehtimal ki, Adıgözəl bəy rus dilini 1796-1800-cü illər ərzində, Tiflisdə yaşadığı zaman öyrənmişdir. Bu fikir həqiqətə daha yaxındır. 1795-ci ilin payızından başlayaraq Tiflisdə rus qarnizonu dururdu.

Təəssüf ki, padşah XII Georginin ölümündən sonra Mirzə Adıgözəl bəyin nazir Kovalenskinin xidmətində olub-olmaması haqqında bir məlumat yoxdur. Bizcə o, bu vəzifədə olmuşdur; çünki Kovalenski Gürcüstanın hökmdarı vəzifəsini ifa etdiyi üçün ona Şərq dillərini bilən adam lazım idi.

Lakin Mirzə Adıgözəl bəy Kovalenskinin yanında, onun Gürcüstan idarə işlərini knyaz Sisianova təhvil verənə qədər, yəni 1803-cü ilin fevral ayınadək xidmət edə bilərdi[1]. Adıgözəl bəyin Gürcüstan canişini və Qafqaz qoşunları komandanı knyaz Sisianovun yanında xidmət etməsi məlum deyildir. Mirzə Adıgözəl bəyin həyatının bu dövrünə aid heç bir sənəd hələ aşkar edilməmişdir. Həyatının bu dövrü haqqında Mirzə Adıgözəl bəy tərcümeyi-halında belə yazır: "Mən rus komandanlığının rütbəli şəxsləri yanında xidmətdə idim". Gürcüstanda Rusiya hakimiyyəti təsdiq olunduqdan sonra o, general-mayor Lisaneviçin yanına xidmətə təyin olunur.

---

1 AKAK, c. III, sənəd 1, səh. 4. 10

"Qafqaz Arxeoqrafiya Komissiyası aktlar"nda nəşr edilmiş sənədlərdən görünür ki, general-mayor Lisaneviç 1811-ci ilin avqust ayında, Pənbək və Şoragil okruqları rəisi vəzifəsində olmaqla, Ərzrum sərəskərinin hərəkatını güdürdü[1]. Bu vaxt Rusiya ilə Türkiyə arasında müharibə gedirdi. Hərbi əməliyyatın əsas meydanı Dunay çayı ətrafında idi. Lakin Rusiyaya tabe olan Zaqafqaziya torpaqlarına Türkiyə qoşunlarının hücum edə biləcəyi qorxusu olduğu üçün general-mayor Lisaneviçin əsas diqqəti Türkiyənin sərhəd rayonlarında olan osmanlı qoşunlarının hərəkatını izləməyə çevrilmişdi.

Lisaneviç sərhədin o tayına kəşfiyyatçılar və casuslar göndərirdi. Belə bir şəraitdə generala mütləq mütərcim-kargüzar lazımdı. Bu vəzifəni Mirzə Adıgözəl bəy ifa edirdi.

Mirzə Adıgözəl bəy general Lisaneviçin yanında xeyli vaxt xidmət etmişdir. O, tərcümeyi-halında belə yazır: "On birinci ilə qədər onun yanında katiblik etdim. Bu ildə menə podporuçik rütbəsi verildi. Nəhayət, on altıncı ildə sərdar Yermolovdan izn alıb, Qarabağın keçmiş hakimi general-mayor Mehdiqulu xanın qulluğuna gəldim..."

Beləliklə, əldə olan məlumatlara əsaslanaraq təsdiq etmək olar ki, general-mayor Lisaneviç və Mirzə Adıgözəl bəyin birgə xidməti 1811 -ci illə 1816-cı illər arasında olmuşdur.

General Lisaneviç və Mirzə Adıgözəl bəy 5-6 ilə qədər Pənbək və Şoragil distansiyalarında xidmət etmişdilər. Bu müddət ərzində bu yerlərlə əlaqədar bir çox hadisələr baş vermişdir.

Təəssüf ki, Mirzə Adıgözəl bəyin bu distansiyalarda xidməti zamanı ciddi əhəmiyyəti olan işlərdə iştirak etməsi haqqında bilavasitə dəlillər yoxdur. Lakin vəzifəsinin xarakterinə görə, bir mirzə kimi, həmin işlərlə əlaqədar olduğunu güman etmək olar.

1805-1813-cü illər ərzində davam edən birinci Rusiya-İran müharibəsi zamanı, Pənbək və Şoragil İran qoşunlarının basqını nəticəsində, son dərəcədə talan edilmişdi. Əhalinin xeyli hissəsi İran qoşunları tərəfindən cənuba qovulmuş, bəziləri isə hərbi əməliyyat gedən territoriyaları tərk etmişdilər. Okruq rəisi distansiyanı məskun etmək, əkinçiliyi və məskun yerləri bərpa etmək qayğısına qalmalı idi.

Hərçənd general-mayor Lisaneviç Azərbaycan dilini bilməklə Azərbaycan əhalisinin etimadını qazanmışdı, lakin bu ailələrin köçürülməsində yerli əhalidən olan və böyük hörmət sahibi Mirzə Adıgözəl bəyin, şübhəsiz ki, böyük xidməti olmuşdur.

---

1 General Tormasovun 1811-ci il avqustun 13-də general-mayor Lisaneviçə yazdığı 134 Ns-li əmr (AKAK, IV sənəd 1179, səh. 775; 776-cı səhifədəki 1180 nömrəli sənədlə müqayisə edin).

1812-ci ilin əvvəllərində İran hökuməti İrəvan sərdarı Hüseynqulu xanın vasitəsilə sülh danışıqlarına başlamaq arzusunda olduğunu bildirdi. Bununla əlaqədar olaraq sərhəd mahalının rəisi general-mayor Lisaneviç sülh danışıqları aparmaq üçün xüsusi məmur göndərilməsi haqqında məktublaşmağa başladı[1]. Mirzə Adıgözəl bəyin bu işdə iştirakı haqqında bilavasitə məlumat yoxdursa da, şübhəsiz ki, vəzifəsi ilə əlaqədar olaraq o, bu kimi danışıqlarda kənarda dura bilməzdi.

1813-cü ilin oktyabr ayında Qarabağın Gülüstan qəsəbəsində sülh müqaviləsi bağlandı. Bu müqaviləyə əsasən İran hökuməti Dərbənd, Quba, Bakı, Şamaxı, Şəki, Gəncə, Qarabağ və Talış xanlıqlarına qarşı öz tələblərindən imtina etdi.

Mirzə Adıgözəl bəyin tərcümeyi-halı və müxtəlif mənbələrdən alınan məlumatlar onun həyatının bu dövrünü daha tam və düzgün təsəvvür etməyə imkan vermir.

1816-cı ilin oktyabr ayında Gürcüstanın[2] əlahiddə korpus komandiri vəzifəsinə təyin olunmuş general A.P.Yermolov Tiflisə gəldi və Qafqaz işləri ilə tanış olmağa başladı.

General A.P.Yermolov xanlara inanmırdı. O, xan hakimiyyətinin mövcud olmasını rus imperiyası mənafeyinə zidd görürdü və buna görə də gələcəkdə xan hakimiyyətini ləğv edib rus idarəsi qurmağı zəruri hesab edirdi. Qarabağ, Şirvan və Şəki xanlarının hakimiyyəti bu xanlıqların Rusiya təbəəliyinə qəbul edilməsi haqqında 1805-ci ildə bağlanmış müqavilə əsasında təsdiq edildiyi üçün, A.P.Yermolov dərhal öz siyasi məqsədlərinin tətbiqinə başlaya bilməzdi. Əvvəlcə o, xanların yanında Rusiya hökumətinin etimadını qazanmış şəxslər təyin etməklə kifayətləndi.

A.P.Yermolov Mirzə Adıgözəl bəyi qarabağlı olduğu üçün Mehdiqulu xanın yanına göndərdi. Adıgözəl bəyin Qarabağa göndərilməsi 1816-cı ildə A.P.Yermolovun Tehrana səfir təyin edilməsindən bir az əvvəl olmuşdu. Mirzə Adıgözəl bəy tərcümeyi-halında xəbər verir ki, qarabağlı Mehdiqulu xan ona ailəsinin əvvəllərdə sahib olduğu torpaqları qaytardı, yeni malikanələr bağışladı və onu "İyirmi dörd" mahalına naib təyin etdi.

"İyirmi dörd" mahalı Qarabağ xanlığının iyirmi iki mahalından biri idi. Yuxarıda göstərilən, tam olmayan məlumatlara əsasən, 1823-cü ildə bu mahalda 155 ailə, hər ailəyə 5 nəfər hesab etmiş olsaq, 800 nəfərə yaxın adam yaşayırdı.

Bu mahal Qarabağ xanlığının ən kiçik mahallarından biri idi. Burada

---

1 Markiz Pauluççinin qraf Rumyantsevə 1812-ci il martın 21-də yazdığı 80 nömrəli məlumat (AKAK, c. V, sənəd 247, səh. 177).

2 General Yermolovun qraf Nesselpoda 1816-cı il noyabrın 19-da yazdığı təliqə (AKAK, c. VI, h.II, sənəd 281, səh.136).

yaşayan əhalinin sayı bütün Qarabağ xanlığı əhalisinin yüzdən birini belə təşkil etmirdi[1]. Mirzə Adıgözəl bəy Mehdiqulu xanın ən yaxın və inanılmış adamlarından biri idi. O, Mehdiqulu xanın yanında son günədək, yəni onun xaricə qaçdığı günədək olmuşdur.

Zaqafqaziyada müsəlman əyalətlərinin rəisi general V.Q.Madatovun təzyiqi və araqarışdırıcı hərəkətləri nəticəsində Mehdiqulu xanın Qarabağı tərk edərək İrana qaçması məlumdur. General Madatov Azərbaycanda xan üsul-idarəsini ləğv etməyi lazım bilən A.P.Yermolovun göstərişləri əsasında hərəkət edirdi.

General Yermolov knyaz Madatovun vasitəsilə öz arzusunun yerinə yetirilməsinə nail oldu. Mehdiqulu xan ona edilən hədələrdən qorxaraq 1822-ci il noyabrın 21-də öz ailəsini qoyaraq, bir neçə nəfər xidmətçisinin müşayiətilə xaricə qaçdı[2]. Bu hadisələr bir neçə il keçdikdən sonra Mehdiqulu xanın yazdığı bir məktubda işıqlandırılmışdır. Mehdiqulu xan özünün qaçmağı haqqında belə yazır: "...mən Tərtərə gedib orada bir neçə nəfər taparaq onlarla öz vəziyyətimi izah etmək üçün Tiflisə getməyi qərara aldım. Lakin məni Tərtərə buraxmamaq və Qarabağdan qovmaq əmrilə dalımca göndərilmiş Məlik Vanya mənə çatdı və mən qorxaraq İrəvana yola düşdüm. Hərçənd mənə əslində Qarabağdan getmək lazım deyildi, ...lakin mən özümü xilas etmək üçün İrəvana getdim"[3].

1823-cü ildə həqiqi stats-sovetnik Magilevski və polkovnik A.P.Yermolov tərəfindən tərtib edilmiş "Qarabağ vilayətinin statistik təsviri"ndən məlum olur ki, Mirzə Adıgözəl bəyin xüsusi əmlakı çox az olmuşdur[4]. O, təkcə Ağbulaq kəndinə sahib idi. Mirzə Adıgözəl bəyin öz evi də burada idi. Bundan başqa Danyal bəy Qmatlı obası, Varvaralı və Qaraoğlanlı kəndi də onun idarəsində idi. Burada vergi verən 59 ailə və Mirzə Adıgözəl bəyin sahib olduğu 37 rəncbər ailəsi yaşayırdı. Xanlıq dövründə və komendant üsul-idarəsi zamanında 59 ailədən toplanan verginin bir hissəsi divan və ya xəzinəyə daxil olurdu. Verginin xəzinəyə daxil olan bu hissəsi 1823-cü ildə aparılan

1 Həqiqi stats-sovetnik Magilevski və polkovnik Yermolovun general Yermolova 1823-cü il mayın 2-də yazdıqları 22 nömrəli raport (AKAK, c. VI, h. I, sənəd 1308, səh. 858).

2 Knyaz Madatovun general-leytenant Velyaminova 1822-ci il noyabırın 21-də yazdığı 916 nömrəli raport (AKAK, c. VI, h. I, sənəd 1293, soh. 848).

3 Mehdiqulu xanın knyaz Abxazova 1827-ci il iyunun 21-də yazdığı məktub (AKAK, c. VII, səh. 458-459).

4 Həqiqi stats-sovetnik Magilevski və polkovnik A.P.Yermolov tərəfindən tərtib edilmiş "Qarabağ vilayətinin statistik təsviri" (AKAK, f. 24, ya 21,1, iş 117, səh. 152, 153, 203).

siyahıya görə, 156 manat rus gümüş pulu miqdarında idi. Ehtimal ki, mədaxilin qalan çox hissəsi kəndi idarə edənin ixtiyarına keçirdi.

"Qarabağ vilayətinin statistik təsviri"ndən belə məlum olur ki, Mirzə Adıgözəl bəyin 37 ailədən ibarət rəncbəri var idi. Bu fakt göstərir ki, Mirzə Adıgözəl bəyin xüsusi təsərrüfatı olmuş və burada həmin rəncbərlər işləmişlər. Ümumiyyətlə, rəncbərlər ya tut bağlarında və ya çəltik tarlalarında işlərdilər. Lakin Mirzə Adıgözəl bəyin rəncbərləri köçəri hesabında olduğundan, onların bağ və çəltik tarlalarında məşğul olduqlarını güman etmək olmaz. Bu rəncbərlərin hər şeydən əvvəl ziraətdə işlədiklərini fərz etmək olar.

Yuxarıdakı izahatdan belə görünür ki, Mirzə Adıgözəl bəyin mülkü çox da böyük deyilmiş; çünki onun ixtiyarında olan ailələrin sayı yüzə çatırdı ki, beş yüzdən altı yüzə qədər can təşkil edirdi. Lakin onu kiçik mülk də adlandırmaq olmaz. Beləliklə, Mirzə Adıgözəl bəyi orta təsərrüfatçı bəylər sırasına daxil etmək lazımdır. Ona verilmiş poruçik, sonra isə kapitan rütbəsi və Qarabağ əyalət məhkəməsində iclasçı vəzifəsi onu Qarabağ aristokratiyasının ali bəy təbəqəsi sırasına irəli çəkdi.

Mirzə Adıgözəl bəy öz tərcümeyi-halında qeyd edir ki, general Yermolovun tapşırığı ilə o, 1823-cü ildən 1826-cı ilədək, yəni üç il ərzində Qarabağ sərhədlərinin mühafizəsi üzrə qulluqda olmuşdur. Adıgözəl bəyin öz haqqında verdiyi bu məlumat "Qafqaz Arxeoqrafiya Komissiyası aktları"nda nəşr edilmiş sənədlərlə təsdiq olunur. General-mayor knyaz Madatov A.P.Yermolova 1825-ci il 9 iyul tarixində yazdığı raportunda belə xəbər verir: "Sizin 2 iyul tarixli 9 nömrəli sərəncamınıza cavab olaraq, Qarabağda bizim sərhədlərimizi iranlıların hücumu təhlükəsindən müdafiə etmək, köçəri xalqların qaçmasının qarşısını almaq və mənim nə kimi tədbirlər gördüyüm haqqında zati-alinizin nəzərinə aşağıdakı məlumatı çatdırmağı özümə şərəf hesab edirəm"[1].

Knyaz Madatov sərhəd məntəqələri cədvəlində Mirzə Adıgözəl bəyin olduğu məntəqəni də göstərmişdir. Sənəddə belə göstərilir: "Murov dağı enişinin qurtaracağında, Bazərgan bulağı yanında... 15 verst qabaqda olan Gil qəsəbəsində qarovul duran dağılmış Zod kəndi yanında, mahal naibi podporuçik Mirzə Adıgözəl bəyin yanında 40 nəfər, bundan əlavə də burada yüzbaşı Nasledışevin yanında 25 nəfər qazaq vardır". Cədvəlin sonunda general Madatov yazır: "Bu cədvələ əsasən iki post xətti təşkil edilir: - dağıdılmış Zod kəndindən isti sulara qədər olan sağ qolu ştab-kapitan Çernoqlazov, yerli əhali keşikçilərini isə podporuçik Mirzə Adıgözəl bəy idarə edir..."[2]

---

1 General-mayor knyaz Madatovun general Yermolova 1825-ci il iyulun 9-da yazdığı 341 nömrəli raport. Çanaxçı kəndi (AKAK, c. VI, h. I, sənəd 719, səh. 516).

2 Yenə orada.

Bu post çox irəlidə qoyularaq İran territoriyasına daxil olduğu üçün İrəvan sərdarı Hüseynqulu xan general Madatova müraciət edərək postun yerini dəyişdirməyi xahiş etmişdi. Madatov, A.P.Yermolovun göstərişi ilə, Hüseynqulu xana məktubla cavab verərək yazırdı:

"Zati-aliniz tərəfindən zilhiccə ayının 11-də[1] yazılmış məktubu aldım, orada podporuçik Mirzə Adıgözəl bəyin süvarilərlə Zod kəndində durduğunu göstərirsiniz... Mirzə Adıgözəl bəyə həmin kənddə durmamaq haqqında çoxdan əmr vermişəm və o, tezliklə oradan gedəcəkdir"[2].

Sərhəd mühafizəsi xidmətində Adıgözəl bəy 1826-1828-ci illərdə olan Rusiya-İran müharibəsi başlananadək olmuşdur. Tərcümeyi-halında Adıgözəl bəy göstərir ki, o, 1826-cı il avqustun 25-dək, yəqin ki, İran qoşunlarının Qarabağa hücumundan bir az əvvəl ona 60 əsgərlə bir zabit, iki yüz azərbaycanlı və erməni süvariləri tabe idi. Mirzə Adıgözəl bəy sərhədi mühafizə etməklə, İran hökumətinin müharibəyə başlayacağı haqqında məlumatlar alırdı. O bu məlumatları Şuşa qalasının komendantı mayor Çilyayeva bildirirdi. Bu məxfi xəbərlərə cavab olaraq Mirzə Adıgözəl bəy öz postunda istehkamlar qurmaq əmri aldı. Onun postu Qarabağ sərhəd postları xəttinin son sağ qolunda, Murov dağının cənub ətəklərində, Bazərgan bulağı yanında idi... Mirzə Adıgözəl bəy hələ burada ikən müharibə başlandı. Məlumdur ki, bu müharibə İran qoşunlarının Rusiyaya tabe olan torpaqlarına qəflətən hücumu ilə başladı. İran qoşunları, demək olar ki, bir vaxtda İrəvan tərəfindən sərhədləri keçərək Şoragil, Pənbək və həmçinin Talış və Qarabağ əyalətlərinə soxuldular. Lazımı qədər qüvvələri olmayan sərhəd postları İran qoşunlarının qarşısını ala bilmədilər. Onların çox hissəsi vuruşa-vuruşa ölkənin içərilərinə tərəf geri çəkilirdi. Bəziləri isə mühasirəyə alınaraq uzun müqavimətdən sonra əsir düşdülər.

Bazərgan bulağı yaxınlığındakı post sərhədin lap yanında və İran qoşunlarının ilk axını yolu üstündə olduğu üçün, Mirzə Adıgözəl bəy və ona tapşırılan dəstənin Şuşa və Tiflis ilə əlaqəsi kəsildi. Mirzə Adıgözəl bəy öz tərcümeyi-halında yazır ki, o, cürbəcür hiylələrlə Şuşa ilə əlaqəni bərpa etmək və hər bir addımda ölüm təhlükəsi olan düşmən arxasından çıxmağa cəhd edirdi. Lakin Tiflisə tərəf geri çəkilən rus qoşunları ilə birləşmək ona mümkün olmadı. Şuşa qalası da İran qoşunlarının mühasirəsində olduğu üçün oraya girmək mümkün deyildi.

Vəziyyət bir də ona görə gərginləşmişdi ki, xanlıq üsul-idarəsi zamanı xan hakimiyyəti ilə sıxı əlaqədə olan yerli əhalinin ayrı-ayrı qrupları, düşmən

---

1 18 iyul (1825-ci il)

2 General-mayor knyaz Madatovun Hüseynqulu xana 1825-ci ildə yazdığı məktub (AKAK, c. VI, h. I, sənəd 1373, səh. 892).

qoşunlarının hücumundan sonra onların tərəfinə keçdi və bir sıra köçəriləri də öz tərəflərinə çəkdilər. Xanlıq üsul-idarəsinin ləğvindən sonra öz əvvəlki imtiyazlı vəziyyətlərini və maddi-yaşayış mənbələrini itirmiş və sayca əhalinin az hissəsini təşkil edən yüzbaşılar, maaflar, kətxudalar təbəqəsi və həmçinin bəylərin bir hissəsi köhnə qaydaları bərpa etmək istəyirdilər. Onlar elə güman edirdilər ki, İran qoşunları gəlib köhnə idarə üsulunu və onların itirdikləri imtiyazları geri qaytaracaqdır. Onlar qarabağlı Mehdiqulu xanın İran vəliəhdi Abbas Mirzənin qoşunları arasında olduğunu bilirdilər.

Bu hal Mirzə Adıgözəl bəyin vəziyyətini daha da çətinləşdirirdi. Mirzə Adıgözəl bəy törənmiş vəziyyətdən çıxmaq üçün bir yol tapmayaraq təhlükə ilə üz-üzə gəlmək məcburiyyətində qaldı. O, öz tərcümeyi-halında Abbas Mirzənin qərargahına getdikdən sonra əsirlikdə rast gəldiyi bütün macəraları ətraflı bir surətdə nağıl edir. Mirzə Adıgözəl bəyi əsir sifətilə Təbrizə göndərdilər[1].

Abbas Mirzənin ordusu Şamxor yanında və Gəncə şəhəri yaxınlığındakı böyük vuruşlarda məğlub olduqdan sonra İran qoşunları Araz çayının o tayına keçdilər.

Abbas Mirzə yəqin ki, əzilmiş qoşunlarını yenidən nizama salmaq üçün vaxt qazanmaq məqsədilə, sülh danışıqlarına başlamağa cəhd edirdi. Mirzə Adıgözəl bəy tərcümeyi-halında yazır ki, bu məqsədlə onu Şuşaya göndərdilər. Beləliklə, o, əsirlikdən azad oldu. Yəqin ki, bu hadisə 1827-ci ilin əvvəllərində olmuşdur; çünki Mirzə Adıgözəl bəy 1827-ci ilin yanvarında hələ Təbriz şəhərində əsir idi.

Mirzə Adıgözəl bəy yazır ki, o, Şuşadan Tiflisə gedərək general A.P.Yermolov və qərargah rəisi general-adyutant İ.İ.Dibiç cənabları ilə görüşdü. 1827-ci ilin yanvar və fevral aylarında, canişin və Qafqazın əlahiddə korpusu komandiri vəzifəsinə yeni təyin edilmiş İ.F.Paskeviçin A.P.Yermolovdan işləri təhvil aldığı zaman, general-adyutant Dibiç Tiflisdə idi. 1827-ci il mart ayının axırlarında A.P.Yermolovun geri çağırılmasından sonra İ.F.Paskeviç Zaqafqaziyanın bütün işlərini idarə etməyə başladı[2]. Maddi mənafelərinə görə, Mehdiqulu xana tərəfdar olan Qarabağ əhalisinin müəyyən qruplarını Rusiya tərəfinə meyil etdirmək fikrilə İ.F.Paskeviç qarabağlı Mehdiqulu xanı da Rusiya tərəfinə çəkməyi siyasi cəhətdən məqsədəuyğun hesab edirdi.

Bu mühüm işin icrası Qarabağ, Şirvan və Şəki əyalətlərini[3] idarə edən V.K.Madatovu 1827-ci ilin aprel ayında əvəz etmiş knyaz İ.NAbxazova tapşırılmışdı.

---

1 Naməlum müəllifin Qarabağ haqqında yazdığı qeydlərlə müqayisə edin. 1829-1831-ci illər içərisində (Rus çarizminin XIX əsrin 20-60-cı illərində Azərbaycanda müstəmləkə siyasəti, h. I, M.-L., 1936-cı il).

2 AKAK, c. VII, səh. 1.

3 Yenə orada, səh. 4.

Knyaz İ.N.Abxazov bu məsul tapşırığı bilavasitə yerinə yetirmək üçün Mirzə Adıgözəl bəyi seçdi.

İndi Mirzə Adıgözəl bəy, Mehdiqulu xan üzərində olan nüfuzunun qüvvəsini sınaqdan çıxarmalı idi. O, Arazın o tayına, düşmənin arxasına keçib orada Mehdiqulu xanla görüşməli və onu Rusiya tərəfinə keçməyə razı etməli idi. Mirzə Adıgözəl bəy bu tapşırığı müvəffəqiyyətlə yerinə yetirdi. İyunun əvvəllərində general Paskeviç qərargah rəisi İ.İ.Dibiçə aşağıdakı məlumatı xəbər verirdi:

"Danışıqların müvəffəqiyyəti və Mehdiqulu xanın bizim tərəfə keçməsi haqqındakı xəbəri zati-alinizin hüzuruna çatdırmağı özümə şərəf hesab edirəm... Bu ayın 8-də mən Qarabağdan məlumat aldım ki, xan oraya qayıtmışdır. Onun arxasınca Daralagözdən bizim sərhədlərimizə 3 min köçəri ailəsi köçmüşdür... Mehdiqulu xanın Qarabağa köçürülməsindən əldə edilən mənfəətlər olduqca mühümdür:

1) Keçmiş hakimlərinin (Mehdiqulu xanm) alçaldılmasına narazılıqla baxan sərhəd boyundakı adamların mütərəddidliyinə son qoydu. O, (Mehdiqulu xan) – yaxında, sərhədin özündə olmaqla qədim əlaqə və irsi hakimiyyətindən istifadə edərək, istədiyi vaxt onu qəbul etmiş olan İranın nəfinə, aramızda fəal tərəfdarlar tapa bilərdi.

2) Bu qəbilələrin çox hissəsini Mehdiqulu xan öz ardınca Qarabağa gəlməyə rəğbətləndirdi. Düşmən artıq onlardan kömək gözləyə bilməz. Onlar 4 min ən yaxşı süvari verə bilərlər ki, bu da nəinki bizim üçün qorxu təşkil edəcək, əksinə, bizim sərhədlərimizi mühafizə edəcəkdir.

Əlavə edirəm ki, xana qoşulub (İrana) getməyən bir neçə yüz ailə sırasındakı Millidlər (?), Qaraçorlu, Şadillu və sair yerdə qalan xalqlar şadillu Aslan Sultanın vasitəsilə mənə müraciət edərək öz itaətlərini bildirmiş və Rusiya himayəsinə qəbul edilmələrini xahiş etmişlər"[1].

Mirzə Adıgözəl bəy Mehdiqulu xanı Rusiya tərəfinə meyil etdirmək tapşırığını müvəffəqiyyətlə yerinə yetirdi. General Paskeviç onun bu xidmətinə yüksək qiymət verərək onu təltif edilməyə təqdim etdi. Bu barədə o, raportlarının birində yazırdı:

"Komandanlığın təsdiqinə görə, düşmən torpağında cəldlik və qəhrəmanlıq göstərərək, onlara verilmiş tapşırıqları yerinə yetirdikləri üçün, qarabağlı podporuçik Mirzə Adıgözəl bəyi (ona donluq da verməklə) və polkovnik knyaz Abxazovun yanında xidmətdə olan knyaz İvan Melikovu poruçik rütbələri ilə təltif etməyə təqdim etməyi özümə şərəf bilirəm. Dindaşları üsyan edərkən (Mirzə Adıgözəl bəyin) bizə necə sadiq qaldığını və Təbrizdə ona

---

1 General Paskeviçin qraf Dibiçə 1827-ci il iyunun 12-də yazdığı 62 nömrəli raport. Eçmiədzin (AKAK, c. VII, sənəd 402, səh. 453-454).

olan əzablara və əsarətə möhkəm bir iradə ilə dözdüyünü zati-aliniz Tiflisdə olduğu zaman yəqin ki, eşitmişdir"[1].

Hərbi əməliyyatın sonrakı gedişində Mirzə Adıgözəl bəy, görünür ki, bilavasitə iştirak etməmişdir. O, knyaz Abxazovun yanında bir tapşırığı yerinə yetirməklə məşğul idi. Bu tapşırıq haqqında general Paskeviç 1827-ci il may ayında knyaz Abxazova belə yazırdı:

"Zati-alinizə tapşırıram ki, əgər bu məsələ hələ sizin diqqətinizi özünə cəlb etməyibsə, hər bir vasitə ilə çalışmaq lazımdır ki, Azərbaycanda işlərin indiki vəziyyətindən narazı və bizim tərəfə meyil göstərən Təbriz əhalisinin müəyyən hissəsi və onların rəisləri ilə şifahi və yazılı olaraq ikitərəfli əlaqə saxlanılsın"[2].

Təəssüf ki, Mirzə Adıgözəl bəyin 1827-ci ilin ikinci yarısı və 1828-ci ilin əvvəllərindəki, yəni Türkmənçay sülh müqaviləsi bağlanan vaxtdakı fəaliyyəti haqqında bizə məlumat verə bilən sənədlər hələ tapılmamışdır.

Mirzə Adıgözəl bəy öz tərcümeyi-halında xəbər verir ki, o, knyaz Abxazovun rəhbərliyi altında xidmət etmişdir. Ola bilsin ki, Mirzə Adıgözəl bəy knyaz Abxazovla birlikdə Rusiya səfiri A.S.Qriboyedov Tehranda öldürüləndən sonra əmələ gəlmiş təhlükəli vaxtda - 1829-cu ildə Qarabağ, Şirvan və Şəkidə təşkil edilən süvari müsəlman alaylarının təşkilində iştirak etmişdir[3]. Knyaz Abxazovun general Paskeviçə təqdim etməsilə Mirzə Adıgözəl bəyə kapitan rütbəsi verilmişdir.

Bu məlumatdan belə nəticə çıxarmaq olar ki, Mirzə Adıgözəl bəyə kapitan rütbəsi 1830-cu ildən əvvəl verilmişdir; çünki knyaz Abxazov 1830-cu ildə Zaqafqaziyanı tərk edərək Osetiyaya getmişdi[4].

Çox güman ki, hələ bu vaxt, yəni 1829-cu ilin axırlarında və 1830-cu ilin əvvəllərində Mirzə Adıgözəl bəy, 30 ilə yaxın xidmət etdikdən sonra istefaya çıxmışdı.

Komendant üsul-idarəsi vaxtında əyalət məhkəmələri qanun üzrə nəinki mühakimə xarakterli işlərlə, hətta bir sıra əmlak və təsərrüfat məsələləri ilə də məşğul olmalı idilər, çünki komendantların yanında məhkəmədən başqa heç bir idarə yox idi. Qarabağ əyalət məhkəməsinin əhatə etdiyi məsələlər, ali inzibat idarəsinin tapşırığı ilə, XIX əsrin 30-cu illərində tərtib edilmiş Qarabağ əyaləti haqqındakı qeydlərdə gözəl bir surətdə işıqlandırılmışdır. Bu

1 General Paskeviçin qraf Dibiçə 1827-ci il iyunun 12-də yazdığı 62 nömrəli raport. Eçmiədzin (AKAK, c. VII, sənəd 402, səh. 455).

2 General Paskeviçin polkovnik, knyaz Abxazova 1827-ci il mayın 21-də yazdığı əmr. Cəlal oğlu (AKAK, c. VII, sənəd 508, səh. 543).

3 Polkovnik Miklaşevskinin qraf Paskeviçə 1830-cu il fevralın 4-də yazdığı 3 nömrəli raport (AKAK, c. VII, sənəd 372, səh. 426).

4 AKAK, c. VII, sənəd 4.

qeyddə deyilir: "Şuşa əyalət məhkəməsinin iclası komendantın sədrliyi və əhali tərəfindən bəylər və vətəndaşlar içərisindən seçilmiş 4 iclasçının iştirakilə aparılır. Əyalət məhkəməsi aşağıdakı işlərə baxır: a) əhəmiyyətsiz, mübahisəli və cinayət işlərinə, b) əyalətin mədaxilini idarə edən təsərrüfat işlərinə, c) ümumi intizamı mühafizə etməklə əlaqədar olan əmrverici işlərə; lakin indiki vəziyyətdə bütün bu işlərin az və ya çoxunu bir komendant idarə edir. Əyalət məhkəməsinin isə ancaq quru bir adı vardır"[1].

Əyalət məhkəməsinin fəaliyyəti nə qədər zəif olmuş olsa da, onun iclasçıları, o cümlədən Mirzə Adıgözəl bəy də müəyyən dərəcədə yuxarıda göstərilən işlərlə məşğul olmalı idilər. Bütün bunlar Mirzə Adıgözəl bəyə Qarabağın uzun, tarix boyu keçirdiyi vəziyyətlə və bu əyalətin müxtəlif hissələrində yaşayan əhalinin təsərrüfat fəaliyyəti ilə, ölkənin adətləri və tarixi ilə tanış olmağa çox kömək etmişdir. Mirzə Adıgözəl bəyin Qarabağ əyalət məhkəməsindəki fəaliyyəti onun Qarabağ tarixinə aid olan müxtəlif məlumatlar toplaması üçün imkan yaratdı.

Əyalət idarələrini yoxlamış məmurlardan biri, kollec assessoru Zubaryev general Paskeviçə aşağıdakı məlumatı xəbər verirdi: "Əyalət məhkəməsi heç bir iş görməyərək ancaq quru bir məhkəmə adı daşıyır. Knyaz Abxazovun yaxın adamı olan kapitan Mirzə Adıgözəl bütün məhkəmə işlərini öz əlinə almışdır. Məhkəmə üzvlərinin tatar və ermənilərdən ibarət olan hissəsi rus dilini bilmədikləri halda, bütün jurnallar və kargüzarlıq rus dilində aparılır"[2].

Kollec assessoru Zubaryev müfəttiş sifətilə eyalət idarələri işlərindəki nöqsanları yoxlamaq üçün getmişdi. Buna görə də onun qeydində izah edilən işlər mübaliğəsiz deyildir. Lakin burası aydındır ki, əyalət məhkəməsində baxılan işlərə və qəbul edilən qərarlara Mirzə Adıgözəl bəyin böyük təsiri olmuşdur. Kollec assessoru Zubaryevin qeydindən görünür ki, Mirzə Adıgözəl bəy rus dilini gözəl bilirmiş.

Yuxarıda adı çəkilən kollec assessoru Zubaryev Qarabağ haqqındakı qeydində yazır: "Mirzə Adıgözəl bəy... öz mahalına distansiyalardan və Yelizavetpol qəzasından qaçqınlar qəbul edir. Hal-hazırda onun yanında 350-dək belə qaçqın ailələri vardır. Bunlar heç bir vergi vermədikləri üçün ağırlıq yerdə qalan əhalinin üzərinə düşür"[3].

---

1 1837-ci il dekabrın 19-dan sonra Nefedyevin Qarabağ əyaləti haqqında yazdığı qeyd (XIX əsrin 20-60-cı illərində Azərbaycanda rus çarizminin müstəmləkəçilik siyasəti, c. I, M.-L., səh. 358).

2 Kollec assessoru Zubaryevin 1830-cu il 20 aprel tarixli raportla qraf Paskeviçə təqdim etdiyi Qarabağ əyaləti haqqındakı qeydi (AKAK, c. VII, sənəd 211, səh. 462).

3 Yenə orada.

Bu adamların kim olduğu haqda əlimizdə heç bir məlumat yoxdur. Lakin demək olar ki, bu adamlar çar inzibat idarəsinin təzyiqi altında öz kənd və evlərini tərk etmişdilər.

Mirzə Adıgözəl bəyin XIX əsrin ikinci yarısının 30-40-cı illərindəki həyat və fəaliyyəti haqqında əlimizdə məlumat yoxdur. 1834-cü ilin əvvəllərinə aid tapılmış arxiv sənədlərindən görünür ki, Mirzə Adıgözəl bəy, məhkəmədə şahid sifətilə çıxış edərək, əski yerləri üzərində öz hüquqlarını bərpa etmək istəyən bəzi bəyləri müdafiə etmişdir[1].

Qarabağ əyalət məhkəmə işlərindən görünür ki, Mehdiqulu xanın idarəsi zamanı hörmətli, möhtərəm və Qarabağ işlərini yaxşı bilən bir şəxs kimi arayış, izahat və şəhadətdən ötrü tez-tez Mirzə Adıgözəl bəyə müraciət edirdilər. Qarabağ əyalət məhkəməsindəki fəaliyyəti zamanı Mirzə Adıgözəl bəy Qarabağın digər məşhur xadimi, "Qarabağnamə"nin müəllifi və vaxtilə İbrahim xanın yanında vəzir olmuş Mirzə Camalla tez-tez görüşərmiş.

"Qarabağnamə"nin mətnindən görünür ki, Mirzə Adıgözəl bəy poeziyanı sevən və zamanın ən ziyalı şəxslərindən biri olmuşdur. Biliyinin genişliyi və keçmiş mədəniyyətin görkəmli nümayəndələrinə olan dərin ehtiramı Mirzə Adıgözəl bəydə böyük Nizaminin köhnə və tamamilə dağılmış qəbri üzərində yeni türbə tikmək fikri oyatdı. Bu barədə A.Bakıxanov belə yazır: "Onun (Nizaminin - V.L) dağılmış olan çox gözəl türbəsi Gəncənin yaxınlığında indi də durur... qarabağlı Mirzə Adıgözəl bəy onu indi bərpa edir"[2].

A.Bakıxanovun bu sözlərindən məlum olur ki, məqbərənin bərpa edilməsi onun "Gülüstani-İrəm"i yazdığı vaxtda, yəni XIX əsrin 40-cı illərinin əvvəllərində olmuşdur. Bu tarix böyük şairin anadan olmasının 700 illiyinə təsadüf edirdi.

Mirzə Adıgözəl bəyin tikdirdiyi türbə bu əsrin əvvəllərində dağılmışdır, lakin onun qalıqları tam düzgünlüklə Nizaminin dəfn edildiyi köhnə türbənin yerini təyin edir.

Mirzə Adıgözəl bəy "Qarabağnamə"ni 1845-ci ildə, yəni yaşının 65-ə çatdığı zamanda yazmışdır. Yəqin ki, yaşının çoxluğuna görə, əsəri yazmaq Mirzə Adıgözəl bəy üçün çətin olmuşdur. Buna görə də o, Salariyə müraciət edərək, onun söylədiklərini dediyi kimi, gözəl bir ifadə ilə yazmağı ondan xahiş etmişdir. Bu vəziyyət əsərin dilinə çox təsir etmişdir. Görünür ki, Mirzə Adıgözəl bəy hadisələri sadə və anlaşılan dildə şərh etmişdir. "Qarabağnamə"dəki Şərq tarixi əsərlərinə xas olan vəsflər, mübaliğələr, müqayisələr

---

1 Praporşik Əli bəyin Qarabağ komendantı cənab mayor və kavaler Raytерə 1834-cü il fevralın 5-də yazdığı izahatdan tərcümə (Azərb. SSR MDTA, f. 73, siyahı 2, iş 3, vərəq 67).

2 A.Bakıxanov. Gülüstani-İrəm. Bakı, 1926, səh. 165.

və sair təmtəraqlı ifadələr və təsvirlər Mirzə Adıgözəl bəyə yox, Salariyə aiddir. Bu dəbdəbəlilik və ala-bəzəklik mətnin məzmununu zənginləşdirmir, əksinə, onun mütaliəsini daha da çətinləşdirir. Məlum olduğu kimi, Abbasqulu ağa Bakıxanov bu qədim ənənələri kənara ataraq, sadə və aydın dildə "Gülüstani-İrəm" əsərini yazmışdır. Mirzə Adıgözəl bəy, Salarinin ifadə üsulları ilə razılaşdığı üçün əsərdəki bir sıra hadisə və faktlar öz aydınlıq və düzgünlüyünü itirmişdir.

Qeyd etmək lazımdır ki, bu söylənilənlər başlıca olaraq, "Qarabağnamə"nin birinci fəsillərinə aiddir. XIX əsrin tarixi sadə dillə yazılmışdır. Əsəri oxuyarkən belə bir təsir oyadır ki, Salari mətnin ilk fəsillərini gözəl üslub ilə yazmaqla kifayətlənmişdir. Sonrakı fəsilləri isə sadə və anlaşılan dildə yazmağa başlamışdır. Erməni dilinə tərcümə edilmiş "Qarabağnamə"nin əlyazmasında bu sətirlər var: "O vaxt mən - bu tarixi yazmış qarabağlı Mirzə Adıgözəl bəy Tiflisdə idim"[1]. "Qarabağnamə"nin başqa nüsxələrində belə bir qeyd yoxdur. Ola bilər ki, Mirzə Adıgözəl bəy bəzi işlərə görə, Şuşadan Tiflisə getmiş və orada öz əsərini yazmışdır.

Mirzə Adıgözəl bəy 1848-ci[2] ildə sentyabr ayının 9-da vəfat etmiş və Goranboy yaxınlığında olan Rəhimli kəndinin qəbiristanında dəfn edilmişdir. Onun qəbri üzərində türbə tikilmişdir. Yuxarıda göstərilən vəfat tarixi Mirzə Adıgözəl bəyin qəbri üstünə qoyulmuş başdaşının kitabəsindən alınmışdır.

V.N.Leviatov

---

1 T.İ.Ter-Qriqoryan. Qarabağlı Mirzə Adıgözəl bəy. Azərb. SSR EA Məruzələri, N°9, 1948-ci il.

2 Mirzə Adıgözəl bəyin vəfat tarixini, onun qəbri üzərindəki kitabənin qrafitlə çıxarılmış surəti üzündən, tarix elmləri namizədi Ə.Ə.Ələsgərzadə oxumuşdur. Kitabənin surəti A.Bakıxanov adına Tarix İnstitutu elmi işçiləri N.V.Minkeviç-Mustafayeva və S.K.Əhmədova tərəfindən çıxarılmışdır. Bu xüsusda baxın: N.V.Minkeviç-Mustafayeva və S.K.Əhmədova. "Mirzə Adıgözəl bəy ailəsinin türbəsi" (Azərb. SSR EA Məruzələri N° 5, 1948-ci il).

## MÜQƏDDİMƏ

Mirzə Adıgözəl bəyin "Qarabağnamə" əsərində Qarabağın 1736-cı ildən 1828-ci ilə kimi siyasi tarixi göstərilir.

Bu illər ərzində siyasət aləmində bir çox böyük hadisələr olmuşdur. 1747-ci ilə kimi, yəni Nadir şah öldürülənə kimi Qarabağ İran dövlətinin hakimiyyəti altında idi. Nadir şahın ölümündən sonra İranda hərc-mərclik və şahın taxt-tacına sahib olmaq istəyənlər arasında mübarizə başlandı. Mərkəzi siyasi hakimiyyət əldən-ələ keçərək çox zəifləmişdi və yerli feodal zadəganları və hakimləri özünə tabe etməyə qadir deyildi. Bu illərdə Azərbaycan İran dövlətinin hakimiyyəti altından çıxdı və onda iyirmiyə yaxın müstəqil xanlıqlar əmələ gəldi. Xanlıqların hər biri bir şəhərdən və iqtisadi cəhətdən onunla əlaqədar olan kəndlərdən ibarət idi. Məsələn, Quba xanlığı Quba şəhərindən və onun mahalına daxil olan təqribən iki yüz kənddən ibarət idi. Bakı xanlığı Bakı şəhərindən və Abşeron yarımadasında yerləşən otuz kənddən, Qarabağ xanlığı isə Şuşa şəhərindən və təqribən 250 kənddən ibarət idi. Qalan xanlıqlar da belə idi. Kənd əhalisi natural təsərrüfat formalarının hakim olduğu şəraitdə yaşayırdı və şəhər ilə əlaqəsi zəif idi. Şəhərlərin özünün əhalisi az idi (adətən üç mindən beş minə kimi) və sənətkarların hazırladıqları məmulat əsasən bu şəhərlərlə əlaqədar olan kəndlərin tələblərini təmin edirdi. Şəhərlərlə ölkənin ayrı-ayrı hissələri arasında təsərrüfat rabitəsi isə çox zəif idi.

Xanlıqların başında yerli feodal dairələrinin ən güclü nümayəndələri dururdu. Zəngin və güclü Cavanşir tayfasına mənsub olan Pənah bəyin Qarabağ üzərində öz hakimiyyətini necə möhkəmlətdiyi "Qarabağnamə"də müfəssəl surətdə təsvir olunur.

Pənah xan Cavanşir və "Otuziki" tayfalarını özünə tabe etmək üçün, habelə Qarabağın feodal sahiblərinə - məliklərə qarşı gərgin mübarizə aparmağa məcbur oldu.

Pənah xan tipik feodal bir hakim kimi özünə Bayat, sonra da Şahbulaq adlı möhkəmləndirilmiş qəsrlər tikdirir, ətraf hakimlərin onu özlərinə tabe etmək cəhdlərini dəf edirdi. Bir qədər gücləndikdən sonra Pənah xan Pənahabad qalasını (Şuşanı) tikdirir və Qarabağ üzərində öz hakimiyyətini və istiqlaliyyətini, Azərbaycanın cənub hissəsinin güclü xanlarından - Məhəmmədhəsən xan Qacardan və Fətəli xan Əfşardan silah gücü ilə qoruyur. Eyni zamanda o, öz hakimiyyəti altında olan ərazini cənub-qərbə - Naxçıvan tərəfə və cənub-şərqə - Təbriz tərəfə genişləndirməyə çalışır.

Xanların hər biri xanlığa məxsus olan torpaqların miqdarını, həmçinin ona tabe olan əhalinin sayını artırmağa çalışırdı. Bu meyil böyük feodal torpaq sahibləri olan xanların sinfi mənafeyindən irəli gəlirdi.

Məskun torpaqdan xanlar vergi və ya renta şəklində mədaxil alırdılar. Əhalinin çox olması böyük xalq ordusu yaratmağa imkan verirdi. Beləliklə, xanlar özlərinə tabe olan ərazini böyütmək və təbəələrin sayını artırmaq yolu ilə öz iqtisadi və siyasi qüvvələrini artırır, öz hakimiyyətlərini möhkəmləndirirdilər.

Pənah xanın və İbrahim xanın siyasəti göstərdiyimiz sinfi mənafedən irəli gəlirdi.

Xanların, o cümlədən də Qarabağ xanlarının xarici siyasəti öz hakimiyyətini, öz hakim mövqeyini saxlamaq və möhkəmlətmək təmayülü ilə təyin edilirdi. Buna görə, mürəkkəb beynəlxalq vəziyyətdə, İran, Türkiyə və Rusiyanın Azərbaycanı özünə tabe etmək uğrunda mübarizəsi şəraitində xanlar tərəddüd edir və vəziyyətdən asılı olaraq, öz sinfi mənafelərini təmin edən tərəfə meyil edirdilər.

XVIII əsrin 90-cı illərinin başlanğıcında Azərbaycanın cənub hissəsinin xanlıqları Ağa Məhəmməd şahın hakimiyyəti altına düşdükdən sonra, Qarabağ xanları qarşısında İrana tabe olmaq kimi həqiqi bir təhlükə meydana çıxdı. Ağa Məhəmməd şahın 1795-ci ildəki hərbi səfəri zamanı xüsusən dəhşətli olan belə bir vəziyyətdə qarabağlı İbrahim xan Rusiyadan himayə gözləməyə başladı.

O zamankı Rusiya şah idarəsi altında olan İrandan və ya sultan Türkiyəsindən daha yüksək iqtisadi inkişaf səviyyəsi və beynəlxalq vəziyyəti onun bir dövlət kimi müstəqil yaşamasına və inkişaf etməsinə imkan vermirdi.

Azərbaycanın Rusiyaya birləşdirilməsi rus və Azərbaycan xalqları arasında iqtisadi və mədəni münasibətlərin daha geniş inkişaf etməsi üçün imkanlar açırdı. Mirzə Adıgözəl bəy "Qarabağnamə"də Azərbaycanın şimal hissələrinin Rusiyaya birləşdirilməsi əhəmiyyətinin qiymətləndirilməsi üzərində dayanmırsa da, lakin onun bu fakta çox müsbət yanaşdığı əsərin mətnindən görünür.

Fransa və İngiltərə hökumətlərindən pul borcları, silah və hərbi təlimatçılarla kömək alan İran hökuməti iki dəfə Azərbaycanın şimal hissəsini silah gücü ilə Rusiyadan ayırmağa və onu öz hakimiyyəti altına almağa təşəbbüs etdi. Lakin 1805-1813 və 1826-1828-ci illərin müharibələrində İran məğlubiyyətə uğradı. Gülüstan (1813-cü il) və Türkmənçay (1828-ci il) müahidənamələrinə görə, İran hökuməti Azərbaycanın şimal hissəsinə olan iddialarından əl çəkməyə məcbur oldu və onların Rusiyaya birləşdirilməsini təsdiq etdi.

Mirzə Adıgözəl bəy Qarabağın tarixini Türkmənçay sülh müahidənaməsinin bağlanması ilə bitirir. Beləliklə, Mirzə Adıgözəl bəy Qarabağın bütün sonrakı tarixini və bu tarixin gedişində çarizmin Azərbaycanda qurduğu istibdadın şiddətləndiyi dövrü təsvir etmir.

Əsərin müəllifi böyük həyat yolu keçmiş, təcrübə və bilik sahibidir. XIX əsrin birinci sülsündə Rusiya-İran və Rusiya-Türkiyə müharibələri dövründə Azərbaycanda və Zaqafqaziyada siyasi vəziyyət, bu müharibələrin gedişi və nəticəsi, Mirzə Adıgözəl bəyin xidmət fəaliyyəti onun görüşlərinə böyük təsir etmişdir. Bu dövrün tarixi hadisələrini görən və onları dərindən təhlil edən Mirzə Adıgözəl bəy, Rusiya tərəfdarları yoluna keçmiş və öz şəxsi taleyindəki dəyişikliklərə baxmayaraq, bu yoldan dönməmişdir. Mirzə Adıgözəl bəyin tərcümeyi-halında elə bir fakt yoxdur ki, bu fakta əsaslanaraq onun Rusiyaya tərəfdar olmaq xəttindən geri çəkilməsini və ya ondan üz döndərdiyini göstərsin.

Çox vaxt 1826-1828-ci illərin Rusiya-İran müharibəsinin çətin şəraitində, bəylərin çox hissəsi hakimiyyətini itirmiş Azərbaycan xanlarının ardınca gedərək, İran qoşunlarının silahı gücünə Zaqafqaziyada xan hakimiyyətini və xanlara yaxınlıqdan irəli gələn imtiyazlarını bərpa etməyə çalışdıqları bir zamanda Mirzə Adıgözəl bəy tutduğu yol ilə möhkəm addımlayır və təhlükə üz verdikdə qorxmadan ölümlə qarşılaşırdı.

Mirzə Adıgözəl bəyin Rusiya tərəfdarçılığında bu qədər ardıcıl olmasında müxtəlif vəziyyətlərin təsiri vardır. Burada Mirzə Adıgözəl bəyin uşaqlıq təəssürati müəyyən rol oynamışdır. Mirzə Adıgözəl bəy Ağa Məhəmməd şahın başçılığı altında İran qoşunlarının Zaqafqaziya xalqlarına gətirdikləri fəlakətlərin şahidi olmuşdur. O zaman Mirzə Adıgözəl bəy öz ailəsi ilə bərabər doğma Qarabağı tərk edib, yad yerlərə getməyə məcbur olmuşdu.

Mirzə Adıgözəl bəy hələ çox gənc ikən, rus dövlət və hərbi inzibati idarələrində xidmət etməyə başlamışdı. Bu xidmət və müvafiq dairələrə mənsub şəxslərlə mədəni münasibət Mirzə Adıgözəl bəyə böyük təsir etmişdir.

Bütün göstərdiklərimiz, şübhəsiz, "Qarabağnamə"də əks olunmuşdur. Bu əsər feodal torpaq sahiblərinə mənsub bir adam tərəfindən yazılmışdır. Bunların hamısı hadisələrin işıqlandırılması xarakterinə müəyyən təsir göstərmişdir.

Beləliklə, "Qarabağnamə"nin tarixi mətai ona tənqidi və çox diqqətlə yanaşmağı tələb edir.

O, bu əsərin Qafqaz canişini knyaz Mixail Semyonoviç Voronsova təqdim ediləcəyini nəzərə almışdı. Buna görə, Mirzə Adıgözəl bəy hadisələri Qafqazda rus komandanlığının rəhbər dairələrində qəbul edilmiş rəsmi dillə ifadə edir.

Yuxarıda qeyd edildiyi kimi, tarixi hadisələrin şərhi 1736-cı ildə Muğanda İran feodal zadəganları qurultayının təsvirindən və Nadirin İran şahlığına "seçilməsindən" başlanır.

Mirzə Adıgözəl bəy Nadir şahı idealizə edir.

İranın feodal dairələri Nadir şahın şəxsində öz mənafelərinin ifadəçisini tapmışdılar. Nadir şah onların mövqeyini möhkəmlətmiş, onların torpaqlarını

və hakimiyyətini Türkiyənin işğalçılıq cəhdlərindən qorumaq üçün çox işlər görmüşdü. Lakin Nadir şah əhalinin zəhmətkeş kütlələrinə qarşı amansız bir zalım idi, Azərbaycana isə saysız-hesabsız fəlakətlər gətirmişdi. Azərbaycan xalqı Nadir şahın hakimiyyətinə qarşı inadla mübarizə edirdi. Nadir şah xalqı tamamilə tabe etməyə çalışaraq Azərbaycanın şimal hissəsi üzərində İranın hakimiyyətini möhkəmlətmək məqsədilə Şirvana dörd dəfə yürüş etmişdir. Bu yürüşlərin və Nadir şahın göndərdiyi cəza dəstələrinin hərəkətləri nəticəsində Şirvan dağıdılmış, əhalisi talan edilmişdi. Əhali öz yurdlarını tərk edərək dağlarda gizlənirdi. Tarlalar becərilmirdi, ölkədə aclıq başlanmışdı. Mirzə Adıgözəl bəy bütün bu hadisələrdən yəqin ki, xəbərdar idi, lakin bu barədə susur və Şərq tarixçilərinin köhnə ənənələrinə tabe olaraq Nadir şahı mədh edirdi.

Mirzə Adıgözəl bəy Nadir şahdan danışdıqda yalnız bir yerdə həqiqəti doğru göstərmişdir (Ziyad oğlanları nəslindən olan Gəncə bəylərinin Nadirin şahlığa "seçilməsinə" necə müqavimət göstərdikləri nəzərdə tutulur). Nadir şahın öz siyasi düşmənləri olan Ziyad oğlanlarına qarşı gördüyü tədbirlər haqqında Mirzə Adıgözəl bəyin göstərdikləri çox qiymətlidir.

Mirzə Adıgözəl bəyin əsərini diqqətlə oxuduqda ilk Qarabağ xanı Pənah xanın taleyinin onu çox həyəcanlandırdığını görmək çətin deyildir. Mirzə Adıgözəl bəy Pənah xanı yalnız müsbət cəhətdən göstərmişdir. O, igid, cəsarətli, müdrik dövlət xadimi, Qarabağ xanlığının banisidir. Mirzə Adıgözəl bəy Pənah xanın xasiyyətində şöhrətpərəstlik olduğunu qeyd edirsə də, lakin elə hesab edir ki, bu şöhrətpərəstlik Qarabağda dövlət qurulmasının xeyrinə yönəldilmişdir.

Mirzə Adıgözəl bəy Pənah xanı, görünür, Qarabağda müstəqil dövlət yaratdığına görə idealizə edir. Pənah xanın ona tabe olan ərazini genişləndirmək cəhətdən qazandığı hər bir müvəffəqiyyət Mirzə Adıgözəl bəy tərəfindən şübhəsiz bəyənilir. Hətta məhz onun sayəsində Mirzə Adıgözəl bəy Pənah xanın Qarabağ məlikləri ilə mübarizəsini tamamilə düzgün təsvir etmişdir.

Mirzə Adıgözəl bəy Cənubi Azərbaycanda özünə yer eləmiş Fətəli xan Əfşarın Pənah xanı özünə tabe etmək cəhdləri haqqında, həmçinin Fətəli xanın Pənah xanın oğlu İbrahimxəlil ağanı xəyanət və aldatmaq yolu ilə əsir tutması haqqında qəzəblə yazır. Müəllif bunu etiraf etmək istəmir ki, Pənah xan həqiqətən məğlub olmuşdu və Fətəli xan Əfşara tabe olmağa məcbur idi[1].

Qarabağ tarixinin bu hissəsinin süni qurulmasını və tarixi görüş dairəsinin bir qədər məhdudluğunu hələ ondan görmək olur ki, Mirzə Adıgözəl bəy

---

1 A.Bakıxanov "Gülüstani-İrəm"də yazır: "Pənah xan zahirən ona (Fətəli xan Əfşara - V.L.) itaet göstərdi və öz oğlu İbrahimxəlil ağanı ona girov verdi". B a x: A.Bakıxanov. Göstərilən əsər. Bakı, 1926, səh. 130.

XVIII əsrin ikinci yarısında Azərbaycanın ən böyük dövlət xadimi olan qubalı Fətəli xan və onun birləşdirici fəaliyyəti haqqında heç bir kəlmə də olsun danışmır. Mirzə Adıgözəl bəy İbrahim xandan asılı olan hakimlər arasında Quba hakimini göstərmir. Hətta ondan bir kəlmə belə danışmır. Halbuki, Fətəli xan İbrahim xanın ən ciddi düşməni idi və səksəninci illərdə onların arasında böyük toqquşmalar olmuşdu.

Mirzə Adıgözəl bəy Şuşanın müdafiəyə hazırlığını, onu mühasirə etmiş Ağa Məhəmməd şahın qoşunlarından özünü qəhrəmancasına müdafiə etməsini təsvir edir. Bu hadisələrdən danışdıqda Mirzə Adıgözəl bəy XVIII əsrin ən böyük şairi olan Molla Pənah Vaqifin adını çəkir.

1796-cı il yürüşündə rus ordusunun baş komandanı qraf V.A.Zubovun qoşunları Kür və Araz çayı yanındakı kənddə qış düşərgəsində olduğu zaman İbrahim xanın oğlu Əbülfət ağanın vasitəsilə Vaqifə qiymətli daşlarla bəzədilmiş bir əlağacı göndərməsi kimi çox mühüm bir fakta yalnız "Qarabağnamə"də rast gəlirik. Adətən belə hallarda olduğu kimi bu hədiyyə, görünür, Şuşanın İran qoşunlarından müdafiəsini təşkil etməkdə fəal iştirak etmək və Rusiyaya meyil göstərmək üçün bir iltifat əlaməti olaraq, imperatriçənin adından göndərilmişdi.

Bununla Mirzə Adıgözəl bəy İbrahim xan haqqında rəvayətini bitirir. İbrahim xanın faciəli sonu haqqında o, bir kəlmə belə danışmır. Məlum olduğu kimi, rəsmi məlumat İbrahim xanı xəyanət etməkdə, 1806-cı ildə knyaz Sisianovu öldürdükdən sonra Abbas Mirzənin qoşunları tərəfinə keçməkdə təqsirləndirilirdi[1]. Mirzə Camal bu hadisələri belə təsvir edir:

"Gələn 1806-cı ildə, yazda iranlılar yenidən Arazdan Qarabağa keçərək İbrahim xanın yanına casuslar göndərdilər ki, onu Rusiyadan ayrılmağa və onlarla ittifaq bağlamağa razı etsinlər.

İbrahim xanın bütün müdafiəsi mayor Lisaneviçin başçılığı altında olan bir batalyon soldatdan ibarət idi; qəhətlik olduğuna görə, bərk aclıq qorxusu altında olan əhaliyə güvənmək olmazdı; iranlılar görünən kimi onlar qaçıb dağılacaqdılar. Müqayisə edilməyəcək dərəcədə güclü olan düşmənə qarşı demək olar ki, hər bir müdafiə vasitələrindən məhrum olan Qarabağın bu vəziyyətini görən və hər barədə İbrahim xan tərəfindən xəbərdar edilmiş mayor Lisaneviç ona bildirmişdi ki, tezliklə rus qoşunları köməyə gələcək və düşmən tərəfindən ola biləcək hər bir təhlükə aradan qaldırılacaqdır. Lakin yeni qoşunların gəlməsi təxirə düşdü və İbrahim xan iranlıların onun mülklərinə qarşı sürətli təcavüzlərinin bir qədər qarşısını almaq üçün onlarla münasibətə girişdi, iranlılar Şuşanın 14 verstliyinə yaxınlaşdıqda isə ailəsilə

---

1 Podpolkovntk Lisaneviçin general-mayor Nesvetayevə yazdığı 4 sentyabr 1806-cı il tarixli raportu (Qafqaz Arxeoqrafıya Komissiyası aktları, c. III, sənəd 610, səh. 334).

bərabər Xan bağından çıxıb ondan bir qədər məsafədə düşərgə etdi. Bu, İbrahim xanın bizim hökumətə xəyanət etdiyinə dair bir çoxlarında şübhə oyatdı və onlar mayor Lisaneviçin qarşısında ona böhtan atdılar. O da İbrahim xana qarşı silah işlətməyə məcbur oldu. Beləliklə, İbrahim xan öz kiçik oğlanları və bəzi yaxın adamları ilə birlikdə öz ehtiyatsızlığının qurbam oldu"[1].

Mirzə Adıgözəl bəy öz kitabında İbrahim xana bəraət qazandıra bilməzdi; çünki bu bəraət İbrahim xanın öldürülməsinə yol vermiş rus hakim dairələrini təqsirləndirmək olardı. O, İbrahim xanın öldürülməsini xəyanətlə izah edən rəsmi məlumata da tərəfdar ola bilməzdi. Buna görə, İbrahim xanın həyat və fəaliyyətini təsvir etmiş Mirzə Adıgözəl bəy onun öldürülməsinə dair öz sözünü söyləməkdən boyun qaçırmağa və bu barədə susmağa məcbur olmuşdu.

İbrahim xanın xələfi, öz müasiri olan qarabağlı Mehdiqulu xana Mirzə Adıgözəl bəy çox laqeyd yanaşır, onu böyük işlərə qadir olan adam kimi görmür, yalnız onun adına hörmət edirdi. Eyni zamanda Mirzə Adıgözəl bəy 1805-1813 və 1826-1828-ci illərin Rusiya-İran müharibələri dövründə rus təbəəliyindən çıxıb İranın tərəfinə keçən bəyləri dərindən təqsirləndirir. Rusiyaya istinad etməsində ardıcıl olan Mirzə Adıgözəl bəy hətta şəxsən ona yaxın olan qarabağlı Mehdiqulu xanı müharibədə İran qoşunları tərəfində iştirak etməsi üçün təqsirləndirirdi.

Mirzə Adıgözəl bəyin tərcümeyi-halından bilirik ki, qarabağlı Mehdiqulu xan əslən onun vasitəsilə İrandan Qarabağa qayıtmışdır. Qarabağın tarixi ilə əlaqədar olan məsələlər bunlardır.

Mirzə Adıgözəl bəy Qarabağın tarixini o zaman Zaqafqaziyada vaqe olan geniş hadisələr zəminində təsvir edir. Buna görə, "Qarabağnamə"də Gürcüstanın və başqa Azərbaycan xanlıqlarının tarixinə dair bir çox məlumat vardır.

Mirzə Adıgözəl bəy 1751-ci ildə II İraklinin Gəncə üzərinə hücum etdiyi zaman Gəncə, Qarabağ, Şəki xanlıqları və s. ilə qəbilə müharibəsi faktlarını bir epos kimi təsvir etmişdir.

Tiflisi Ağa Məhəmməd şahın qoşunlarından müdafiə edən zaman II İraklinin vəziyyətinə dair Mirzə Adıgözəl bəyin yazdıqları çox qiymətlidir. Gürcüstan padşahları sülaləsinin üzvləri arasında ixtilaf və münaqişələrdən, şahzadələrin və knyazların İrakliyə tabe olmamasından, Tiflisin müdafiəsi işinə onların qayğısız yanaşmasından danışılan bu təsvirdə bizim üçün əhəmiyyətli cəhət burasıdır ki, bunları hadisələrin müasiri olan bir adam təsvir edir. Bu təsvirdə həmin hadisələrin gedişində və onlardan sonra keçən ilk illərdə onlara xalq tərəfindən verilən qiymət verilmişdir. Bu sətirlərdən biz görürük ki,

1 Camal Cavanşir Qarabaği. "Qarabağ" (farscadan tərcüməsi A.Berjenindir). "Kavkaz" qəzeti, 1855-ci il, N° 69.

Mirzə Adıgözəl bəydə vətənpərvərlik hissi çox inkişaf etmişdir, o öz müasirlərindən vətənə sədaqət və məhəbbət bəsləməyi tələb edir.

O, Gürcüstan dövlətinin yaxşı qurulmadığından, bunun nəticəsində onun zəifləməsindən və İran qoşunlarının paytaxta basqın etdiyi zaman xalqın başına gelən dəhşət və fəlakətlərdən dərin bir təəssüflə danışır. Mirzə Adıgözəl bəy Gürcüstanın axırıncı padşahı XII Georginin rus təbəəliyinə qəbul edilməyi xahiş etməyə məcbur edən səbəbləri qısa, lakin dərindən təsvir edir.

Mirzə Adıgözəl bəy II İraklinin ikinci arvadının - Darya Georgiyevnanın rus dövləti tərəfindən təyin edilmiş hakimlərə qarşı üsyan qaldıran və İran ya Türkiyə vasitəsilə Gürcüstanın hakimiyyətini öz əllərinə almağa çalışan oğlanlarını təqsirləndirir. Mirzə Adıgözəl bəy bu şahzadələrin hakimiyyət və şəxsi rifah arzusunda olduqlarını və ölkənin taleyinə laqeyd yanaşdıqlarını görür. Onun zənnincə bunlar ölkəyə nə əmin-amanlıq, nə dövlət qayğısı verməyə qadir deyildirlər, buna görə bu şahzadələri və onların anası Darya Georgiyevnanı Rusiyaya sürgün etmiş rus hakimlərinin hərəkətlərini bəyənir.

Mirzə Adıgözəl bəy rus qoşunlarının Gəncə xanlığı üzərinə yürüşü ilə əlaqədar olan hadisələrə müstəqil surətdə qiymət verir. Əsərin mətnindən görünür ki, Mirzə Adıgözəl bəy gəncəli Cavad xanı dinc yol ilə gedib rus təbəəliyinə daxil olmadığına görə təqsirləndirir. Mirzə Adıgözəl bəy Cavad xanın Gəncəni rus qoşunlarından müdafiə etməsini və əldə silah olaraq vuruşma zamanı qala divarı üstündə həlak olduğunu qəhrəmanlıq hesab etmir, hətta Cavad xanı qan tökülməsində təqsirləndirir. Qalan hadisələrin işıqlandırılmasında o, bir zaman verilən rəsmi təsvirə riayət edir. Rus ordusu zabiti kimi o, öz mövqeyinə görə belə etməlidir, lakin buna baxmayaraq, müəllifin təsvir etdiyi hadisələrə öz şəxsi münasibətini yenə də görmək olur.

XIX əsrin rus dvoryan-burjua tarixçilərindən bəziləri bakılı Hüseynqulu xanı doğrultmağa çalışaraq göstərirlər ki, yaşlı adamların rəvayətlərinə görə Hüseynqulu xanın hiyləgərlik və xəyanət fikri olmamışdır və knyaz Sisianovun öldürülməsi aktı onun xəbəri olmadan Bakı xanlığının saray dairələrində çox güclü nümayəndələri olan İran tərəfdarları tərəfindən hazırlanmışdı[1]. İran tərəfdarları dairələrinin nümayəndələri Hüseynqulu xanı İran tərəfdarlarının siyasi xətt-hərəkətinə tabe etmək istəyərək, knyaz Sisianovu öldürdülər ki, Zaqafqaziyada rusların işlərinə qarışıqlıq salsınlar və İran qoşunlarının Azərbaycanın şimal hissəsinə soxulmasına yardım etsinlər, həmçinin Hüseynqulu xanı Rusiya hökuməti ilə sazişə girmək imkanından məhrum etsinlər.

Bakılı Hüseynqulu xanın fikir və məqsədləri haqqında inamla mühakimə etməyə imkan verən lazımınca məlumat olmadığından bu məsələləri həll

1 Qafqazda rus hakimiyyətinin qurulması (general-mayor Pottonun redaktəsilə), I c, Tiflis, 1901, səh. 231-233.

etmək, əlbəttə, çətindir[1]. Buna görə də, Mirzə Adıgözəl bəyin verdiyi məlumatın tarix üçün daha çox əhəmiyyəti vardır. Mirzə Adıgözəl bəy yazır ki, knyaz Sisianov ilə münasibəfiərində Hüseynqulu xan ikiüzlülük edir və pis fikir daşıyırdı. Öz fikirlərini isbat etmək üçün Mirzə Adıgözəl bəy göstərir ki, knyaz Sisianov öldürüldükdən sonra onun başı Fətəli xana göndərildi, Bakının çölləri isə İran qoşunları ilə doldu.

Sonrakı illərdə, xüsusən 1826-cı ildə Rusiya-İran müharibəsi zamanı Hüseynqulu xan özünü ən qəddar İran tərəfdarı kimi göstərdi. O, öz kinində elə amansız idi ki, 1826-cı ildə keçmiş tabeləri olan Abşeron kəndləri əhalisini Bakı qalasını almaq təşəbbüslərində ona yardım göstərmədikləri üçün talan etmişdi.

Mirzə Adıgözəl bəy İran dövlətinə qarşı düşmənçiliyində tamamilə ardıcıllıq göstərir. Əgər "Qarabağnamə" yazılan zaman Nadir şahın tarixi uzaq keçmişə aid olub heç bir gündəlik siyasi əhəmiyyətə malik deyil idisə, rus dövlətinin düşmənləri olan Ağa Məhəmməd şah və Qacarlar haqqında Mirzə Adıgözəl bəy heç bir kəlmə belə yaxşılığa danışmır. Bir neçə yerdə o, Ağa Məhəmməd şahın amansızlığından və qəddarlığından danışır və onun öldürülməsi faktını onun amansızlığı ilə əlaqədar edir. Halbuki, "Qarabağnamə"nin mətni qətl aktının sui-qəsd nəticəsi olduğunu güman etməyə imkan verir, bu sui-qəsddə isə həllədici və rəhbər rolu çox nüfuzlu Azərbaycan xanlarından biri Sadıq xan Şəqaqi oynamışdır. Buna görə də, Ağa Məhəmməd şahın yerində oturmuş Fətəli şah, Sadıq xanı öldürməyəcəyinə dair and içmişdisə də, Sadıq xan onun əlinə keçən kimi onu boş otağa salmış və ac saxlayaraq öldürmüşdü.

Mirzə Adıgözəl bəy əsərinin bəzi yerlərində xalq kütlələrinin İran dövlətinə münasibəti məsələsi üzərində dayanır. Məsələn, knyaz Sisianov öldürüldükdən, İran qoşunları isə Qarabağa və Bakı düzlərinə doluşduqdan sonra Mirzə Adıgözəl bəy yazır: "Bu vilayətlərdə İran qanunları həyata keçirildi və (ölkə) onların əsassız qaydalarına tabe edildi. Bunun nəticəsində az qalmışdı ki, bu vilayətlərə qarışıqlıq düşsün". Bu, şübhəsiz ki, xalq kütləsi rəyinin düzgün qiymətidir. Təəssüf ki, Mirzə Adıgözəl bəy 1826-1828-ci illərin Rusiya-İran müharibəsi dövründə Qarabağ əhalisinin Rusiya və İran qoşunlarına münasibətini tamamilə yanlış işıqlandırmışdır. Bu müharibə hadisələrinin iştirakçısı olan Mirzə Adıgözəl bəy bir çox ayrı-ayrı faktların arxasında hərbi hərəkatın nə kimi ümumi bir şəraitdə keçdiyini görməmişdir.

---

1 A.Bakıxanov "Gülüstani-İrəm"də yazır: "1806-cı il fevralın 8-də Bakı darvazası yanında Hüseynqulu xan ilə görüşən zaman, gözlənilmədən və bütün xalq hüquqlarının əksinə olaraq, iranlıların təhrikinə görəmi, ya xanın özünün əmri iləmi baş komandan xanın dayısı oğlu İbrahim bəy tərəfindən öldürüldü" (B a x: A.Bakıxanov. "Gülüstani-İrəm", Bakı, 1926, səh. 155).

Abbas Mirzənin ordusu Gəncə yaxınlığında məğlub olduqdan sonra Yermolov Qarabağ haqqında belə yazır:

"Güman etmirəm ki, Abbas Mirzə Qarabağda bir daha vuruşmağa cəsarət etsin; çünki mənim zənnimcə buranın əhalisi nəinki heç bir ərzaq verməz, hətta onun pərakəndə qoşunlarını qırmağa çalışar, dəhşət bu qoşunlardakı intizamsızlığı qat-qat artırır"[1].

Abbas Mirzə bilirdi ki, əgər rus qoşunları onlara qarşı xalq müharibəsi alovuna tutulmasalar, İran qoşunlarına nisbətən sayca az olmalarına baxmayaraq, yenə də onlara qalib gələcəklər. Abbas Mirzənin planı bundan ibarət idi ki, yerli üsyanlar qaldırsın, rus qoşunlarının qüvvələrini xırdalayıb parçalasın və onları hissə-hissə məhv etsin. Bu planı hər şeydən əvvəl ona görə həyata keçirmək mümkün olmadı ki, Azərbaycan kəndlilərinin əsas kütləsi rus qoşunlarına qarşı silah qaldırmaq istəmədi.

Mirzə Adıgözəl bəy öz əsərində rus ordusunda xidmət edən bəzi bəylərin xəyanət etməsi faktlarını qeyd edir, həm də rus qoşunlarının düçar olduqları böyük müvəffəqiyyətsizlik və məğlubiyyətləri bu faktlarla əlaqələndirir. 1826-cı ilin yayında İran qoşunlarının böyük qüvvələri Qarabağa soxulduqdan sonra, Gorasdan Şuşaya gedən 42-ci əgər alayının üç rotasının taleyi buna bir misaldır. Bu dəstə kapitan Hacı Ağalar bəyin xəyanəti nəticəsində məhv edilmişdi. O, Abbas Mirzənin tərəfinə keçmiş bəylərlə və kürd dəstəsi ilə birlikdə geri çəkilən rotaları təqib etmək və onları qırmaq işində İran qoşunlarına kömək etmişdi.

Əgər 1826-cı il müharibəsinin necə başlandığını və bu zaman İran sərhədində ayrı-ayrı qarovul dəstələrinin dayandığını nəzərə alsaq, asanlıqla görmək olar ki, yerli əhali qoşunlara qarşı silah qaldırıb onların yolunu kəssə idi, Yermolov böyük məsafədə səpələnmiş hərbi qüvvələri Tiflisə tərəf çəkib toplaya bilməzdi.

Rus ordusunun zabiti kimi Mirzə Adıgözəl bəy rus qoşunlarının qüdrət və qüvvətindən böyük bir fəxr ilə danışır. Demək lazımdır ki, bu qiymət əksəriyyətlə düzgündür; çünki İranla müharibədə rus soldatları həqiqətən səbat, mərdlik, igidlik göstərir və ölümə həqarətlə baxırdılar. Onlar dəfələrlə özlərindən sayca çox olan düşmənlə vuruşmalı olmuş və bununla belə parlaq qələbələrə nail olmuşdular.

Mirzə Adıgözəl bəyin əsərini Qarabağın tarixini və ya 1805-1813 və 1826-1828-ci illərin Rusiya-İran müharibələri tarixini öyrənmək üçün əsas olan bir kitab kimi qiymətləndirmək olmaz. Bu kitabda hadisələr lazımınca tam təsvir edilməmişdir, onların səbəbləri lazımınca dolğun izah edilməmiş,

---

1 General Yermolovun 1826-cı il sentyabrın 17-də padşahın hüzuruna yazdığı raport (AKAK, c. VI, h. II, sənəd 686, səh. 378).

həmçinin onların əhəmiyyəti qiymətləndirilməmişdir. Hələ yalnız bunu göstərmək kifayət edər ki, İran ordusunun 1812-ci ilin payızında və 1813-cü ilin əvvəlində düçar olduğu böyük hərbi məğlubiyyətlər haqqında, məsələn, Aslan düzündə İran ordusunun məğlub olması[1], həmçinin Lənkəranın rus qoşunları tərəfindən mühasirə edilməsi və alınması[2] haqqında heç bir şey yazmır.

Mirzə Adıgözəl bəy Napoleon ordusunun Rusiyada məğlub olması əhəmiyyətinin qiymətləndirilməsindən və bu faktın 1905-1913-cü illərin Rusiya-İran müharibəsinə təsirindən də danışmır.

Müəllif Gülüstan və Türkmənçay sülh müahidənamələrinin Azərbaycan tarixindəki əhəmiyyəti haqqında da heç bir şey yazmır. Müəllifin diqqət vermədiyi daha bir çox hadisələri və mühüm məsələləri də qeyd etmək olardı. Beləliklə, hadisələri tamamilə dolğun işıqlandırmaq cəhətdən "Qarabağnamə" bu və ya qeyri dövrün tarixini öyrənmək üçün vəsait ola bilməz. Həmçinin tamamilə aydındır ki, bu əsərin müəllifi çox vaxt hadisələrin səbəbləri arasındakı rabitəni izah etmir və onların əhəmiyyətini qiymətləndirmir.

Beləliklə, "Qarabağnamə"nin XVIII əsr hadisələrini təsvir edən hissəsi hekayə xarakteri daşıyır; çünki müəllif onlar barəsindəki məlumatı əsas etibarilə qocaların danışıqlarından almışdır; müəllifin öz dövründə olan hadisələri təsvir etdiyi hissədə isə (XIX əsrin tarixi) bu mənbə məhz həmin tarixin təsvir edildiyi dövrdə tərtib edilmiş bir sənəd kimi qiymətli və doğrudur.

Mirzə Adıgözəl bəy özü "Qarabağnamə"ni yazmaq üçün istifadə etdiyi mənbələr haqqında əsərinin girişində belə yazır: "Çünki mən bundan əvvəl keçmiş Gürcüstan sərdar və əmirlərinin hüzuranda xidmət etmişdim, bir-birindən fərqli olan dilləri və müxtəlif ləhcələri bilirdim. Mən bu əhvalatın bir hissəsini erməni, bir qismini də gürcü və müsəlmanların yaşlı adamlarından soruşub öyrənmiş və çoxlu məlumat yığmışdım. Buna görə, o böyük cənabın[3] əmrinə itaət edərək, işə başladım. Mirzə Hüseyn Məmmədağa oğlu Salari təxəllüsdən xahiş etdim ki, mənim söylədiklərimi dediyim kimi, gözəl bir ifadə ilə yazsın".

Qeyd etmək lazımdır ki, Mirzə Adıgözəl bəy istifadə etdiyi mənbələrin hamısını göstərməmişdir. Mirzə Adıgözəl bəyin "Qarabağnamə"sinin

---

1 General Rtişşevin həqiqi stats-sovetnik Malinskiyə 1812-ci il 26 oktyabr tarixində yazdığı 488 nömrəli əmr (AKAK, c. V, sənəd 841, səh. 683). General Rtişşevin 1812-ci il 31 oktyabr tarixində padşahın hüzuruna yazdığı raportla müqayisə edin (AKAK, c. V, sənəd 843, səh. 684).

2 Həqiqi stats-sovetnik Malinskinin 1813-cü il 26 yanvar tarixində general-mayor Portnyakinə yazdığı 61 nömrəli təliqə (AKAK, c. V, sənəd 853, səh. 699). Bu xüsusda general Rtişşevin 1813-cü il 28 yanvar tarixində padşahın hüzuruna yazdığı 31 nömrəli raporta da baxın (AKAK, c. I, sənəd 854, səh. 700)

3 Tiflis vitse-qubernatoru podpolkovnik Mixail Petroviç Kolyubakinin.

mətnini Mirzə Camalın "Qarabağ tarixi" əsərinin mətni ilə tutuşdursaq, asanlıqla görərik ki, hər iki əsərdə hadisələr eyni plan üzrə verilir. Hər ikisində əsasən, eyni faktlar təsvir edilir.

Mirzə Adıgözəl bəy "Qarabağnamə"nin heç bir yerində Mirzə Camalın əsəri ilə tanış olduğu və öz əsərini yazdıqda ondan istifadə etdiyinə dair heç bir şey yazmır. Lakin Mirzə Adıgözəl beyin özgə sələfinin əsəri ilə tanış olduğuna heç bir şübhə ola bilməz.

Molla Pənah Vaqifin ölümündən sonra Mirzə Camal qarabağlı İbrahim xanın vəziri idi. Mirzə Camal yaşca Mirzə Adıgözəl bəydən böyükdür. O, XVIII əsrin son ori illərində baş vermiş hadisələrin şahidi və öz mövqeyinə görə, Qarabağ tarixinə yaxşı bələd olan bir adam olmuşdur. O, öz əsərini Mirzə Adıgözəl bəydən qabaq yazmışdı və əlbəttə, Mirzə Adıgözəl bəy bu əsərdən xəbərdar olmaya bilməzdi.

Lakin bu elə başa düşülməməlidir ki, Mirzə Adıgözəl bəy sadəcə Mirzə Camalın əsərlərinin mətnini təkrar etmişdir. Mirzə Adıgözəl bəyin "Qarabağnamə"sində bir çox faktlar vardır ki, Mirzə Camal onlardan heç danışmır. Mirzə Adıgözəl bəyin təsvir etdiyi tarixi hadisələrin dairəsi Mirzə Camalın təsvir etdiklərindən daha genişdir. Mirzə Adıgözəl bəyin öz əsərində aşağıdakı məsələlərə: Qarabağ məliklərinin haradan əmələ gəlməsinə, Vaqifin dövlət fəaliyyətinə, Şuşanın Ağa Məhəmməd şahın qoşunlarından müdafiəsinin nisbətən müfəssəl təsvirinə, Ağa Məhəmməd şahın basqını ərəfəsində Gürcüstanın siyasi vəziyyətinə, Tiflisin İran qoşunlarından müdafiə olunmasına, İran qoşunlarının Tiflisi dağıtmasına və talan etməsinə, XII Georginin taxta çıxmasına, Gürcüstanın Rusiya imperatorluğu təbəəliyinə keçməsinə, XII Georgiyə qarşı şahzadələrin qaldırdıqları üsyanlara və Gürcüstanın tarixinə aid bir çox başqa məsələlərə xüsusi diqqət verdiyini söyləmək kifayət edər. Bunlardan başqa, Mirzə Adıgözəl bəy çar qoşunlarının Car vilayətinə yürüşlərini, Bakıya hərbi səfəri, knyaz Sisianovun öldürülməsini, 1805-1813-cü illərin müharibəsindən bir sıra hadisələri və nəhayət, 1826-1828-ci illərin Rusiya-İran müharibəsini təsvir edir.

Saydığımız məsələlərin çoxu haqqında Mirzə Camalın əsərində heç bir məlumat yoxdur. Mirzə Adıgözəl bəylə Mirzə Camalın əsərlərinin mətninin müqayisə edilməsi göstərir ki, Mirzə Adıgözəl bəy Mirzə hadisələri Camaldan daha geniş təsvir etmişdir.

Mirzə Camal Qarabağın tarixini 1813-cü ilə qədər, Gülüstan sülh müahidənaməsi bağlanana qədər təsvir edir. Mirzə Adıgözəl bəy isə hadisələri 1828-ci ilə, Türkmənçay sülhü bağlanana kimi təsvir edir. Beləliklə, Mirzə Adıgözəl bəy 1826-1828-ci illərin Rusiya-İran müharibəsini Azərbaycan tarixində ilk dəfə olaraq təsvir etmişdir.

Əsərin XII fəslini təşkil edən bu dövrün hadisələrinin təsviri ifadəsinin qısalığına baxmayaraq, lazımınca dolğun verilmişdir. Demək olar ki,

1826-1828-ci illərin Rusiya-İran müharibəsi hadisələrindən Mirzə Adıgözəl bəy ən mühüm olanlarını ayırmış və onları ciddi xronoloji qayda ilə təsvir etmişdir.

Mehdiqulu xanın yanında, sonra isə Şuşa şəhər məhkəməsində xidmət etmiş bir qarabağlı kimi, Mirzə Adıgözəl bəy Qarabağın mahallara bölünməsi, hər mahalın təbii sərvətləri və təsərrüfatının tarixi xüsusiyyətləri, Qarabağın köçəri və oturaq əhalisinin cəlb edildiyi vergi və mükəlləfiyyətlər, xanlar zamanı Qarabağın idarə edilməsi haqqında bir çox qiymətli məlumat verə bilərdi. Mirzə Adıgözəl bəyin əsərinin mətnində göstərdiyimiz məsələlərə xüsusi fəsillər həsr edilməmişdir. Yuxarıda göstərilən məsələlər üzrə bu əsərdən yalnız Qarabağın siyasi tarixinin şərhində verilmiş ayrı-ayrı məlumat əldə etmək olar.

Mirzə Adıgözəl bəydən sonra Qarabağın tarixini yazmış Mir Mehdi Xəzani öz əsərinin birinci fəslini Qarabağın coğrafiyasının təsvirinə həsr etmiş və bununla da Mirzə Adıgözəl bəyin əsərində boş qalmış yeri qismən doldurmuşdur.

"Qarabağnamə"nin on ikinci fəslinin son sətirlərindən göründüyü kimi, müəllif Dağıstan müharibəsinin təsvirini bitirdikdən sonra 1828-1829-cu illərin rus-türk müharibəsindəki hadisələri, bəlkə də Dağıstandakı müharibənin hadisələrini təsvir etmək fikrində imiş. Lakin onun bu fikri həyata keçirilməmiş qaldı. Məlum olduğu üzrə, Dağıstanda müharibə yalnız 1859-cu ildə, yeni Mirzə Adıgözəl bəyin ölümündən azı on il sonra qurtardı.

Mirzə Adıgözəl bəyin əsəri konkret tarixi məzmunla zəngindir. Bu əsərin müəllifi böyük bir səy və məhəbbətlə Qarabağın və qismən Zaqafqaziyanın tarixinə aid bir çox material toplamışdır. O öz vətəninin gələcək tarixi taleyini irəlicədən təyin edən hadisələrə böyük bir diqqətlə yanaşmışdır. Mətnin böyük bir hissəsi ya hadisələrin şahidi və hər halda onların müasiri tərəfindən yazılmışdır.

"Qarabağnamə" XIX əsrin qırxıncı illərinin Azərbaycan tarixnəvisliyində ən qiymətli əsərlərdən biridir.

Bu əsər, şübhəsiz, bəhs edilən dövrün tarixi öyrənildikdə geniş surətdə istifadə ediləcəkdir.

V.N.Leviatov

...[1] (Qarabağ mahalında Rusiya hakimiyyəti bərpa olandan bir qədər sonra) buraya təyin olunan hakimlərdən biri də... general Kolyubakinin oğlu cənab podpolkovnik Mixail Petroviç idi. Onun keçmiş hadisələri bilməyə həmişə həvəsi vardı. Podpolkovnik xüsusilə Qarabağ xanlarının və (Şuşa) şəhərini bina edən şəxsin əhvalatını öyrənmək istəyirdi. Buna görə, məndən - kapitan Mirzə Adıgözəl bəydən xahiş etdi ki, bu əhvalatı qısa və müxtəsər bir surətdə bəyan edim. Çünki, mən bundan əvvəl keçmiş Gürcüstan sərdar və əmirlərinin hüzurunda xidmət etmişdim, bir-birindən fərqli olan dilləri və müxtəlif ləhcələri bilirdim. Mən bu əhvalatın bir hissəsini erməni, bir qismini də gürcü və müsəlmanların yaşlı adamlarından soruşub öyrənmiş və çoxlu məlumat yığmışdım. Buna görə, o böyük cənabın əmrinə itaət edərək, işə başladım. Mirzə Hüseyn Məmmədağa oğlu Salari təxəllüsdən xahiş etdim ki, mənim söylədiklərimin hamısını eynən gözəl bir ifadə ilə yazsın. Ümid edirəm ki, (tarixə aid) bu müxtəsər hekayət və bu nöqsanlı rəvayət... Xalqın ürəyinin aynasına səfa verər, xas adamların və avam camaatın bəsirət gözünün sürməsi olar. Bu cüzi məlumat bir müqəddiməyə və bir neçə fəslə bölündü.

MÜQƏDDİMƏ

## BU TARİX KİTABININ HANSI İLDƏ YAZILMASI HAQQINDADIR

Əsrlər, illər və aylar keçdi, hicri tarix 1261-ci ilə[2], rus tarixi isə 1845-ci ilə çatdı...

(Bu ildə həmin əsəri yazmağa başladıq.)

1 Burada və başqa yerlərdə qoyulan nöqtələr tarixi əhəmiyyəti olmayan hissələrin mətndən çıxarıldığını göstərir.

2 Hicri 1261-ci il, 1845-ci il yanvarın 10-da başlanmış, dekabrın 29-da qurtarmışdır

BİRİNCİ FƏSİL

## İRANIN TƏNƏZZÜL DÖVRÜNDƏN, NADİR ŞAHIN TAXTA ÇIXMASINDAN VƏ ƏMƏLƏ GƏLƏN BAŞQA HADİSƏLƏRDƏN BƏHS EDİR

Tərsinə dolanan fələkin... hərəkəti nəticəsində Səfəvi padşahlarının dövlət günəşi batmağa başladı. Bu dövlətin... ayı axıra çatıb, puç və yox olmağın son gecəsinə girdi (batdı)... İran ətrafdakı zalımların əlilə talan edildi və yağıların ayaqları altında paymal olurdu. (Onun) hər mülkünə bir hökmdar müstəqil olaraq yiyələndi. Hər vilayətində calal sahibi, uca mərtəbəli bir vali hökmran oldu. Onların zülm və əziyyətlərinin küləyi, cövr və inadlarının isti yeli, cənnətə bənzəyən o gülşəni əkinsiz bir çölə döndərdi.

Axırda, Qırxlı Nadir şah Əfşarın dövlət və rəşadətinin küləyi... Xorasan vilayətindən olan... Əbivərd tərəfindən əsməyə başladı... (Bir çox müharibələrdən sonra, Nadir şah[1]) geniş bir səhradan ibarət olan Muğan çölündə qışlaq binasını qoydu. İmarət və otaqlar bina etdirdi. 1148-ci ildə[2] dövlət binasının möhkəm rüknü və hökumət sarayının mətanətli sütunu olan vilayətin böyük adamlarını, dövlət ərkanını və məmləkətin əyanlarını öz qulluğuna çağırdı. Yüz min nəfərə yaxın böyük fəzilətli adamlar və əmirlərin başçıları cəm olub qurultay açıldı. O zaman ruzgarın saqisi hələ Şah Təhmasibin həyat piyaləsini acı ölüm şərbətilə doldurmamışdı. Dörd yaşlı oğlu Abbas Mirzə də... həyat beşiyində istirahət yuxusu ilə məst idi.

Bu zaman Nadir şah aşağıdakı sözləri mirvari danələri kimi ipə düzərək, böyük hökumət adamlarına üzünü rutub dedi:

- İşıqlı günəşdən və ondörd gecəlik aydan daha aydın və aşkardır ki, İran ərsəsinin hər bir xanəsində məst bir fil yatmışdı. İran sahəsinə hər bir tərəfdən adsız-sansız üsyançılar piyada əsgər kimi üz qoymuşdular. (Onlar) səltənət meydanının baş süvarisini bütün dünya əhli qarşısında məsxərə edərək, İranın şahlıq taxtına oturmaq iddiasında idilər. Uca dövlət ərkanını və Səfəvi sülaləsinin böyük

---

1 1736-cı ildə Muğanda şah elan edilmiş Təhmasibqulu xan nəzərdə tutulur. Təhmasibqulu xan şahlığı qəbul edəndən sonra Nadir şah adı ilə adlandırılmışdır.

2 Hicri 1148-ci il, 1735-ci il mayın 24-də başlanmış, 1736-cı il mayın 11-də qurtarmışdır.

adamlarını mat qoyub, tədbir və siyasət sahibi olmuşdular. Himmət və qeyrətimin mahir nərdçisi bunu qəbul etmədi. Mal ilə canımın iki zərlərini təvəkkül və etimad pəncəsinə aldım, dörd ünsürdən[1] ibarət olan dünyanın çöl və biyabanını gəzdim. Yüz oyun və min hiylə ilə bədməst hərifi siyasətin şahmat oyununda mat və heyran qoydum. Axırda, muradımızın nəqşəsi varlıq səhifəsində görünməyə başladı. İndi isə, xaraba qalmış İran məmləkətini düşmənlərin təcavüzündən xilas etmişəm. Səfəvi Şah Təhmasib ilə oğlu Abbas Mirzə hər ikisi nəcabət səmasının günəşləri və səltənət fəzasının səadət ulduzlarıdırlar. Onlardan hər hansını padşahlıq və hökmranlıq taxtına layiq bilsəniz, mən də sizinlə birlikdə dinməz-söyləməz onun qulluğunda durub, itaət halqasını qulağıma asaram. Mən onun qulluğunu yerinə yetirmək üçün canımdan keçərəm. İtaətində hazır olub, əmrini yerinə yetirərəm. Hətta icrası vacib olan fərmanını həyata keçirməkdə sədaqətlə gözətçi olaram...

Nadir şah padşahlıq və hökmranlıq taxtına özündən başqasını layiq görmədi və səltənət taxtına oturdu...

Gəncə xanları əslən Qacar nəslindən olub, onlara Ziyadoğlu adı da verirdilər... Onlar yalnız bəylərbəyi deyil, bəlkə səlahiyyətli sərdar da olmuşdular. (Bu isə bütün) aləmə aydın və aşkardır. Gəncə xanlığı ilə Gürcüstan arasındakı sərhəd Sınıq körpüdən yuxarı olan Suridaşa qədər uzanırdı. (Cənubi) Azərbaycanda Gəncə xanlığı arasındakı sərhəd isə Xudafərin körpüsünə yetişirdi. Bəzi vaxt Gəncə xanlarının hökmranlıq bayrağı Darüssürur[2] (Tiflis) sahəsinə də əmin-amanlıq kölgəsi salardı. Tiflisin bütün əhalisi bunların hökmünə tabe olardı. Bunlar Muğan qurultayında, gizlin və aşkar olaraq, son dərəcə çalışdılar ki, səfəvilərdən başqa bir kimsə padşah olmasın və özgə bir şəxs səltənət balışına söykənməsin. Demə ki, bunların bütün fikirlərini Nadir şaha xəbər aparıb və bütün sözlərini onun hüzuruna çatdırırlarmış... Ziyad oğlanları qədim bir ocaq və böyük bir dudman olduqlarına görə, Nadir şah onlara özgə bir cəza və başqa bir siyasəti rəva görmədi. Qazax və Borçalı ellərini öz xanları ilə bərabər Gürcüstan əmirlərinə və uca mərtəbəli valinin hökmünə tabe etdi. Cavanşir, Otuziki və Kəbirlidən ibarət

---

1 Torpaq, su, od və hava nəzərdə tutulur.

2 Şadlıq evi

olan Qarabağ elləri haqqında da, icrası vacib olan fərman çıxdı ki, onları köçürüb Xorasanın Sərəxs torpağına aparsınlar. Onlara orada yer və məskən təyin etsinlər.

Xəmsə məliklərinə də əmr verdi ki, Gəncə xanlarının itaət zəncirini mənim möhkəm hökmüm vasitəsilə xas və avam camaatın boynundan kənar edin. Özünüzü tamamilə azad sayın. Bütün ərizələrinizi və vacibli işlərinizi yazıb mənim... hüzuruma göndərin.

Beləliklə, Gəncə xanlarının ixtiyarları tamamilə əllərindən çıxdı. Səlahiyyətləri alındığından qol-qanadları sındı və çox pərişan oldular.

## İKİNCİ FƏSİL

## MƏRHUM PƏNAH XANIN NƏSLİNDƏN VƏ ƏHVALATINDAN BƏHS EDİR

Pənahəli bəy əslən Sarıcalı tayfasındandır... Gəncə vilayəti xanlarının işi tərəqqidə olduğu zaman o, Gəncə tərəfinə gedib onların (Gəncə xanlarının) hüzurunda xidmət etdi. Uca himmət sahibi olan Pənahəli bəy qulluq etməyi özünə layiq görmədi. O, Qarabağ vilayətinin Cavanşir oymağına[1] gəldi. Şir qüvvətli cavan bəxti ona yar olub, çox varlandı. Evləndi, əziz və xoşbəxt bir oğlu oldu. O, yüksəklik səması parlaq ulduzunun adını Əli qoydu. Onun aləmi işıqlandıran sarı bənizi ata-anasının ürəyini, kəhrəba samanı çəkən kimi, özünə cəlb edirdi. Buna görə, onu "Sarıca Əli" deyə çağırırdılar.

Çox dövlət və nüfuz sahibi olduğuna görə, onun başına bir çox gəlib-keçən, naxırçı, muzdur, xidmətkar, çoban və ilxıçı toplandı və böyük bir oba oldu. O obanın adı isə "Sarıcalı" qaldı... Bu dövlət və nüfuz İbrahimxəlil ağanın ixtiyarına keçdiyi zaman daha da artdı. O, böyük dövlət sahibi olduğundan adı dillərə düşüb məşhur oldu. Onun Ağdamdakı bağı və hasar divarı, Arasbar və Araz kənarındakı mülkü, mal-qarasının otlaq və yataqları, yaylaqda "İbrahimxəlil qalağı" adı ilə məşhur olan bir imarəti onun varlı və böyük calal sahibi olmasına adil bir şahiddir.

---

1 Oymaq – qəbilənin tərkibinə daxil olan tayfalardan hər birinin ümumi adıdır. Həmçinin hər hansı bir tayfanın tutduğu sahəyə də deyilir.

Nadir şah Cavanşirdən qoşun yığdığı zaman, İbrahimxəlil ağanın rəşid və böyük oğlu Fəzləli bəyi özünə naib[1] etdi. Eşikağası[2] mənsəbini ona münasib gördü və bu qulluğu o mərhumə verdi. Zirəkliyin nuru onun alnında parlayır və nəcabət asarının günəşi mübarək üzündə görünürdü. Allahın qəzavü qədərindən və ruzgarın gərdişindən o rəhmətlik öldürüldü. O səadət bürcünün xoşbəxtlik ulduzu batdı. Nadir şah onun kiçik qardaşı Pənahəli bəyi hüzuruna çağırıb, əlinə çomaq verdi, əynini qiymətli eşikağası xələtilə bəzədi və böyük qardaşının mənsəbini ona verdi. O, tapşırılan işləri bir neçə gün lazımi dərəcədə sədaqətlə yerinə yetirdi. Lakin Nadir şahın ona olan qorxunc baxışından və qərəzkarlıqla etdiyi rəftarından başa düşdü ki, o (şah) mütləq belə bir zirəkmaddə cavanın kökünü kəsməkdə səhlənkarlıq və belə bir igid şəxsin vücudunu aradan qaldırmaqda kahallıq etməyəcəkdir.

Həm də əlinə çomaq alaraq, qarşıda durmağı və yasavullarla həmsöhbət olmağı (özünə) ar bilib, qaçmağı qərara aldı. O, Qarabağa gəlib öz uca nəslinə mənsub bir neçə nəfəri özünə yoldaş etdi. Dövlətinin aləmi işıqlandıran günəşinin doğmasına müntəzir və riyasət gözəlinin vüsalına çatmağı aramsız gözləyərək gəzib-dolanırdı. Onun hünər və igidliyinin səsi, heybət və mətanətinin sədası bir dərəcədə xalqın ürəyinə lərzə, xas və avam camaatın canına qorxu salmışdı ki, əgər kaftar xasiyyətli düşmənləri onun şirtək heybətli, aslan kimi dəhşətli vücudunu yuxuda görsəydilər, gözləri dovşan kimi rahatlıq yuxusuna həsrət qalardı. Əgər, məsələn, Zal oğlu Rüstəm onunla hərb etmək məqsədilə hərəkət kəmərini belinə bağlasaydı, onun oxunun və qaniçən qılıncının zərbindən qalxan salardı.

Şeir

Nəqqaş onun surətini görüncə,
Rəsmlərini əlindən salardı.

Nadir şah Azərbaycan və Şirvan xanlarına qəzavü qədər kimi nüfuzlu olan qələmilə çoxlu hökmlər yazdı. Bu hökmləri sürətli çaparlar vasitəsilə göndərdi ki, Pənahəlini tutub onun hüzuruna göndərsinlər. Lakin o rəşadət səmasının qızıl quşunu tora salıb tutmaq

---

1 N a i b - burada xüsusi tapşınqları icra edən saray məmuru mənasında işlənmişdir.

2 Eşikağası – hökmdarın sarayını idarə edən nazir.

mümkün və müyəssər olmadı. O, gah Şirvan çəmənliklərində ovla, gah da Qarabağ ovlaqlarında şikarla məşğul idi. İşi gündən-günə tərəqqi edirdi. Bu qayda ilə güzəran etməkdə ikən, ittifaq belə düşdü ki, nifaqla dolu olan fələkin hərəkətləri nəticəsində, 1160-cı ilin cəmadiyəlaxır ayında[1] Nadir şahı Xorasan torpağında öldürdülər.

Bu xəbər hər tərəfə yayılıb camaatın dilinə, ağzına düşdü. Allahın himayəsinə sığınan mərhum Pənahəli bəy bundan sonra qızmış bir şirə və coşqun bir əjdəhaya döndü. Onun zərbə və hücumlarının şiddətli küləyi hər tərəfə əsdisə, düşmənin vücudunu çör-çöp kimi puç etdi. Qüvvət və əzəmətinin səsi, heybət və qüdrətinin sədası düşmənləri məğlub etdi. O kimə hücum edirdisə, qabağında dura bilməyib məhv olurdu. Cavanşir, Kəbirli, Otuziki və Gürcüstan ellərini Nadir şah Xorasana sürgün etmişdi. "Vətəni sevmək də imandandır" sözünün məzmununca, onlar vətən və yurdlarının eşq və arzusu ilə Xorasandan qayıdıb gəldilər. Bu vaxtadək Pənahəli bəyin güzəranı yuxarıda göstərildiyi kimi keçdi. Elat gəldikdən sonra o, gələnlərə yurd, mənzil və məskən mərhəmət etdi, onları mehribanlıq qanadı altına aldı və ehtiyaclarını təmin etdi.

Bu qayda ilə cəmiyyət quruldu və o öz istedadını göstərdi. Sonra bu səs tam ixtiyar və səlahiyyət sahibi sərdar Əmir Aslan xana yetişdi. O, Əliqulu şahın sərdarı idi. Əliqulu şah da, Nadir şahın qardaşı İbrahim xanın oğlu idi. Nadir şahdan sonra taxta oturmuş və Adil şah adilə sikkə və mənbərləri zinətləndirmişdi.

Əmir Aslan xan Pənahəli bəyi görmək arzusu ilə gəlib onunla görüşdü. Haman gecə Pənahəli bəyə sultanlıq[2] və sabahı gün xanlıq mərhəmət etdi. Adil şaha itaət etməyi ona təklif etdi. Pənahəli xan da razılıq verib, vaxtın məsləhəti üçün boyun qoydu. Əmir Aslan xan bunu Adil şaha xəbər verdi. Adil şah da Pənah xana xanlıq fərmanilə qiymətli xələt, cavahiratla bəzədilmiş xəncər və sair bir çox hədiyyələr göndərdi. Xanlıq rütbəsi mərhum Pənah xana Adil şah tərəfindən verilmişdir. Axırda Nadir şahın nəvəsi Şahrux Mirzə taxta oturub, Adil şahı öldürdü. Qaracadağ hakimi Kazım xan da Əmir Aslan sərdarı tutub həbs etdi.

1 Hicri 1160-cı ilin cəmadiyelaxır ayı 1747-ci il iyunun 10-da başlanmış, iyulun 8-də qurtarmışdır.

2 Sultan - XVIII esrdə rütbə etibarilə xanlardan aşağı olan feodallara verilən ləqəbdir.

## ÜÇÜNCÜ FƏSİL

## BAYAT QALASININ BİNA EDİLMƏSİNDƏN VƏ BAŞ VERƏN SAİR HADİSƏLƏRDƏN BƏHS EDİR

Mərhum Pənah xan xanlıq adı almağı çox arzu edir və həmişə o ali mənsəbə rəğbət bəsləyirdi. Ruzgarın dərzisi gecə-gündüzün gərdişi nəticəsində onun ləyaqətli vücudunu o qiymətli xələtlə bəzədi. Beləliklə, xan öz məqsədinə nail oldu. O, oturub öz-özünə düşündü ki, haldan-hala girən fələkin hərəkatına heç vaxt inanmaq, xoşbəxtliyə və dövlətin artmasına qətiyyən bel bağlamaq olmaz. Hər an dəyişməkdə olan fələkin qoca qurdunun hiyləgərliyindən, rəngdən-rəngə girən çarxın alçaqlığından qafil olmaq ağıllı və bilikli adamlara yaramaz. Bundan sonra çöllərdə vaxt keçirməklə istənilən məqsədə çatmaq olmaz. Yaxşısı və münasibi budur ki, möhkəm bir bina və qala tikilsin. Bir hadisə üz verdiyi zaman ora məskən, tənglik və bolluq vaxtında isə aman evi olsun; çünki şir nə qədər heybətli olsa da, ona bir hin lazımdır. Qızılquş quşların padşahıdır. Bütün quşlar onun çəngəli qarşısında acizdirlər. Lakin o da bir yuvada yerləşməlidir ki, bir hadisə üz verdiyi zaman bəla kəməndinin halqasından və düşmən əzabı duzağından asudə olsun.

Buna görə, gedib Bayatda 1161-ci ildə[1] bir qala, səngər, sığnaq və qərargah saldırdı. Sonra, palçıqları kin və həsəd suyu ilə yoğrulmuş olan Cavanşir və Otuziki əhalisinin ürəklərində ədavət alovu şölələndi və beyinlərinə kin havası hücum etdi. Onlar həmişə bu dövlətin yox olması uğrunda son dərəcədə səy və qeyrət edirdilər. Onlar Xəmsə[2] məliklərini də özlərinə həmməslək və müttəfiq etmişdilər. O zaman bütün Şirvanatda əbədi ixtiyar sahibi və hökmran olan Hacı Çələbiyə ərizələr yazdılar. Ona bildirdilər ki, Pənah xan burada taxta çıxmış, qala və səngər tikdirmişdir. Əgər dəfində bir qədər təxir edilsə, sonra onun qarşısında durmaq mümkün olmayacaqdır.

---

1 Hicri 1161-ci il 1748-ci il yanvarın 2-də başlanmış, noyabrın 22-də qurtarmışdır.

2 X ə m s ə - beş mahal deməkdir, bunların adları müəllif tərəfindən aşağıda çəkilir.

Şeir

Bir ağac ki, yeni dirçəlir, (o)
Bir adamın gücü ilə yerindən qopar.
Əgər onu bir zaman özbaşına buraxsan, (sonra)
Kotanla da onu kökündən qopara bilməzsən.

Hacı Çələbi də bu hiyləyə aldanıb fitnəkarlığa başladı. Dərbənd, Car və Balakənədək bütün Şirvanat qoşunu cəm etdi; bilmədi ki:

Şeir

Bir çırağı ki, Allah yandıra,
Onu kim söndürmək istəsə, saqqalı yanar.

Saysız əsgər və hesabsız qoşunla, tam bir calal və vəsfəgəlməz bir dəbdəbə ilə gəlib Bayat qalasını dörd bir tərəfdən mühasirəyə aldı.

Pənah xan da qabaqcadan bütün elata bu əhvalatı bildirmiş və hamısını yığıb səngərə dolduraraq sığnaq etmişdi. Hacı Çələbi gəldi və mühasirə ilə məşğul oldu. Hər gün mübahisə edir, didişib-döyüşməkdən əl çəkmirdilər. Axırda Hacı Çələbi məqsədinə çatmadan, külli zərərlə qayıtmaq təblini vurdurdu. O, yolda gedərkən dedi: "Pənah xan bu vaxtacan bir sikkəsiz gümüş idi, biz gəldik, ona sikkə vurduq və qayıtdıq". Bu söz xalqın dilində və camaatın ağzında bir məsəl olaraq qalmışdır.

Bundan sonra Pənah xan düşündü ki, mən təzəbinə bir adamam. Cavanşir və Otuziki elatı yağı, Xəmsə məlikləri də mənə düşməndirlər. Mən gərək möhkəm bir yerdə məskən və mənzil salam. Düşməni dəf etməkdə kahallıq və fəsad əhli ilə mübarizədə səhlənkarlıq etməyəm. Buna görə Bayat şəhərini dağıtdı və gəlib bir təpənin ətəyində, Şahbulaq adı ilə məşhur olan Tərnəkütdə bir qala bina etdi. Daş və əhəngdən məscidlər, evlər, çarsu və hamamlar tikdirdi. Bu işləri 1165-ci ildə[1] bitirərək oranı özünə məskən etdi.

O, Çiləbörd və Talış məlikləri[2] arasındakı çəkişmənin artmasına səy və qeyrət etdi. Günbəgün onların ittifaqını pərişan və bir-

1 Hicri 1165-ci il 1751-ci il noyabrın 20-də başlanrmş, 1752-ci il noyabrın 7-də qurtarmışdır.

2 Talış məlikləri, Talış kəndində yaşadıqları üçün bu adla adlanırdılar. Sonralar isə onlara Gülüstan məlikləri deyirdilər.

liklərinin (tifaqlarının) binasını viran etməklə məşğul oldu. Bu zaman, hökmranlıq gözəlinin xumarlı gözlərinə vurulan və məlikliyin gümüş baldırlı saqisi ilə qol-boyun olmaq fikrinə düşən Vərəndə məliki Məlik Şahnəzər, öz əmisi Məlik Hüsünü fəna piyaləsindən sərməst etdi (öldürdü). Məliklik sədası ilə cahana səs saldı və məliklik taxtında oturdu. Xəmsə məlikləri bu hadisəni eşitdikdə birləşərək Məlik Şahnəzərlə düşmənçilik etməyi qəti olaraq qərara aldılar. Onlar "sən nə üçün itaəti vacib olan əminə ağ olmusan" - deyib birlikdə onu cəzalandırmağa getdilər. Bu dörd məlik gəlincə, Məlik Şahnəzər də Çanaqçıda qala düzəldib, oraya çəkildi.

Xəmsə məlikləri gəlib bütün Vərəndə mahalını qarət etdilər. Qalanı almaqdan aciz qalaraq, məqsədlərinə çatmadan böyük peşmanlıqla geri qayıtdılar. Onlar (öz aralarında) belə əhd etdilər ki, bahar fəsli gəlib qalanı da alsınlar.

Məlik Şahnəzər özünü zəif və qol-qanadını sınmış gördü. O, gələcəyi gördüyündən, niyaz üzünü qul bəsləyən xanın kandarına sürtdü, itaət sırğasını qulağına asdı və xidmət kəmərini belinə bağladı. Xanın hüzurunda lazımi dərəcədə canfəşanlıq etdi və son dərəcə mehribanlıq göstərdi. İndiki Şuşa şəhərinin yerini mərhum xanın yadına salıb, ona tərif etdi. Sonra uca şanlı xanı gətirib bu yeri ona göstərdi. O da bu yeri bəyənmiş olduğundan, həmin şəhərin binasını qoyub orada məskən etdi. Bu qalanı və möhkəm binanı düzəldib ölkənin mərkəzi etdi. Meqri, Güney mahallarını Bərgüşada qədər Qaradağ hakiminin əlindən alıb özünə tabe etdi. Tatef və Sisyan mahallarını Naxçıvan hakimindən, Zəngəzur və Qapan mahallarını Təbriz bəylərbəyisindən aldı. Kolanıların məskəni olub, Uşacıq kəndindən Göyçə sərhədinə qədər uzanan Tərtər çayı sahilindəki yerləri İrəvan hakimindən aldı. Gəncə hakimlərinə aid və Xudafərin körpüsündən Kürək çayına qədər olan yerləri də öz əlinə keçirdi.

Bundan başqa, Naxçıvan elindən olub bir minbaşıya tabe Kəngərli eli, Gürcüstandakı Dəmirçi Həsənlilərdən olub, bayraq sahibi və bir minbaşıya tabe Dəmirçi Həsənli eli, yenə bir minbaşıdan asılı olan və Gürcüstanın məşhur elatından sayılan Cinni tayfası mərhum Pənah xanın ədalət, şövkət və təntənəsinin sədasını eşidərək öz xahişlərilə onun möhkəm bünövrəli, Allah vergisi olan dövlətinə pənah gətirdilər. Qarabağda yurd və məskən rutaraq böyük bir səda-

qət və son dərəcə səmimiyyətlə Pənah xana itaət etdilər. Gözəl sədaqət və qabiliyyətlərinə görə, uca mərtəbəli xandan son dərəcədə hörmət, izzət və mərhəmət gördülər.

Bunlar tərəfindən heç bir xəyanət tozu uca xasiyyətli xanın qəlbinin aynasına oturmamışdı. Hallarında qətiyyən üsyan əsəri görünməmişdi.

Qarabağ vilayətinin əsil elatı, kənd əhalisindən başqa, Cavanşir, Otuziki və Kəbirlilərdir. Kəbirlilər də tam bir səmimiyyət və tərifəgəlməz bir sədaqətlə behiştlik xana xidmət etmişlər.

Axırda Cavanşir və Otuziki ellərindən bəzən elə hallar baş verdi ki, böyük olan xanın ürəyində onlara qarşı şübhə oyandı.

Xəmsə adı ilə məşhur olan beş mahalın hər birinin ayrı adı vardır. Bu mahalların sayı beş olduğundan, onlara Xəmsə adı verirlər; çünki ərəb dilində beş ədədinə xəmsə deyirlər.

Bu mahalların biri - Dizaqdır. Məlikləri Məlik Yegan adlanır. O, Loridən qaçıb gəlmiş, Nadir şahın səltənəti dövründə və onun əmrilə məliklik taxtında oturub hörmət qazanmışdır.

İkincisi - Vərəndədir. Məlikləri Məlik Şahnəzərlilər olmuşdur. Onlardan daha qədim bir nəslə mənsub və daha çox etibar sahibidirlər. Əsilləri də Göyçə əsilzadələrindəndir. Sonra oradan qaçaraq gəlib Qarabağda Vərəndə mahalının məliklik camından sərxoş olmuşlar.

Üçüncü - Xaçındır. Məlikləri Həsən Cəlalyan övladıdır. (Onlar) riyasət gəlininə gözəllik verib, (hökmdar olmuşlar). Bu ailə məliklik mənsəbindən məhrum olduqdan sonra, bu mahalın müstəqil bir məliki olmamışdır. Buna görə, məliklik pərisi hər an bir şəxsin məclisinin saqisi olmuş və hər vaxt bir hərifi sərxoş etmişdir. Axırda, mərhum Pənah xan Cavanşirin dövlət günəşi və şövkət bayrağı riyasət üfüqündən baş vurub Qarabağ vilayətinin bütün sahəsini calal və dəbdəbə ilə işıqlandırdı. Bu zaman xınzırıstanlı Məlik Mirzə xan özünün gözəl iradə və sədaqətli əqidəsinə görə, bu əbədi dövlət məmurlarının əmrilə məliklik sikkəsini gümüş kimi saf olan adına kəsdirdi. Ondan sonra da oğlu Məlik Allahverdi və nəvəsi Məlik Qəhrəman "Hər kəsin növbəti beş gündür" misrasının məzmununca, məliklik bayrağını göylərə qaldırdılar.

Dördüncü - Çiləbörd mahalıdır. Məlikləri Məlik Allahquludur. Əsilləri Mağavizdən gəlmədir. Bunlar gəlib Çiləbörddə məlik olmuş, Tərtər çayının ortasında vaqe ən möhkəm bir məmləkətdə yerləş-

mişlər. Çox çətin bir yolu olan Cermux[1] qalasını özlərinə məskən, sığınaq və mənzil etmişlər. Çiləbördə müstəqil olaraq yiyələnmiş və böyük bir şöhrət qazanmışlar. Nadir şahla osmanlı sərəskəri Köprülü oğlu Abdullah paşa arasında olan müharibədə, Məlik Allahqulu çox şücaət və igidlik göstərdi. Nadir şah da məliklik xələtini onun qabiliyyətli vücuduna layiq görmədi, ona sultanlıq rütbəsi və xələti verdi. O (Nadir şah), əmr etdi ki, bundan sonra xas və avam camaat ona məlik deyil, sultan desin. Doğrudan da onlar dəbdəbəli qədim bir ocağa (ailəyə) mənsub imişlər.

Beşinci - Talış mahalıdır. Məlikləri Məlik Usubdur. Əsilləri Şirvandan gəlmədir. Bir müddət Talış kəndində sakin olmuşlar. Onlardan bir çoxu dəfələrlə məliklik etmişdi. Sonralar Məlik Usub Gülüstan qalasını zəbt edib orada sakin olmuşdu.

Mərhum Pənah xanın ilk hakimiyyət dövrlərində, Məlik Yegan övladından olan Dizaq məliki ona düşmən oldu və Allah vergisi olan o dövlətə qarşı üsyan etdi[2]. Uzun zaman müharibə oldu və qırğın alovu aralarında şöləndi. Axırda, Allahın tövfiqi və pərvərdigarın köməyilə, mərhum Pənah xan qalib gəlib o nəsildən bir neçə nəfərini öldürdü... Onların qol-qanadları sındı və pərişan oldular.

Vərəndə məliklərindən Məlik Şahnəzər nəcib və böyük bir ailəyə mənsub olub çox varlı idi. Fəsahətli barmaqlarımız ənbər saçan qələm vasitəsilə onun əhvalatını yuxarıda zikr və bəyan etdi. Mərhum Pənah xan və İbrahim xanın mehribanlıq nəzəri, hörmət və mərhəmət gözü həmişə Məlik Şahnəzər və oğlu Məlik Cəmşidin üstündə olmuşdur. Məlik Şahnəzərin bir qızı İbrahim xanın arvadı olduğundan, aralarında qohumluq da əmələ gəlmişdi. Lakin nəvəsi Məlik Ulubab Xaçında müxtəlif kəndlərdən və ayrı-ayrı qəsəbələrdən qoşun adı ilə dələduzları cəm etdi. Ballıqayanı səngər edərək mərhum Pənah xana qarşı üsyan qaldırdı. Behiştlik mərhum Pənah xan bu əhvalatı eşidincə, böyük bir sürət və əzəmətlə hərəkət etdi.

---

1 Cermux - Çiləbördün müxtəsər adıdır.

2 Pənah xanın üç Qarabağ məlikinə qarşı mübarizəsi, onun hakimiyyət uğrunda apardığı daxili feodal müharibəsi idi. Ən güclü hakim təkid və silah gücü ilə öz hakimiyyətini Qarabağ ərazisində olan kiçik hakimlərə tanıtmaq istəyirdi. Mübarizə aparan qüvvələrin qruplaşdırılmasına və Pənah xanın ona itaət etməyən məlikləri kənar edərək yerlərinə daha itaətkar olan qohumlarını təyin etməsi faktına diqqətlə baxdıqda, yuxarıda qeyd edilən xarakteristikanın doğru olduğunu təsdiq etmək olar.

O möhkəm səngəri və sığınağı nifaq əhlinin ittifaqı və ixtilaf əhlinin ürəyi kimi pozub dağıtdı... Bundan sonra, Xaçın əhli itaət halqasını qulaqlarına taxıb, sədaqət xələtini çiyinlərinə saldılar. İtaətin aman evinə qədəm qoyub bir daha düşmənçilikdən dəm vurmadılar.

Behiştlik mərhum Pənah xanın ilk hakimiyyəti dövrlərində, Ağoğlanda yaşayan Çiləbörd məliki Allahqulu sultan, onunla görüşmək üçün hüzuruna gəldi. Bu zaman Naxçıvan hakimi Heydərqulu xan da mərhum Pənah xana qonaq idi. O, Allahqulu xanın calal, şövkət və dəbdəbəsini gördükdə, Pənah xana xatırlatdı ki, belə bir sultan sənə itaət etməz və iki calal sahibi bir şəhərdə (ölkədə) yola getməz. Vaxtın məsləhəti budur ki, xəncərin susuz ağzı onun boğazının qanından su içsin. Ağoğlanın lalə rəngli güllərini onun gül rəngli qanı ilə boyasın və dünyanı onun nəzərində tar etsin. Mərhum Pənah xan Heydərqulu xanın məsləhətini tamamilə düzgün və etirazsız bir məsələ hesab edib Allahqulu sultanı öldürtdü. Qardaşı Məlik Hətəm, Çiləbördün məliklik mülkünə sahib oldu.

Talışlı Məlik Usub bu məlikin (Məlik Hətəmin) köməkliyilə öz əmisini öldürərək məliklik taxtına oturdu. Bunların hər ikisi ittifaq edib ziddiyyət və nifaq bayrağını qaldırdılar. Cermux qalasına[1] çəkilərək uzun müddət dava-döyüşdə kahıllıq etməyib qırğın və talandan əl çəkmədilər. Pənah xan da dəfələrlə hücum etdi və onlara bir çox tələfat verdi. Qalaları möhkəm olduğuna görə Pənah xan məqsədinə çatmadan geri qayıtdı. Lakin dağdan aşağı rast gəldiyi əkin məhsullarını zəbt və ordu atlarının ayaqları altında məhv etdi. Onları ağır bir vəziyyətdə qoydu. Onlar bu kimi ağır hallar qarşısında dörd il daha möhkəm və ruh yüksəkliyi ilə durdular. Bu müddət içərisində fitnə və fəsad yolu ilə gedərək inad və ədavət mülkünə hökmran oldular. Hər bir tərəfdən mərhum Pənah xanın əleyhinə döyüşə gələn xanların əsgərlərinə başçılıq etməkdə, qoşunlarının pişdarı olmaqda bir an süstlük və səhlənkarlıq etmirdilər.

Axırda, Pənah xan bunlara mübarizə meydanını o dərəcə təng etdi ki, qaçmağı qərara aldılar. Vətəndən ayrı düşməyi xoşbəxtlik sanıb öz elat və təbəələrilə hərəkət yükünü məğlubiyyət dəvəsinə yükləyərək Gəncə tərəfə getdilər, Şəmkir mahalında yeddi il çox zillət və son dərəcə çətinliklə dolandılar.

---

1 Çiləbörd qalası

DÖRDÜNCÜ FƏSİL

## ŞUŞA QALASININ BİNA OLUNMASI VƏ AĞA MƏHƏMMƏD ŞAHIN ATASI QACAR MƏHƏMMƏDHƏSƏN XANIN MƏRHUM PƏNAH XANLA MÜHARİBƏSİ HAQQINDADIR

Qarabağ vilayətinin ətrafı bir qədər asayiş tapıb Xəmsə məlikləri sakit olmağa başlayınca, baş qaldıran elatın bəzisi öz meyil və rəğbətlərilə, bəzisi də zorla mərhum Pənah xana itaət etdilər. Mərhum Pənah xan İranda olan qarışıqlığı[1] eşitdiyi zaman, onun işıqlı ürəyinin aynasına belə bir fikir əks etdi ki, Gəncə, Qarabağ, Ərdəbil və Naxçıvan hakimlərini öz hökmranlığı altına alsın.

Az bir zaman içərisində, bəzilərini qol gücü ilə, bəzilərini də elçilər göndərmək və cürbəcür mehribanlıqlarla itaətə gətirib, özünə tabe etdi. Sarıcalı Dərgah bəyi Ərdəbil şəhərində hökumət işlərini idarə etmək üçün təyin etdi. Gəncə xanzadələrinə qulluq vermək və onları qulluqdan çıxartmaq da Pənah xanın əmrilə olurdu. Bir qayda olaraq, adları çəkilən vilayətlərdəki xanların övladlarından bir neçə nəfəri həmişə Şahbulaq qalasında girov olaraq saxlanırdı. Bir müddət keçəndən sonra, Ağa Məhəmməd şahın atası Məhəmmədhəsən xan Qacar İraq, Azərbaycan və Mazandar hüdudlarında[2] istiqlaliyyət qazandı. Bu xəbər mərhum Pənah xana çatıncaya qədər yuxarıdakı qayda davam etdi.

Mərhum xanın hüzurunda olan əmirlər onun işarəsilə belə məsləhət gördülər: "Nadir şah öldürüləndən sonra, Əliqulu xan və Əmir Aslan sərdarla aramızda dostluq əlaqəsi və məhəbbət rabitəsi möhkəm idi. İndi ola bilər ki, Qacar Məhəmmədhəsən xan bizimlə pis rəftar etsin, bizə qarşı ədavət və düşmənçilik yolunu tutsun. Ətraf xanlarından da xatircəmlik yoxdur və bu dövlətlə ürəkdən düşmən olan çoxdur. Ola bilər ki, Məhəmmədhəsən xanı təhrik etsinlər və ona qoşulub bizimlə müharibəyə girişsinlər. Ola bilsin ki, Qaraba-

---

1 Nadir şahın ölümündən sonra şahlıq taxt-tacını iddia edənlər arasında gedən mübarizə nəticəsində İranda baş vermiş daxili qarışıqlıqlar nəzərdə tutulur.

2 Ehtimal ki, 50-ci illərin əvvəllərində, Məhəmmədhəsən xanın Cənubi Azərbaycan sahəsinin çox hissəsini ələ keçirib, özünün sonuncu güclü düşməni olan urmiyalı Azad xana qarşı mübarizə apardığı zamanda olmuşdur.

ğın rəiyyət və elatı düşmən qoşunu atlarının ayaqları altında məhv olsun, Şahbulaq qalasının müdafiəyə tab və taqəti olmasın. Belə olan surətdə "hər bir hadisənin çarəsi qabaqcadan düşünülməlidir" misrasmin məzmununca əqlə və vaxtın tələbinə münasib xətt-hərəkət budur ki, möhkəm bir yer və meydan tapıb orada şəhər və hasar binasını qoyaq, bürc və divar saldıraq. Düşmənin hücum və sədəməsindən arxayın olaq".

Yuxarıda işarə olunduğu kimi, Pənah xan Məlik Şahnəzərlə məsləhətləşdi. Onun məsləhəti və bələdçiliyilə Şuşa şəhərini bina etdi. Şəhərin bina olunacağı yerdə axar su və bulaq yox idi. İmtahan üçün bir neçə quyu qazdılar. O quyulardan su çıxandan sonra, 1170-ci ildə[1] Şuşa şəhərinin binasını qoydular.

---

1 Hicri 1170-ci tariximizin 1756-1757-ci ilinə mütabiqdir. Bu tarix bizdə şübhə oyadır. Ağdamda Pənah xanın qəbri üstündəki mərmər başdaşı kitabəsinin mətnindən göründüyü kimi, o, hicri 1172-ci ildə, yeni tariximizin 1758-1759-cu ilində vəfat etmişdir (başdaşı kitabəsinin üzü tarix elmləri namizədi Ə.Ələsgərzadə tərəfindən çıxarılmış və Pənah xanın ölüm tarixini də o oxumuşdur).

Əgər şəhərin əsası hicri 1170-ci ildə qoyulduğuna inansaq, onun əsasının Pənah xanın ölümündən iki il qabaq qoyulmuş olduğunu etiraf etməyimiz lazım gələcəkdir, bu isə Pənah xanın həyatından bizə məlum olan faktlara ziddir. Hicri 1170-ci il tarixi şübhə əmələ gətirdiyindən, biz "Qarabağnamə"nin digər nüsxələrinə: Azərbaycan SSR EA Mərkəzi kitabxanası Şərq şöbəsinin 1 nömrəli əlyazmasına, Azərbaycan SSR EA A.Bakıxanov adına Tarix İnstitutu elm arxivinin 1522 nömrəli əlyazmasına müraciət etdik və bu nüsxələrdə Şuşa qalasının bina edilməsi tarixinin hicri 1170-ci il qeyd edildiyini gördük. Lakin buna baxmayaraq, hicri 1170-ci ili Şuşa qalasının binası tarixi kimi qəbul etmək olmaz. "Qarabağnamə"nin mətnini öyrənərkən, Mirzə Adıgözəl bəyin hadisələr izahındakı ardıcıllığını qeyd etmək olar. O, uzun illər ərzində baş vermiş hadisələri təsvir edərkən, xronoloji ardıcıllığı heç bir yerdə pozmamışdır, bu da təqdirəlayiqdir. Əgər Mirzə Adıgözəl bəyin uzun illər ərzində baş vermiş hadisələrin təsvirində riayət etdiyi ardıcıllığı, Şuşa qalasının binası haqqında yazdığı səhifələrdə də davam etdirdiyini təsəvvür etsək, o zaman biz Şuşa qalasının əsası qoyulduğu vaxtı tamamilə düzgün təyin edə bilərik. Mirzə Adıgözəl bəy yazır ki, şəhərin əsası qoyulduqdan bir il sonra, Məhəmmədhəsən xan Qacarın qoşunları Qarabağa soxuldular. Qacarın qoşunları Qarabağda olan zaman Şuşa qalası var idi. Məhəmmədhəsən xan Qarabağda cəmisi bir aya qədər qalmış, sonra isə cənuba tərəf getmişdi. Bir az keçdikdən sonra Gəncə, Qarabağ, Qaradağ, Naxçıvan və İrəvan xanları şəkili Hacı Çələbi xana qarşı müharibə etmək niyyətilə Gəncənin yaxınlığında Gürcüstan padşahı II İrakli ilə görüşürlər, lakin II İrakli onları həbsə aldı. Bu salnaməyə görə, göstərilən hadisələr 1752-ci ilin mart ayında baş vermişdir.

Bütün yuxarıda deyilənlərə əsasən müəyyən etmək olar ki, Şuşa qalasının əsası ən geci 1751-ci ilin birinci iki ayı, yaxud 1750-ci ilin ikinci yarısında qoyulmuşdur. —>

Şahbulağında sakin olanları, bir para kənd əhalisilə köçürüb buraya gətirdilər. Hər bir şəxsə yurd və yer verib xalqı sakit etdilər. Sonra Pənah xan öz ailəsi üçün uca imarətlər və geniş binalar saldırdı. Hünərli ustalar, sənət sahibi və iş bilən memarlar barı, hasar, bürc və divar çəkdilər. O divarların asan bəzi yerlərdə indi də durur. Bu şəhərin bina edilməsindən bir il keçəndən sonra, Ağa Məhəmməd şahın atası Məhəmmədhəsən xan Qacar Astarabad, Mazandaran və Gilan vilayətlərindən daşların sayından çox və yağışın qətrələrindən artıq qan-içən qoşun topladı, Şuşa şəhərini almaq məqsədilə hərəkət etdi. Şuşa qalasına yaxınlaşıb Xatun arxında dayandı. O bir çox tədbirlər gördü və hiylələr işlətdi ki, bəlkə bu vasitə ilə Pənah xanı itaət toruna salıb Qarabağ ovlağının ovçusu olsun. Lakin şahin ovlayan o qızılquşu (Pənah xanı) hiylə toruna salıb əsir edə bilmədi. Xatun arxında səfər yükünü açdı (düşdü), çadırını qurdu və səngərlər qazdırdı. Qarabağın igidləri onun qoşununa çox zərər yetirirdilər. Azuqə gətirən adamlarını, qoşun əhlinin heyvan və mal-qarasını qarət edib aparırdılar.

Məhəmmədhəsən xan Qacar bu əsnada Kərim xan Zəndin tərəqqi və istila səsini eşitdi. Öz toplarını Xatun arxında qoyaraq qayıtmaq təblini çaldırdı və səfər bayrağını hərəkətə gətirdi. Mərhum Pənah xan o topları qalaya gətirtdi.

Qızılbaş qoşunu Şuşa şəhərini mühasirə etdiyi zaman, bu toplar uca olan Rusiya dövləti məmurlarının ixtiyarında idi. Lazım gəldiyi zaman onlardan istifadə edirdilər[1].

-» Bu tarixi daha düzgün təyin etmək məqsədilə biz Camal Cavanşir Qarabağinin 1855-ci ildə "Kavkaz" qəzetində A.Berjenin tərcüməsilə dərc edilmiş "Qarabağ" adlı əsərinə müraciət etdik. Burada da haman hicri 1170-ci ilin qeyd edildiyini gördük. Mirzə Camal yazır: "O (Pənah xan- V. L.), hicri 1170-ci ildə Şahbulağı və bəzi ətraf kəndlərin bütün əhalisini Şuşaya köçürtdü". Bu cümləni iki cürə başa düşmək olar: ya o zaman qala tikilib qurtarmış, ya da yenicə tikilməyə başlanmış, lakin bunu qəti olaraq demək mümkün deyil. Şuşa qalasının binasından qabaq və sonra baş vermiş hadisələrin tarixini müəyyən etmək məqsədilə son dövrlərə aid olan Rövzətüssəfayi Nasiri kimi mənbələrə də müraciət olundu, lakin heç bir müsbət nəticə əldə edilmədi. Bu əsərlərin elmi-tənqidi mətnləri olmadığından, onlar hadisəiəri aydınlaşdırmaq əvəzinə daha da dolaşıq salırlar.

Tarix elmləri namizədi T.İ.Ter-Qriqoryanın verdiyi məlumata görə, erməni müəllifləri, o cümlədən Raffı "Beş məliklik" və Barxudaryan "Artsax" adlı əsərlərində Şuşa qalası binasının tarixini Camal Cavanşir Qarabaği və Mirzə Adıgözəl beyin verdikləri məlumata əsasən təyin edirlər.

Beləliklə, hələlik, aparılmış tədqiqatla kifayətlənərək demək olar ki, Şuşanın əsası 1750-ci ilin ikinci yarısında, yaxud 1751-ci ilin əvvəllərində qoyulmuşdur.

1 Qarabağ xanlığı Rusiya ilə birləşdikdən sonra, İran qoşunları Şuşanı ilk dəfə 1806-cı ildə mühasirə etmişdilər.

BEŞİNCİ FƏSİL

## GÜRCÜSTAN VALİSİ İRAKLİ XANIN MƏRHUM PƏNAH XANI, QARADAĞLI KAZIM XANI, NAXÇIVANLI HEYDƏRQULU XANI VƏ GƏNCƏLİ ŞAHVERDİ XANI XAİNCƏSİNƏ TUTUB ƏSİR ETMƏSİ HAQQINDADIR[1]

Məhəmmədhəsən xan (Qarabağdan) qayıtdıqdan sonra, Pənah xan, qaradağlı Kazım xan, naxçıvanlı Heydərqulu xan və gəncəli Şahverdi xan məsləhət məclisi qurdular. Onlar belə bir qərara gəldilər ki, bütün Şirvan ölkəsinin hakimi; azad və həmişəlik sahibi-ixtiyarı olan Hacı Çələbi onlarla hesablaşmır və dostluq yolunu düzlüklə getmir. Buna görə lazımdır ki, onu məğrurluq yuxusundan oyatmaq üçün tədbir görsünlər. Sonra ürəklərinin sözünü məktub vasitəsilə Gürcüstan valisi İrakli xana bildirdilər. Vali də özünün bu işdə və bu yolda onlarla yoldaş olduğunu izhar etdi. Onlara yazıb bildirdi ki, tezliklə hərəkət edərək fürsəti itirmədən buraya gəlsinlər.

Bu xanlar da səfər tədarükü görüb, qoşun və əsgər topladılar. Hamısı ittifaq edib, hərəkət bayrağını qaldıraraq yola düşdülər. Gəncə şəhərindən yuxarı, Qızılqaya adlı yerdə dayandılar. Çadırlarının zərli qübbələri Ayla Günəşin fövqünə yüksəldi.

Yuxarıda adı çəkilən Gürcüstan valisi bunların dördünü də əsarət kəməndilə tutdu[2]. Şahverdi xanın nökərlərindən biri, iti yeriyən bir ata minib qaçdı. Bu zaman Hacı Çələbi də Şirvan qoşunlarının toplanması haqqında məktublar yazıb hədsiz tədarük və çoxlu qüvvə ilə gəldi. Mingəçevir keçidində düşərək hərbə müntəzir durdu. Bu əsnada qarşıdan bir atlı göründü. Hacı Çələbi əmr etdi ki, onu gəmi ilə Kür çayından keçirsinlər.

---

1 Həmin fəsildə təsvir edilmiş Hacı Çələbi xanla II İrakli arasında gedən daxili müharibələr, hər iki tərəfin dar feodal mənafeyindən doğurdu.

2 E.S.Takayşvili tərəfindən rus dilinə tərcümə edilmiş və "Описание событий" sərlövhəsi altında nəşr edilmiş adsız gürcü salnaməsinin verdiyi məlumata görə, bu hadisə 1752-ci il martın 21-də vaqe olmuşdur (Сборник материалов для описания местностей и алемен Кавказа, с. XXI, səh. 37, Tiflis capi).

(O, çaydan) keçib, Hacı Çələbinin hüzuruna gəlincə: "Qoca baba, vali xanları tutdu" - dedi.

Hacı Çələbi ona: "Qoca baban onları xilas edər, onları qurtarmaq üçün müharibə və davaya girişər" - deyə cavab verdi.

Sonra o öz dövlət ərkanı və yaxın adamları ilə məşvərət etdi. Onlar məsləhət görmək üçün bəhanə gətirdilər. Hacı Çələbi onların ürəyindəkini başa düşdü. Müşavirə məclisinə getdikləri zaman əmirlərə dedi: "Nə məsləhət görürsünüz (görün, ancaq) Kürü keçmək içində olsun".

Onlar bu sözü eşitcək geri qayıtdılar. Hacı Çələbinin hüzuruna gəlib dedilər: "Biz müşavirə yığıncağını ona görə düzəldirdik ki, işin içində Kürü keçmək (məsələsi) olmasın; indi ki, siz buyurursunuz, əmr verin, qoşun hərəkət etsin".

Bu zamandan Hacı Çələbinin sözü məsəl yerinə keçmişdir və indiyədək xas və avam camaatın ağzında söylənməkdədir.

Hacı Çələbi əmr etdi ki, ordu atlansın və təcili surətdə Kürdən keçsin. Onlar yol gedib mənzil keçdilər. Vali bu qəziyyəni eşitdi və bu hadisədən qorxuya düşdü; çünki o keçmişdə Hacı Çələbi qoşununun zərbəsini bir dəfə də görmüşdü[1]. Çarəsiz qalıb onu qarşıladı. İlahi feyzlər mühiti və hədsiz işıqlıq mənbəyi olan mərhum, rəhmətlik cənab Şeyx Nizaminin nurani qəbri və pak məzarı yaxınlığında iki ordu bir-birinə yaxınlaşdı. Aralarında qətl və qarət odu alovlandı. Gürcüstan qoşunu biabırcasına sındı. Vali öz ordusuna qayıtmağa fürsət tapa bilməyib qaçdı. Bütün çadırları və ləvazimatı, xanlar ilə birlikdə, yerbəyer Qızılqayada qaldı. Hacı Çələbi Sınıqdan üç ağac[2] yuxarıyadək irəliləyib onları təqib etdi. Tiflisin beş ağaclığına yetişdi. Qaçmaqda olan gürcü qoşununun qabağını Şəmkirdə, Şəmsəddinlidə və Qazaxda kəsib çox adam tələf etdi. Hacı Çələbi Baydar torpağında səngər qazdırdı. Oğlu Ağakişi bəyi Tiflisdən bəri yaşamaqda olan müsəlmanlara hakim və hökmran təyin etdi. Xanları da öz vətənlərinə göndərdi. Özü qayıdıb Şirvana

---

1 Teymuraz şah və İrakli padşahın qoşunları ilə Hacı Çələbi xanın qoşunları arasında 1751-ci ildə Car vilayətində baş vermiş vuruşma nəzərdə tutulur. Yuxarıda göstərilən adsız gürcü salnaməsi. В а х: Сборник материалов для описания местностей и алемен Кавказа, с. XXI, Tiflis. Müqayisə et: Butkov. Материалы новой истории Кавказа с 1722 по 1803 г., I h., səh. 238, SPb, 1869-cu il.

2 Ağac - 7 kilometrlik məsafə ölçüsü

gəldi. Ağakişi bəy isə, üç il o nahiyələrdə hakim oldu. Axırda vali Gürcüstandan, Başaçıqdan (İmeretiyadan) və hətta Çərkəzistandan çoxlu qoşun və dəniztək cuşa gələn saysız ordu topladı, Ağakişi bəyi dəf etməyə gəldi. Ağakişi bəy bu xəbəri və bu hadisəni eşidincə, qarşı dura bilməyəcəyini görüb qaçdı. Vali qoşununun qabaq dəstələri Tovuz çayında ona yetişdi. Müharibədə onun adamlarından bir neçə nəfər əsir düşdü. Özü isə sağ-salamat Şəkiyə gəldi. Valinin qoşunu oradan Xudafərin körpüsünə qədər getdi. Qayıtdıqları zaman Gəncə və Qarabağın bir çox yerlərini qarət etdilər.

## ALTINCI FƏSİL

### URMİYA HAKİMİ FƏTƏLİ XAN ƏFŞARIN QARABAĞ VİLAYƏTİ ÜSTÜNƏ GƏLMƏSİ, MÜHARİBƏ VƏ SÜLH, İBRAHİMXƏLİL AĞANI ALDADIB APARMASI VƏ MƏRHUM PƏNAH XANIN VƏFATI HAQQINDADIR

Urmiya hakimi Fətəli xan Əfşar, Nadir şahın etibarlı və igidlikdə ad çıxarmış sərkərdələrindən olub, onun çarxçı-başçısı idi. O bütün Azərbaycan vilayətlərini almış və onun zəfər bayrağının mahçəsi (ayparası) bu ölkəni işıqlandırmışdı. Fətəli xan bilirdi ki, Pənah xandan başqa bir kimsə onun dövlət və şövkətini pozub dağıda bilməz. Buna görə, onun ədavətini ürəyində gizli saxlayırdı. Zatının xəmirəsi ona (Pənah xana) qarşı bəslədiyi gizli ədavətin suyu ilə yoğrulmuşdu. O, mərhum xana qarşı hərb etmək məqsədi[1] ilə yeddi dəfə fitnə-fəsadı göylərə qaldırdı. Lakin hər dəfəsində məqsədinə çatmadan, külli tələfatla geri qayıtdı. Axırıncı dəfə ulduzlar qədər saysız qoşunla gəlib Ballıca çayı ilə Xacə Əlili çayı arasında olan geniş bir səhrada düşdü. Ümumi yol kənarında olan bu yerdə sən-

1 A.Bakıxanov bu xüsusda yazır: "Nadir şahın en mühüm əyanlarından biri olan və İran taxt-tacını iddia edən Fətəli xan Əfşar, hicri 1175 (1762)-ci ildə Azərbaycanı ələ keçirdi və qoşunla Qarabağa gəldi. Pənah xan ona zahiri itaət göstərdi və öz oğlu İbrahimxəlil ağanı onun yanında girov qoydu" (A.Бакиханов. Гюлистан-Ирам. Bakı, 1926, səh. 130).

gər düzəltdi. O səngərin asarı və barılarının divarı indi də durur. Xalq arasında "Fətəli xan səngəri" adı ilə məşhurdur. O, qış fəslini də burada keçirtdi.

Bu zaman Çiləbörd və Talış məlikləri - Məlik Hətəm və Məlik Usub da gəlib Fətəli xanın qoşunları ilə birləşdilər. Onların yanında bir səngər düzəltdilər. Bu səngərin də asarı və nişanəsi indiyə qədər durur. Altı ay burada oturdular. Fətəli xan arzusuna çatmaq məqsədi ilə hər gün canından keçib meydana atılırdı. Lakin peşmanlıq və zərərdən başqa bir şey əldə edə bilmirdi.

Axırda o, məliklərlə bərabər böyük bir qüvvə ilə hücuma keçdi. İgidlik meydanına şücaət qədəmi qoydu. Pənah xan da müharibə meydanında üzağardan və düşməni qırmaq üçün ürəkləri lalətək dağlı olan Qarabağ qoşunu ilə müdafiəyə girişdi.

Salari

Hər iki tərəfdən qoşunlar səf çəkdilər,
Bellərini bağlayıb hərbə girişdilər.
Nayın səsi və təblin gumbultusundan
Bu mavi səma lərzəyə gəldi.
Oxla, kamanla bir-birinə hücum etdilər.
O dava meydanında çox qanlar tökdülər.
O qovhaqov və o qaçaqaçda şirlərin hay-huyundan,
(Gav-ü-) mahi[1] hərəkətə gəldi, fələkin qulaqları kar oldu.

O döyüş meydanında ürəkli və qoçaq döyüşçülərin
Əlində ox kamana, kaman oxa döndü.
O çarpışmada atlıların qaldırdığı tozdan
Hava qır dəryası kimi qapqara qaraldı.
Oxun və yayın ildırım kimi parıltısından
Oxun yağış kimi yağmasından
Yer üzündən elə bir qan çayı axdı ki,
Torpaq məhşər meydanı kimi qıpqırmızı oldu.

Fətəli xan gördü ki, arzusunun gözəli varlıq aynasında görünmür. Cidd-cəhdinin ağacı zərər və peşmançılıqdan başqa bir səmərə vermir. Tədbirlər gördü, vasitəçilər saldı, saziş və barışıq binası

---

1 Öküz və balıq deməkdir. Qədim əfsanəyə görə, Yer öküzün buynuzları üzərində qərar tutur, öküz isə balığın arxasında durur.

qoydu. Ədavət və düşmənçiliyi aradan qaldırmaq istədi. Pənah xan da: "bacardığın zaman (müqəssiri) bağışla; çünki bu gözəl bir işdir" sözünün məzmununca, onun xahişini qəbul etdi. (Onlar) Ağa körpüsündə görüşərək sülh etdilər. Barışıq əhd və peymanla möhkəmləndi. (Fətəli xan mərhum) Pənah xana dedi: Bundan sonra dövlətlərimiz arasında ayrılıq və məmləkətlərimiz arasında düşmənçilik olmayacaqdır. Bunun əksini düşünmək ağlagəlməz bir xəyaldır. (İndi) sizdən dostcasına xahiş və ricamız budur ki, əgər mümkün olsa, uca xasiyyətli xanzadəni bir neçə günlüyə bizim çadırımıza qonaq göndərəsiniz. Bu bizə qarşı böyük qonaqpərvərlik və (bizdən ötrü də) son dərəcə başı ucalıq olar; çünki İbrahimxəlil ağanın məhəbbəti ürəyimizi kabab edib gözlərimizi yaşla doldurmuşdur. Bu vasitə ilə bir də onun ziyarətinə nail olarıq. Onu görüb ürəyimiz təsəlli tapar. Sonra onu böyük bir ehtiram və calalla hüzurunuza göndərərik.

Mərhum Pənah xan da onun qəliz andlarına və yalan sözlərinə etibar etdi. Gözünün işığı olan igid oğlunu bilikli və natiq adamlarla Fətəli xanın ordusuna göndərdi[1]. Bu xəbər Fətəli xana yetişincə, fərəh və şadlıq izhar etdi, övlad və əqrəbasından, əmir və sərkərdələrindən bir neçə nəfərini İbrahimxəlil ağanın istiqbalına göndərdi. (Xanzadə) sonsuz hörmət və hədsiz ehtiramla (Fətəli xanın ordugahına) yetişdi.

Bir neçə gün qaldıqdan sonra, o baxıb gördü ki, qayıtmağa izn ala bilmir. Hər gün bir xana, hər gecə bir əmirə qonaq olub, onların süfrəsi başında vaxt keçirməkdən bir şey çıxmır. (Buna görə) Pənah xana yazdı: "Belə məlum olur ki, Fətəli xan məni də özü ilə bərabər aparmaq fikrindədir. Mənim Qaladakı (Şuşadakı) kürən atımı təcili surətdə mənə göndərin. Bəlkə, yeriyən və səba yelitək mənzil kəsən o atın köməyinə qaça bilim".

At, Fətəli xanın ordusuna yetişincəyə qədər, Fətəli xan köçmək təblinin sədasını mavi göylərə yetirdi. İbrahimxəlil ağanı da özü ilə bərabər götürüb geri qayıtdı.

Bu dəhşətli xəbər Pənah xana yetişdi. O, gözünün işığı olan oğlunun ondan uzaqlaşdırıldığını gördü. Aydın dünya onun nəzə-

1 Başqa sözlə, Pənah xan sülh şərtlərinə görə, öz böyük oğlu İbrahimxəlil ağam Fətəli xan Əfşara girov verməyə məcbur oldu. Beləliklə, Pənah xan Fətəli xandan asılı olduğunu qəbul etdi.

rində tar oldu. Qulluğunda olan yaxın adamları ilə, igid və böyük oğlunun azad edilməsi üçün məsləhət məclisi qurub məşvərət çırağını yandırdı.

Fətəli xan atının cilovunu öz məmləkətinə çevirdikdən sonra, onunla Kərim xan Zəndin arası dəydi və düşmənçilik əmələ gəldi. Kərim xan dövlətli bir əmir idi. Fars ölkəsində calal atına minmiş və İraq tərəfində dəbdəbə badəsini içmişdi. Müstəqil və ixtiyar sahibi olmuşdu.

Kərim xan Zənd qardaşı İskəndər xanı böyük hazırlıq və təntənə ilə Fətəli xanın müharibəsinə göndərdi. İsfahan yaxınlığında iki qüvvə bir-birilə üz-üzə gəldi. Bu müharibədə İskəndər xan öldürüldü və qoşunu da məğlub oldu. Fətəli xan isə müharibədən qalib və müzəffər çıxdı. İraqın bəzi vilayətlərini zəbt edərək şövkət və calal bayrağını ucaltdı.

Kərim xan bu qəmgin hadisə və ürək yandıran qəziyyəni eşitdi. Qəzəb atəşi beyninə hücum etdi və intiqam almaq fikrinə düşdü. Hələ onun saysız-hesabsız qoşunu Azərbaycana girməmiş və zəfər nişanəli bayraqları o yerlərə əmin-amanlıq kölgəsi salmamışdı. O, Pənah xanın hüzuruna etibarlı elçi vasitəsilə məhəbbətlə dolu bir məkrub göndərdi. Məktubda lütf və mehribanlıq, birlik və həmrəylik izhar edirdi. Məkrubun məzmunu bundan ibarət idi:

"Fitnə və fəsad sahibi olan Fətəli xan indi bizimlə qan düşməni olmuşdur. Sizinlə də pis xasiyyətli bir düşməndir. Verdiyi söz və içdiyi andın əksinə olaraq hərəkət etmişdir. İbrahimxəlil ağanı apararaq, sizi dərd və qüssəyə salmışdır. Hər an bir fikirdə və hər gün də bir əmirlə hərb etməkdədir. Mən də "Ey ağıl sahibləri, sizin üçün qisas almaqda həyat vardır" ayəsinin məzmununa əsasən intiqam almağı və ədavət qılıncını qınından çəkib hərbə girişməyi qərara almışam. Buna görə cənabınızdan bir dost kimi xahiş edirəm ki, təcili surətdə durmadan və təxir etmədən, hökmünüz altında olan qalib qoşunlarınızla bizə yoldaşlıq edəsiniz; çünki, əsas məqsədim və günəş kimi işıqlı olan fikrim budur ki, həm sizin oğlunuzu xilas edim, həm də öz qardaşımın qanını alım".

Mərhum Pənah xan da belə bir fürsət axtarırdı və Fətəli xanın məhv olmasını Allahdan istəyirdi. O, saysız süvari dəstəsi və çoxlu qoşunla Kərim xanın köməyinə getdi. Azərbaycan torpağında Kərim xana yetişdi. Kərim xan da, ona qarşı lazımi hörmət və izzət şəraitini

yerinə yetirdi. Hər ikisi düşmənləri olan Fətəli xana qarşı ittifaq bağladılar. Köçmək təblini çalıb Urmiya ətrafına yaxınlaşdılar. Şəhərin ətrafında fələklər qədər əzəmətli olan çadırlarını qurdular.

Salari
Çadırların çoxluğundan yerin üzü
Cənnət bağçaları kimi rəngbərəng oldu.

Fətəli xan da özünün səhraları dolduran əsgərləri ilə müharibə meydanına hərəkət etdi. Bir az vuruşduqdan sonra qoşunu sındı və özü də Urmiya qalasına qaçdı. Qala mühasirəyə alındı. Bir neçə gün keçdikdən sonra Fətəli xan qalibiyyət pərisinin ondan bəxtinin ulduzu kimi üz döndərdiyini gördü. Dövlət günəşinin zavala yetişdiyini dərk etdi. İtaətdən başqa bir çarə tapmadı. Kərim xan vəkilin tərəfindən edilən vədlərə inamla tabe oldu[1].

Kərim xan vəkil, İranda müstəqil bir padşah olmadığından, özünə padşah vəkili adı vermiş və şahlıq adını qəbul etmək istəməmişdi. O, İbrahimxəlil ağanı hüzuruna gətirtdi. Ona qiymətli xələt, cavahiratla bəzədilmiş bir qılınc, qızıl yəhər və yaraqlı bir at bağışladı. Qarabağ vilayətinin xanlıq kağızını (fərmanının) ona verib qayıtmasına izn verdi. Sonra, Pənah xana təklif edib ondan xahiş etdi ki, bir neçə gün onunla birlikdə Şiraza səyahət etsin. Pənah xan da bu təklifi qəbul etdi.

Kərim xan Fətəli xanı da özü ilə bərabər götürüb mərhum Pənah xanla Darülelm[2] - Şiraza hərəkət etdi. Yolda, İsfahan yaxınlığında, Fətəli xanla Kərim xan Zəndin qardaşı İskəndər xanın hərb etdiyi mənzilə gəlib çatdılar.

Bu vaxta qədər Kərim xanın anası ona nə qədər yalvarıb xahiş edərdi ki, Fətəli xanı o dünyaya, qardaşı İskəndər xanın yanına göndərsin. Lakin Kərim xan etdiyi əhd və peymandan dönmək istəməyib anasının təklifini qəbul etməzdi.

Onlar bu mənzilə yetişdikdə, Kərim xan Fətəli xandan soruşdu: "Bu mənzili tanıyırsanmı, bu necə yerdir?"

---

1 A.Bakıxanov bu hadisələri hicri 1176-cı ilə aid edir. Bu il 1762-ci il iyulun 23-də başlamış, 1763-cü il iyulun 11-də qurtarmışdır (А.Бакиханов. Гюлистан-Ирам. Bakı, 1926, səh. 130).

2 Elm mərkəzi

Fətəli xan da çəkinmədən cavab verib dedi: "Bəli, bu haman hərb meydanı və qorxulu mənzildir ki, İskəndər xanın ömrünün günəşi burada batmışdır".

Kərim xan bu münasibətsiz cavabdan qəzəblənib, az qaldı ki, ödü partlasın. Dərhal Fətəli xanı axirətə, öz qardaşı İskəndər xanın yanına göndərdi.

Bir neçə gündən sonra onlar Şiraza gəldilər. Bir müddət keçəndən sonra mərhum Pənah xan öz əcəli ilə Allahın rəhmətinə getdi. Nəşini böyük hörmətlə gətirib Ağdamda pul ilə satın almış olduğu mülkündə dəfn etdilər. Allah ona rəhmət etsin.

Şeir

Dəyişən zəmanənin qanunu belədir:
Onun nə mehribanlığı həmişəlikdir, nə də qəhri.
Heç olmadı ki, bir adamı bəsləsin, axırda öldürməsin,
Çünki o, mehribanlıqda yumşaq, düşmənçilikdə isə kobuddur
(rəhmsizdir).

Salari

Ey saqi! Ey mənim köhnə dostum, gəl!
Ürəyimə yenə bir od düşdü...

## YEDDİNCİ FƏSİL

## MƏRHUM İBRAHİM XANIN QARABAĞ VİLAYƏTİNƏ HAKİM OLMASI, HÖKUMƏT TAXTINA OTURMASI VƏ XANLIĞI DÖVRÜNDƏ ƏMƏLƏ GƏLƏN HADİSƏLƏR HAQQINDADIR

Pənah xan ölüb, Allah-təalanın rəhmətinə getdikdən sonra, böyük və igid oğlu İbrahimxəlil xan 1173-cü ildə[1] Qarabağ vilayətinə hakim oldu. Xalqın işini nizama salmağa başladı. İran, Rum (Türkiyə) padşahlarına və sair ölkələrin hökmranlarına boyun əyməyərək, Qaradağ, Şəki, Şirvan, Gəncə, Təbriz, Naxçıvan, Ərdəbil, Xoy, Marağa,

1 Hicri 1173 (1759)-cü il avqustun 25-də başlanmış, 1760-cı il avqustun 12-də qurtarmışdır.

İrəvan və hətta İraqla Azərbaycan hüdudunda olan Qaplankuya qədər hökmran oldu. Bu vilayətlərin hakimlərini işdən götürmək və yenisini təyin etmək də onun hökm və fərmanı ilə icra edilirdi[1]. Bundan başqa o, Dağıstan ölkəsinin Avar vilayəti hakimi Nüsal xan oğlu Ümmə xanla da qohum olmuşdu. Onun hörmətli və əziz bacısı xanım Bikəağanı almışdı.

Lazım gəldiyi zaman, Dağıstanın müzəffər qoşunlarının köməyilə ətrafdakı düşmənləri məhv edir və üsyan edənlərə qalib gəlirdi. O öz qoşunu və zəfər nişanəli Dağıstan əsgərlərinin köməyilə Qaradağ mahalını aldı və Kürdəşt vilayətini... alt-üst etdi. Bu vilayətin divar, bürc və hasarlarının xarabaları indi də durur. Əhalisi qaçıb Əhərdə yerləşdi. Kürdəşt xanı Mustafa xan isə əsir düşdü. Qaradağ, Şahsevən və başqa tayfaların xanlarından bəzisi qohum olduqları üçün, bəzisi də zorla onun hökmünə tabe və fərmanına itaət etdilər. (İbrahim xan) bəzi vaxt ayrı-ayrı mahalları töhfə olaraq öz sərkərdələrinə bağışlayırdı ki, onlar bu yerlərin mədaxilindən mənfəətbərdar olsunlar.

Mərhum İbrahim xan padşah adlanmasa da, onun cah-calalı müasiri olan İran padşahlarından daha çox idi. Yuxarıda adları çəkilən vilayətlərin xanları və xanzadələri, həmişə gözəl xasiyyətli xan cənablarının hüzurunda girov olardılar. Bu hal Ağa Məhəmməd xanın Tehranda taxta oturmasına qədər davam etdi. Qacar Ağa Məhəmmədhəsən xanın oğlu Ağa Məhəmməd xan Şirazda girov idi. Kərim xan Zənd vəfat edəndən sonra[2], o, girovdan qaçdı. İraq səltənətini ələ keçirmək fikrinə düşdü. Fars ölkəsinin dövlət atına minmək istədi. İraq və Farsı aldı. Darülxilafə - Tehranı özünə paytaxt etdi. 1176-cı ildə[3] Azərbaycana daxil oldu. Araz çayının cənubunda olan vilayətləri alıb çayın bu tərəfinə keçdi. Talış və İrəvan vilayətlərini

1 Müəllif böyük mübaliğəyə yol verir. İbrahim xanın ancaq Qaradağ, Ərdəbil, Naxçıvan və Gəncə hakimləri üzərinə bəzən şiddətli təsiri olmuşdur. Şəki, Şirvan, Təbriz, Xoy, Marağa və İrəvan xanları heç bir vaxt İbrahim xandan asılı olmamışlar.

2 Kərim xan Zənd ) 779-cu ilin fevral ayında olmusdur (П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г., II hissə, səh. 70).

3 Müəllif yanılır, çünki hicri 1176-cı il tariximizin 1762-1763-cü ilinə mütabiqdir, lakin bu zaman vəkil Kərim xan Zənd hələ sağ idi. Ağa Məhəmməd xan Azərbaycanın cənub hissələrini ancaq 1791-ci ildə öz hakimiyyətinə tabe etmişdir (B a x: Rövzətüssəfa, Tehran, hicri 1270-ci il çapı, c. IX, səh. 96 (səhifələr bizim tərəfimizdən nömrələnmişdir). Müqayisə et: Nasixüttəvarix, Təbriz, hicri 1292-ci il, c. I, səh. 30, 31. Hər iki əsər fars dilindədir).

almaq üçün[1]: "Kim isə qapını döydü və mırıldandı" sözünün məzmununca, dəfələrlə hərb qapısını döydü. Lakin fəth qapısını açmaq ona mümkün olmadı.

O, mərhum İbrahim xana qabaqcadan xələt və qılınc göndərib onu öz tərəfinə çəkmək istədi. Lakin aralarında zahiri tanışlıq və mehribanlıqdan başqa bir şey yox idi.

Ağa Məhəmməd şah o ildə (1176-cı ildə)[2], Azərbaycandan qayıtdıqdan sonra, öz vücudunu padşahlıq libası ilə zinətləndirdi. Hökmranlığın kafuri şamını[3] səltənətin darayı çadırında yandırdı. Ruzgarın gərdişi və gecə-gündüzün törətməkdə olduğu hadisələr nəticəsində, Ağa Məhəmməd şahla mərhum İbrahim xanın arası pozuldu. Onların məhəbbət və ittifaq məclisində solğunluq əmələ gəldi.

Ağa Məhəmməd şah, Fars və Şiraz tərəflərində əmələ gələn qarışıqlıq və çal-çapa görə, bu tərəflərə fikir verə bilmədi. Atının cilovunu o tərəflərə çevirdi. O tərəflərin işini nizama salıb baş qaldıranların boynunu itaət ipinə bağladı. Sonra, 1209-cu ildə[4] çoxlu qoşun və saysız cəmiyyətlə Gürcüstan, İrəvan, Talış və Qarabağı almağa gəldi. Azərbaycanı dünyanı gəzən atlarının cövlangahı və mənzil kəsən bayraqları üzərindəki mahçənin (ayparanın) doğan yeri etdi. Ağa Məhəmməd şah qardaşı, baş sərkərdəsi və ehsan süfrəsinin duzu ilə bəslənən Əliqulu xanı, sair xanlar və çoxlu cəmiyyətlə İrəvanı almağa göndərdi. Özü isə İraq, Fars, Xorasan və Azərbaycanın ulduzlar kimi calallı və parlaq dəstələri ilə gəlib, Şuşa şəhərinin bir ağaclığında ordugah qurdu[5].

---

1 Bu hadisələr 1791-ci ildə baş vermişdir (B a x: П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г., II hissə, səh. 321). Müqayisə et: General-anşef Qudoviçin 1791-ci il noyabrın 7-də çara göndərdiyi raport (Кавказский сборник, c. XVIII, Tiflis, 1897, səh. 421).

2 Bu tarix təhrif edilmişdir. Yuxarıdakı qeydlərə bax.

3 Kafurdan qayrılmış saf və parlaq şam.

4 Hicri 1209-cu il, 1794-cü il iyulun 29-da başlanmış, 1795-ci il iyulun 17-də qurtarmışdır.

5 İran qoşunları Ağa Məhəmmed şahın başçılığı ilə 1795-ci ilin iyul və avqust aylarında, 33 gün Şuşa qalasını mühasirə etdilər (B a x: "Грамоты и другие исторические документы XVIII столетия, относящиеся до Грузии", c. II, h. II, 1769-cu ildən 1801-ci ilədək, sənəd 73, səh. 93, SPb, 1902. Müqayisə et: А.Бакиханов. Гюлистан-Ирам, səh. 143; Rövzətüssəfanın yuxarıda göstərilən çapı, c. IX, səh. 110).

Gürcüstan valisi İrakli xan, İrəvan hakimi Məhəmməd xan, Talış hakimi Mir Mustafa xan mərhum İbrahim xanla and içib müahidə bağladılar ki, Ağa Məhəmməd şaha itaət etməsinlər, mümkün olduğu qədər bir-birinə kömək və yardım etməkdə süstlük göstərməsinlər. Vaxtlı-vaxtında bir-birinin vəziyyətlərindən xəbər tutsunlar.

Sonra, mərhum İbrahim xan Qarabağ elatının bir parasını Gürcüstan səmtinə, bəzisini də şirvanlı Mustafa xanın yanına göndərdi. Mustafa xan onun tərəfindən təyin olunmuş xanlardan biri idi.

Alicənab mərhum İbrahim xan, (divanxanasının) dəftər və kitablarında qeyd edilmiş yerdə qalan elat və kəndlilərin bəzisini Qarabağ dağlarında yerləşdirdi, bir qismini də şəhərin içində öz yanında saxladı. Elat və kənd əhalisindən saysız atlılar cəm edib çoxlu tədarük gördü. Ağır toplar və qüvvətli qumbaralarla hərbə və döyüşə hazır oldu.

Ağa Məhəmməd şah otuz üç gün Şuşanı mühasirə etdi. Qalanın ətrafını əzəmətli qoşununa ordugah edərək, çadırlar qurdurub oturdu. O, elçi və məktublar göndərdi. Çalışdı ki, cürbəcür yollarla İbrahim xanı özünə tabe etsin və Qarabağ əhalisini itaətə gətirsin. Lakin mümkün olmadı.

Axırda, şirazlı Seyid Məhəmməd Ürfinin incə təbinin məhsulu olan qəsidələrdən bir beyti məqam və vaxta münasib bildi. Bu beytin bəzi sözlərini dəyişərək xanı qorxutmaq üçün yazıb göndərdi.

Şeir

Fələkin mancanaqindən fitnə daşı yağır,
Sən axmaqcasına Şişə içərisinə sığınmısan.

Bu məktub mərhum xana yetişən kimi, mübarək gözlərilə onu mütaliə etdi. Hüzuruna yaxın, qulluğunun nədimi, baş katibi və dövlətinin möhkəm bir sütunu olan qazaxlı Molla Pənah Vaqifi yanına çağırdı.

Vaqif kəmal, ədəb və elm sahibi bir sima idi. Əgər Çinin fəsahət səhrasının ahusu, onun səlis təbinin sümbülüstanında pərvəriş tapan qəzəllərin maralı ilə bərabərlik iddiası etsə, tamamilə səhvdir.

Əgər bəlağət Bədəxşanının ləli, onun sinəsinin xəzinəsində toplanmış parlaq beytlər və çox az tapılan qiymətli mirvarilər qarşısında xəcalətindən qızarsa, tamamilə düzgündür.

Salari

Şeir söylədiyi zaman ona söz ustası adı verirlər.
Ağıl onun qələmi ucunun zümzüməsindən bihuş olur.
Ahu kimi, onun qələmindən kağızın üstünə müşk damcılayır.
Davatının çeşməsindən kövsərin saf şərabı qaynayır.

Düzgün boy-buxun sahibi olan gözəllər onun fikrinin qarasını geyirlər.
Gözəllərin gözünə sürmə və zülfünə rəng verən (onun qələmidir).
Əgər onun təbinin gəlini cilvələnsə,
Qaş-göz atan gözəllərin ürəyini cəlb edər.
Onun incə və səlis təbinin cəld süvarisi,
Heyran qalan Sədidən fəsahət topunu qapmışdır.

Molla Pənah Vaqif o saat Ağa Məhəmməd şahın məktubunun dalına ənbər qoxulu qələmilə bu şeri yazıb göndərdi:

Əgər məni qoruyan, mənim bildiyimdir,
(O), şişəni daşın qoltuğunda mühafizə edər.

Ağa Məhəmməd şah məktubunun cavabını nəzərdən keçirdi.

Qəzəbinin buxarı başına vurub, ağlı başından çıxdı. Əmr etdi ki, od səpən toplar şərarələr saçmağa, ildırım yayan qumbaralar atəş yağdırmağa başlasınlar.

Bir müddət keçdikdən sonra, (Ağa Məhəmməd şah) gördü ki, Nəmrudun[1] odunu alovlandırıb kin atəşini qızdırdıqca, İbrahim xan Səməndər[2] kimi, bəlkə də İbrahimxəlil peyğəmbər kimi, odun şöləsindən qorxmur. O, işıqlanan külü və şölə çəkən odu, gül yarpağından başqa bir şey saymır.

Ağa Məhəmməd şah baxıb gördü ki, burada durduqca qalibiyyət gözəli yoxluq pərdəsi dalından çıxmır. Əsgərləri də Qarabağ qoşunlarının mərdanə hücumlarından və cəsarətli çarpışmalarından qorxuya düşürlər. Əgər bir neçə gün belə keçsə, qoşunu məğlub olar. Buna görə, dövlətinin əmirləri, məmləkətinin böyük adamları

---

1 N ə m r u d - Babilistan padşahlığının əsasını qoyan və Bibliya Avraamını (İbrahimxəlil peyğəmbəri) oda atan əfsanəvi bir simadır. Bu əfsanəyə görə, od Avraama heç bir zərər yetirməmişdir.

2 Səməndər- qədim əfsanələrə görə, odda yaşayan mövhumi bir heyvandır.

və vəzirləri ilə məşvərət etdi. (Axırda) məsləhət görüb dedi ki, zərərin yarısından qayıtmaq da mənfəətdir. Müsibətlə dolu olan bu təhlükəli yerdən at başı qaytarmaq nicat xəzinəsinin açarıdır. Yoxsa, çox çəkməz bütün qoşunumuz və heyvanlarımız bu dərin xunxarlıq dəryasında məhv olub gedər. Bizlərdən bir nəfər də olsun İrana salamat qayıtmaz.

Sonra, qayıtmaq bayrağını hərəkətə gətirdilər (yəni İran qoşunu geri çəkilməyə başladı)...

Ağa Məhəmməd şah... Gürcüstan tərəfinə getmək barəsində əmr verdi. Səhralar üzərində dalğalanan bayrağı ilə irəliyə doğru hərəkət etdi.

Mərhum İbrahim xan da itigedən çapar vasitəsilə Gürcüstan valisinə xəbər verdi ki, Ağa Məhəmməd şah Şuşa şəhərini almaqdan aciz qalıb, Darüssürura - Tiflisə hərəkət etmişdir. Lazımi tədarük və hazırlıq görsün. Onu dəf etməkdə vaxt itirməsin.

Vali bu xəbəri eşitcək, öz nəvəsi olan Başaçıq valisi Solomon xana və Gürcüstanı aralarında bölüşdürmüş olduğu övlad və nəvələrinə xəbər verib onlardan kömək istədi; çünki vali qoca və xəstə bir şəxs idi. Yaşı yetmişdən keçmişdi. Buna baxmayaraq düşməni dəf etmək üçün var qüvvəsilə çalışırdı.

Oğlanları arasında ziddiyyət və düşmənçilik olduğundan, Başaçıq valisi Solomon xandan başqa heç biri ona kömək etmədi. O, dörd min nəfər əsgər göndərdi. Vali şiddətli hökmlər yazdı, ötkəm və tələbkar yasavullar göndərdi. Lakin o hünərsizlər qoşun verməyib, çal-çağır və eyşi-işrətlə məşğul oldular. Vali çarəsiz qalıb o dörd min nəfər əsgər, öz adamları və Qazax mahalının müsəlman elatından yığdığı süvarilərlə, düşməni qarşılamaq üçün təcili surətdə yola düşdü. O bununla Ağa Məhəmməd şahın Gürcüstana girməsinə mane olmaq istəyirdi. Vali Qazax mahalına gəldi və İncə çayı kənarında düşdü. Burada, övladından kömək gələr deyə, bir qədər gözlədi. Lakin bir əsər görünmədi. (Digər tərəfdən də) Ağa Məhəmməd şah gəlib Gəncə vilayətinə daxil oldu. Vali çarəsiz qalıb geri qayıtdı. Ehtiyat üçün arvadı Deda[1]-Valonu çətin keçidli Tuşetə

1 D e d a - gürcücə "ana" deməkdir. II İraklinin ikinci arvadı çariça Dariya Georgiyevna nəzərdə tutulur.

göndərdi. Özü isə o az adamla Tiflisdə qaldı. Ağa Məhəmməd şah da irəliləyərək gəlib Soğanlıqda düşdü. Gecəni orada keçirib səhər Tiflisə yürüş etdi. Vali haman qoşunla, top və cəbbəxana ilə, indi Karantin adı ilə məşhur olan Qızrans suyuna yetişdi. İki qoşun bir-birinə yaxınlaşıb üz-üzə gəldilər. Çarxçılar meydana atıldılar və böyük bir müharibə oldu.

Ürəyi alovlu və əl-ayaqlarından od tökülən topçular çox cəldlik göstərib Qızılbaş qoşununu məəttəl qoydular. Təsadüfü olaraq bir hadisə üz verdi. Səhər vaxtı havanın saf aynasını duman elə bürüdü ki, göz görməkdən aciz qaldı. Qızılbaş qoşunu nabələd olduğundan dağ yuxarı yeridi. Elə ki duman dağümağa başladı və aləmin tutqun aynası işıqlandı, vali baxıb gördü ki, Qızılbaş qoşunu onların arxasına və şəhərin üst tərəfinə keçmişdir. Vali bu halı görüncə geri qayıtdı. Öz imarətinə girməyə fürsət tapmadı, bir atlı və bir qatırçı ilə Hallavar körpüsündən keçib Qaraqalxan dağlarına qaçdı.

Qızılbaş əsgərləri Tiflisə daxil oldular[1]. Darüssüruru (Tiflisi) matəm evinə döndərdilər. Əhalinin bəzisini qılıncdan keçirib, bəzisini də əsir etdilər. Hər pəriüzlü (gözəl) bir divmənzərə əsir və hər simbər (qadın) bir sitəmgərə dəstgir oldu. Hər laləüzlünün ürəyinə bir əzizin dağı çəkildi, hər gülüzlünün ağ sinəsi bir qönçə ağızlının qəmindən yaralandı və hər sərvi-xuramanın şəhla gözləri bir yasəmən üzlünün yasında qan ağladı.

Salari

Tərsinə dönən fələyin hiyləsindən əmin olma.
(Bu müharibədə iş belə düşdü ki), piyada (ən bacarıqlı)
süvariyə hücum etdi.
Onun hər bir tərəfini (altı tərəfini) o cür tutdular (dövrəyə aldılar) ki,
Acizlik girdabında mat qoydular.
(Hərbin nəticəsində) hamısı fil və tədbir sahibi oldular.
Yəhərli atlara yiyələndilər.

(Onlar) kilsələrdə olan qiymətli şeyləri qarət və sair imarətlərdəki malları çal-çap etdilər. Yeddi gün şəhərdə qaldılar. Ondan sonra bu uca imarətləri və geniş binaları zülm odu ilə yandırdılar. Şəhərin

---

1 Ağa Məhəmməd şahın qoşunları 1795-ci il sentyabrın 12-də Tiflisə girmişlər.

bürc və barılarını yıxdılar. (Sonra) qayıtmaq təblinin səsini göylərə çatdırdılar. Bu qışı Muğan qışlağında keçirdilər. Sonra Duşetdə olan vali yerdə qalan tavadları[1], öz övlad və nəvələrini yığıb müşavirə məclisi qurdu. Məsləhət mizrabını tədbir sazına vurdu. Bu sözləri onlara dedi: "Ruzgarın saqisi mənim ömrümün kasasını doldurmuş və həyatımın piyaləsi dodağıma yetişmişdir. Bundan sonra mənə layiq deyil və qəbul edə bilmərəm ki, Ağa Məhəmməd şahın itaət məclisində guşənişin olub qəm artıran əmrlərini eşidəm.

Salari

Bilirəm ki, məndə quru nəfəsdən başqa bir şey qalmamışdır.
Belə olan surətdə mən necə şad nəfəs ala bilərəm!

İncəlikləri dərk edən ağıl yanında, nicat qapısı qıfılının açarı budur ki, öz övladımın birini sizinlə Ağa Məhəmməd şahın hüzuruna göndərim, sülh və sazişdən ötrü girov verim".

Bu əsnada Ağa Məhəmməd şahın qayıtmaq xəbəri valiyə gəlib çatdı. Vali bu xəbərdən sonra, əhvalatı müfəssəl bir surətdə yazıb, imperatriçə Yekaterinanın hüzuruna göndərdi. İmperatriçə acizlərə kömək və zərərçəkənlərin dərdinə qalmaq məqsədilə cənab general-anşef qraf Valerian Zubova fərman verdi ki, saysız-hesabsız qoşunla valini himayə və Ağa Məhəmməd şahın şərrini dəf etməyə getsin.

O böyük cənab gəlib Dərbənd ətrafında düşdü[2]. Babüləbvab (Dərbənd) səhrasını müzəffər ordunun cövlangahı etdi. Zaqafqaziya vilayətlərini Qarabağ sərhədinədək aldı... Səlyanda qışlaq edib əyləşdi. Bu xəbər mərhum İbrahim xana çatdı. Oğlu Əbülfət xanı çoxlu hədiyyə və sovqatlarla böyük sərdar qraf Valerian Zubov cənablarının möhtərəm hüzurlarına göndərdi. Uca Rusiya dövlətinə ixlas və sədaqətini bildirdi. İmperatriçə Yekaterina həzrətlərinin müqərrəblərinə qaneedici və təvazö bildirən məktublar yazdı. İqtidar sahibi olan sərdar da Əbülfət xana qarşı hədsiz hörmət və mehribanlıq göstərdi.

---

1 Tavad - "gürcü knyazı" deməkdir.

2 Rusiya qoşunları qraf V.Zubovun komandanlığı altında 1796-cı il mayın 2-də Dərbəndin şimal tərəfinə yaxınlaşdılar.

Behiştlik, mərhum (İbrahim) xanın ərizəsini Dərbənd və Qızlar yolu ilə ixtiyar sahibi padşahın fələklər qədər yüksək olan dərgahına göndərdi. Mərhum Pənah xan üçün də, bir nəfər knyaz vasitəsilə çoxlu bəxşiş və töhfələr yolladı. Padşahın ona qarşı hədsiz lütf və mərhəməti olduğunu bildirdi. Mövlana Molla Pənah Vaqifə də qiymətli daşlarla bəzədilmiş bir əsa göndərdi.

Elə ki, ətrafda olan xanlar bu əhvalatı eşidib cənnətlik mərhum xanın Rusiya dövlətinə itaət etdiyini bildilər, onlar öz səfirləri vasitəsilə məktublar göndərib behiştlik xana xəbər verdilər: "Biz uca şanlı xanın itaət libasını çiynimizə alaraq bəndəlik halqasını qulağımıza asmışıq, həmişə onun sədaqətini özümüzə iftixar sərmayəsi bilmişik və tünd yel kimi gedən atının ayağının tozunu bəsirət gözümüzə sürmə etmişik. İndi o, uca Rusiya dövlətinə tabe olub itaət etmişdir. Biz də cənabınızın fikrinə müxalif deyilik".

Mərhum İbrahim xan o xanlardan: talış Mir Mustafa xan, şirvanlı Mustafa xan, gəncəli Cavad xanın və hətta İrəvan, Naxçıvan və Qaradağ hakimlərinin məktublarını da sərdarın hüzuruna göndərdi.

Gürcüstan valisi başqa xanlara nisbətən dəbdəbəli və qədim bir ocaqdan idi. Lakin yenə böyük və kiçik işlərdə mərhum İbrahim xanın məsləhət və məşvərətindən çıxmağa qüdrəti yox idi; çünki Avar hakimi Ümmə xan və sair Dağıstan əmirləri, qohumluq səbəbilə, cənnətlik xana tabe idilər...

Behiştlik xanın cah-calah, təntənə və dəbdəbəsi belə idi: Şəki, Şirvan, Gəncə, Qarabağ, İrəvan, Xoy, Talış, Naxçıvan, Təbriz, Şahsevən və Şəqaqi xanları onun hökmünə tabe idilər. Tiflis valisi də ehtiyatla hərəkət edərək, dostluq yolu ilə gedirdi. İstər-istəməz onun itaətinə hazır idi.

Bu zaman gözlənmədən ulduz dəstgahlı Rusiya padşahı vəfat etdi[1]. Buna görə uca mərtəbəli sərdarın Rusiyaya qayıtması haqqında fərman çıxdı. O da bu ali əmrə tabe olaraq, öz əsgərlərilə qayıdıb getdi. Mərhum İbrahim xan bu hadisəni eşidincə, Gürcüstan valisinə bildirdi; zəfər nişanəli Qarabağ və Dağıstan qoşunları ilə Gəncə tərəfinə hücum bayrağı qaldırıram. Siz də Gürcüstan qoşunlarını toplayın və bizimlə yoldaş olmaqda gecikməyin. O tərəfə hərəkət edin, əlbir olaraq Gəncəni alaq və onlara yaxşı bir qulaqburması verək...

---

1 II Yekaterina 1796-cı il noyabrın 6-da ölmüşdür.

Vali də tədarük görüb, qoşun yığdı. Onlar gəlib Gəncəni mühasirə edərək aldılar. Məlik Məcnun da o davada öldürüldü. Cavad xan tabe olduğunu bildirdi, öz qızını və oğlunu İbrahim xana girov verdi. Ona xidmət və itaət etməyi öhdəsinə aldı.

Ağa Məhəmməd şah hadisəsindən sonra, vali qətiyyən Darüssürura (Tiflisə) daxil olmayıb, Kaxetdə sakin olurdu. İki ildən sonra da vəfat etdi[1] və səltənət taxtını qəbir kərpicilə əvəz etdi.

Valinin vəliəhdi olan böyük oğlu Georgi xanı dualadılar. Onun qardaşları: Yulon xan, Parnaoz xan və Aleksandr Mirzə bu işə razı olmadılar[2], çünki bunlar bir anadan olmuşdular. Georgi xan isə başqa bir arvaddan dünyaya gəlmişdi. Hər biri bir tərəfdən üsyana başlayıb vali ilə ədavət və düşmənçilik etdi. O cümlədən Aleksandr Mirzə[3] Qazax, Borçalı və Şəmsəddinli mahallarına yiyələnib Georgi xana əhəmiyyət vermirdi. Yeni vali Georgi xan da çarəsiz qalıb adamlar göndərdi və məvaciblə Dağıstandan özü üçün kömək gətirtdi. Dağıstan qoşunu, Kaxet və gürcü alaylarının köməyilə Kəsəmən qışlağından keçdi, Qazax torpağına daxil oldu. Aleksandr Mirzə özünün gücsüz olduğunu hiss edərək qaçdı; Qarabağ vilayətinə gəldi[4]. Vali Qazax və Borçalının bir para fəsad törədən adam-

---

1 Gürcüstan padşahı II İrakli 1798-ci il yanvarın 11-də Kaxetiya padşahlığının keçmiş paytaxtı Telav şəhərində ölmüşdür (B a x : Н.Дубровин. "Георгай XII, последный чарь Грузии и присоединение ее к России", səh. I; 2-ci cap, SPb, 1897); bax yenə onun: "История войн и владычества русских на Кавказе", c. Ill, SPb, 1886, səh. 215.

2 Şahzadə Yulon, İrakli padşahın ikinci arvadı çariça Dariya Georgiyevnadan olmuş böyük oğlu idi. Təsvir edilən hadisələr zamanında onun yaşı 40-a yaxın idi.

Şahzadə Parnaoz çariça Dariya Georgiyevnanın altıncı oğlu idi. Təsvir edilən hadisələr zamanında bunun yaşı 26-ya yaxın idi.

Şahzadə Aleksandr çariça Dariya Georgiyevnanın beşinci oğlu idi. Təsvir edilən hadisələr zamanı onun yaşı 32-yə yaxın idi (B a x: "Грузинский царский дом", AKAK, c. I, sənəd 161, səh. 199).

3 Şahzadə Aleksandr 1801-ci il yanvarın 8-də Şəmsəddinliyə, yanvarın 11-də isə Qazaxa gəldi (şahzadə Aleksandrdan Tamaz Orbelianiyə 8 və 11 yanvar tarixli məktublar. AKAK, c. I, sənəd 163, səh. 203, 204). Müqayisə et: general-mayor Lazarevin general-leytenant Knorrinkə göndərdiyi 1801-ci il 20 və 24 yanvar tarixli, 47 və 55 nömrəli raportlar. AKAK, c. I, sənəd 314 və 315, səh. 283-284.

4 Şahzadə Aleksandr Qarabağda 1801-ci il mart ayının əvvəllərində olmuşdur (B a x: General-mayor Lazarevin general-leytenant Knorrinke göndərdiyi 1801-ci il 15 mart tarixli, 168 nömrəli raport. AKAK, c. I, sənəd 320, səh. 284-285).

larını cəzalandırdı. Haman qoşunlara əmr etdi ki, Qars vilayətinə soxulsunlar, bacardıqları qədər o şəhərin ətrafını çalıb-çapsınlar. Əmrə görə, zəfər nişanəli qoşunlar çapqın etdikdən sonra, valinin hüzuruna gəldilər. Oradan da köçüb Tiflisə daxil oldular. Aleksandr Mirzə Qarabağa qaçandan sonra, sair valizadələr də öz başlarını qorumağa çalışırdılar.

SƏKKİZİNCİ F Ə S İ L

## AĞA MƏHƏMMƏD ŞAHIN TƏKRAR QARABAĞ ÜSTÜNƏ YERİYİB ONU ALMASI, MƏRHUM İBRAHİM XANIN BALAKƏNƏ GETMƏSİ VƏ AĞA MƏHƏMMƏD ŞAHIN BAŞINA GƏLƏN SON HADİSƏ HAQQINDADIR

Ağa Məhəmməd şah, sərdarın qayıtması xəbərini eşidincə, yenə Qarabağ vilayətini almaq fikrinə düşdü. Bahar çağı[1] yağış qətrələri və ağac yarpaqlarının sayından artıq qoşunla Azərbaycan tərəfinə bayraq qaldırdı. Qarabağ vilayətində yerin-göyün bəla və müsibəti nəticəsində üç il taxıl bitmədi. Dənəli bitkilər gözəllərin müşk iyli xallarından da əziz tutulurdu.

Qızılbaş qoşunu Ağa Məhəmməd şahla bərabər Araz kənarına gəldi. Buna görə, Şuşa qalasında dayanıb, əldə olan qüvvə ilə qan-içən bir düşmənlə vuruşmaq mümkün deyildi. Uca mərtəbəli xan, əhli-əyal, övlad və nəvələrini, canlarından keçən bəylərin əhli-əyalını götürüb Car və Talaya hərəkət etdi. Mərhum İbrahim xanın kürəkəni Nəsir xan, Şahsevən Əta xan, mərhum xanın kürəkəni şəkili Səlim xan və Qarabağın sair məşhur bəyləri də behiştlik İbrahim xanla bir yerdə səfər etdilər.

Ağa Məhəmməd şah Araz kənarında bu xəbəri eşitdi, onların ardınca qoşun göndərdi ki, bəlkə gedib behiştlik xanı yaxın adamları və qəbiləsilə tutsun. Ağa Məhəmməd şahın əsgərləri Tərtər çayı körpüsü ətrafında onların köçünə rast gəldilər. Müharibəyə girişə-

1 1797-ci il. B a x: Н.Дубровин. "История войн и владычества русских на Кавказе", с. Ill, SPb, 1886, səh. 209.

rək zərərdən başqa bir şey əldə etmədilər. Mərhum İbrahim xan başında olan adamları ilə Kür çayından keçdi, sağ-salamat Car və Balakənə gəldi. Yolda ləzgilərdən bəzisi Ağa Məhəmməd şahın hökm və fərmanına görə, İbrahim xanın qabağını kəsərək, onu tutub Ağa Məhəmməd şahın yanına aparmaq istədilər. Az qalmışdı ki, hər iki tərəf müharibəyə girişsin. Mərhum xanın arvadı və Avar hakimi Ümmə xanın bacısı olan Bikə ağa onlara nəsihət edib, vuruşmalarına mane oldu. Bu əsnada qarabağlı Məhəmmədrəfi bəy, Ağa Məhəmməd şahın başını gətirdi. Onun öldürülməsi xəbərini Balakəndə uca şanlı behiştlik xana yetirdi. Bu hadisənin təfsilatı belədir:

Ağa Məhəmməd şahın Şuşa şəhərinə daxil olmasından bir həftə keçmişdi. Bir gecə yaxın adamlarından və nədimlərindən Səfərəli bəy və Abbas bəyə (gördükləri) əhəmiyyətsiz bir xətadan ötrü dedi: "Səhərçağı, fələkin qüdrətli padşahı - işıqlı günəş, cəsədsiz başını məşriqdən çıxardar. Fələkin mina rəngli ətəyini (üfüqü) gül təki qızardar. Mən də sizin başınızı - baxanlara ibrət olmaq üçün - alçaq olan vücudunuzdan bir cida boyu ayırram. Gül rəngli qanınızla Qarabağ gülzarını laləzara çevirrəm".

Onlar yəqin bilirdilər ki, Ağa Məhəmməd şah sözünü dəyişməz. Vasitəçilərin isti nəfəsi onun dəmir kimi olan soyuq ürəyinə təsir etməz. Çarəsiz qalıb haman gecə onun işini bitirmək fikrinə düşdülər. Səhərə yaxın Ağa Məhəmməd şah yuxunun bihuş edən piyaləsindən xumarlanmaqda idi. Onlar hərəmsaraya daxil oldular. Qan saçan xəncərlə onun cəsədini Davudun zirehitək deşik-deşik etdilər. Şahın qaş-daşla bəzədilmiş bazubənd, tac və həmailini götürüb özlərini Şəqaqi Sadıq xanın yanına yetirdilər. Əhvalatı olduğu kimi ona bildirdilər. Sadıq xan onların sözlərinə inanmadı və dediklərinə etimad etmədi; çünki o, öz barəsində şahdan xatircəm olmayıb həmişə qorxuda idi. Buna görə, onların sözlərini Ağa Məhəmməd şahın hiyləsi hesab etdi. Axırda qəliz andlar içib Sadıq xanı inandırdılar. Onu min qorxu və vahimə ilə İbrahim xanın oğlu mərhum Məhəmmədhəsən ağanın imarətində olan Ağa Məhəmməd şahın mənzilinə gətirdilər. Əvvəlcə Səfərəli bəy otağa girdi. Yorğanın ucunu şahın üstündən qaldırdı. Yenə od yağdıran xəncərilə onun sinəsindən qan çayları axıtdı. Sadıq xan bu halı görcək, tab və taqətdən düşdü. Dərhal bazubənd, tac və həmaili götürüb öz mənzilinə gəldi. Şəqaqi qoşunlarını yığıb Qaladan köçdükdə dedi: "Şah məni

İbrahim xanın ardınca göndərir". Şahın qatillərindən Abbas bəyi özü ilə bərabər apardı. Səfərəli bəy isə Qalada qaldı. Sadıq xan qaladan çıxandan iki saat sonra, şahın öldürülməsi xəbəri şəhərə yayıldı.

Qızılbaş xanları bu hadisədən qorxuya düşüb özlərini itirdilər. Hər biri öz adamları ilə dəstə-dəstə qaçıb dağıldılar. Şəhər əhalisi tam bir izdiham və ümumi bir hücumla şahın yaşadığı imarətə daxil oldu. Qızılbaş qoşunundan əsir düşənləri soyundurdular... Bu zaman, mərhum İbrahim xanın qardaşı oğlu Məhəmməd bəy imarətə daxil oldu. Şahlıq xəzinəsinə aid şeylərin yerdə qalanlarını zəbt etdi. Qızıl-gümüş qabları, alətləri və qiymətli cavahiratı mərhum Məhəmmədhəsən ağanın imarətindən öz sarayına göndərdi. Səltənət və riyasət işilə məşğul oldu. Ağa Məhəmməd şahın başını da Məhəmmədrəfi bəylə Balakənə göndərdi. Behiştlik İbrahim xan, Ağa Məhəmməd şahın təhlükəsindən asudə olunca, onun başını bir sovqat kimi Gürcüstan valisinə göndərdi. Bir neçə gündən sonra öz igid oğlu və vəliəhdi cənab Mehdiqulu ağanı Qarabağa göndərdi ki, əhalisini sakit edib şəhərdə asayiş bərpa etsin. Onun ardınca ən böyük oğlu Məhəmmədhəsən ağanı da Qarabağ tərəfinə göndərdi...

Bir neçə müddətdən sonra, behiştlik xan özü də Qarabağa gəldi və keçmişdə olduğu kimi, yenə hökumət taxtında oturdu...

## DOQQUZUNCU FƏSİL

## RUSİYA QOŞUNLARININ QAFQAZIN BU TƏRƏFİNƏ TƏKRAR GƏLMƏSİ VƏ ƏMƏLƏ GƏLƏN HADİSƏLƏR HAQQINDADIR

Georgi xan müstəqil vali oldu, valilik taxtı onun vücudu ilə zinət tapdı. İran padşahı Ağa Məhəmməd şah öldürüldü və Fətəli şah Qacar səltənət taxtına oturdu[1].

Vali bir tərəfdən Rumdan (Türkiyədən), digər tərəfdən İrandan və bir tərəfdən də Dağıstandan qorxuya düşdü. Qardaşlarının ədavə-

1 Artıq 1800-cü ilin əvvəllərində Fətəli şah taxt-tacında möhkəmlənmiş və ona düşmən olan bir çox xanları asdırmışdı. B a x: Xoylu Cəfərqulu xanın general-leytenant Knorrinkə yazdığı məkrub (AKAK, c. I, sənəd 961, səh. 675). B a x: Statski sovetnik Kovalenskinin Gürcüstan xatirələri (AKAK, c. I, sənəd 34, səh. 113).

tini də buna əlavə etmək lazımdır. (Buna görə) o, öz böyük oğlu pavud mirzəni[1] yalvarıcı ərizələr və səmimi məktublarla böyük iınperator, hörmətli şahənşah, bütün xalqların başının ağası, ulduz calallı, əzəmətli padşah Pavel Petroviçin uca dərgahına və işıqlı asitanəsinə göndərdi. Məktublarda deyilirdi: "Mən bu qədər xarici məzhəblər arasında tək qalmışam, hər saat birindən ehtiyat etməkdən cana gəlmişəm. Vəziyyətim hüzurunuza yaxın olan əmirlərinizə məlumdur. Başıma gələn hadisələr onların işıqlı qəlblərinin aynasına əks etmişdir. Ağa Məhəmməd şahın haqqımızda rəva gördüyü zülm, əziyyət və əmələ gətirdiyi fəsad və fənalığı ikidilli qələm təsvir etməkdən acizdir.

Aləmlər padşahı və dünya hökmdarından xahişimiz budur ki, millətimizin hörməti və dinimizi müdafiə etmək xatirəsi üçün, bizləri öz himayələri altına alsınlar. Aləmi bəzəyən bayraqları üzərindəki mahçənin (ayparanın) nurilə, pis xasiyyətli düşmənlərin zülmünün zülmətini üzərimizdən qaldırsınlar".

Sonra, Gürcüstanın seçilmiş, etimadlı və nəcib tavadlarından eşikağasıbaşı Kərsəvan bəyi, Davud mirzənin ardınca, fələk dəstgahlı padşahın dərgahına[2] yola saldı. Kərsəvan bəy keçmişdə aləmlər padşahının şərafətli asitanəsində olub, knyaz Çavçavadze adilə məşhur idi. Şir qeyrətli böyük imperatorun və kəramətli padşahın mərhəmət dəryası cuşa gəldi. General-mayor Lazarevi bir polk qoşunla göndərdi ki, gedib Gürcüstan hüdudunu var qüvvəsilə mühafizə etsin. Statski sovetnik (mülki müşavir) Kovalenskini də Gürcüstan valisinin yanında qalmaq üçün ministr (nazir) təyin etdi.

Yuxarıda adları çəkilən əmirlər Tiflisə gəlib valinin yanında qaldılar[3].

Bir ildən sonra Ümmə xan Dağıstandan iyirmi min qoşun götürüb gəldi. Ümmə xan belə düşünürdü: "Madam ki, vali rus qoşununa

---

1 Davud mirzə - David Georgiyeviç, padşah XII Georginin birinci arvadından olmuş böyük oğludur. B a x: "Gürcü padşahı xanədam" (AKAK, c. I, sənəd 161, səh. 200).

2 Rusiya imperatorları sarayı nəzərdə tutulur.

3 Rus ordusu polku general-mayor Lazarevin komandanlığı ilə 1799-cu il noyabrın 26-da Tiflisə daxil olmuşdur. Nazir Kovalenski həmin 1799-cu il noyabrın 8-də Tiflisə varid olmuşdur. B a x: Statski sovetnik Kovalenskinin general-leytenant Knorrinkə 1799-cu il 2 dekabrda yazdığı məktub. Tiflis (AKAK, c. I, h. II, sənəd 6, səh. 98).

pənah gətirmiş, deməli o, keçmiş məhəbbət və dostluq hüququnu ürəyindən çıxarmışdır. Mən də gedib rus (qoşunlarını) o vilayətdən çıxardar və keçmişdə olduğu kimi Darüssüruru (Tiflisi) xaraba qoyub talan edərəm".

Vali bu hadisəni eşitcək, həyəcana düşdü. Halı pərişan oldu. O, qorxudan boş xəyalata düşdü, çünki Ağa Məhəmməd şahın Tiflisə vurduğu zərərlərdən gözü qorxmuş və o ürəkyandıran hadisələrdən ödü yanlmışdı. Tiflis əhalisi də canlarını qorumaq istədiklərindən qaçmağı qərara aldılar. Hər biri bir tərəfə getmək istədi.

Yuxarıda adı çəkilən general hədsiz səy və qeyrət etdi. Darüssürur (Tiflis) əhalisini sakit etməyə çalışdı. Axırda şəhər əhalisi yenə onun sözünə baxmadılar; çünki onlar bu vaxta qədər rus qoşununun hünərini sınaqdan çıxarmamışdılar. General bu mətləbi başa düşdü. Bildi ki, onun nəsihətlərinin atəşi, Tiflis əhalisinin dəmirtək soyuq olan (ürəyinə) təsir etməz və qorxuducu vədlərinin damcıları, o camaatın daş bağrını dəlməz. Car çəkdirib Gürcüstan əhalisinə mərdanəliklə bildirdi ki, siz şəhərdən qaçmayın, nahaq yerə vətəninizi tərk etməyin. Mən Rusiyanın xoşbəxt qoşunları ilə hərəkət edib, onların qarşısına gedirəm. Əgər qalib gəldim heç, istədiyimiz də odur. Əgər, Allah eləməmiş, məğlub olsam və düşmənin qarşısından qayıdıb qaçsam, ondan sonra siz də qaçın və istədiyiniz yerə gedin.

Gürcüstan əhalisi bu sözləri eşidib sakit oldu və könüllərinin hürküyə düşən quşları aram tapdı. Bundan sonra adı çəkilən general, öz qalib qoşunlarını götürüb Ümmə xanın qabağına getdi. Suqracu (?) kəndinin altında, Qıbır çayının üstündə, axşamçağı, iki qan içən ordu və iki əzəmətli dəstə bir-birinə yaxınlaşdı. Dağıstan qoşunu baxıb gördü ki, Rusiya qoşunu olduqca azdır. Çox təəccüb etdilər, ürəklərində heyrət əmələ gəldi (və öz-özlərinə dedilər): onlar bu az cəmiyyətlə hərbə və döyüşə necə cürət edirlər? Taxta ayaqları[1] ilə bu çətin keçidli məmləkətdən necə keçərlər?

Sonra hər iki tərəf haman yerdə yüklərini açıb düşdülər və çadırlarının mıxını yerin qəlbinə möhkəm vurdular.

Ləzgi sərkərdələrinin bəzisi bu cür məsləhət gördülər ki, axşamın xeyrindən sabahın şəri yaxşıdır. Ümmə xan və bəzi sərkərdələr isə dedilər:

---

1 Çar soldatları ağır çəkmələr geydikləri üçün, ləzgilər onlara taxtaayaq demişlər.

Beyt

Allahdan başqa kim bilər ki,
Sabah ruzgar başımıza nə oyun açacaqdır.

- Məsləhət budur ki, bu andan vuruşma məclisinə rövnəq verək, dava və döyüş meydanının zinətini artıraq, top və tüfəng sədası ilə dünyaya vəlvələ salaq. Parlaq qılıncın piyaləsindən bu zalımlara ölüm şərbəti içirək.

Bundan sonra Ümmə xan öz qoşununun yarısma əmr etdi ki, generalın ordusunu dörd bir tərəfdən əhatə edib üzük qaşı kimi mühasirəyə alsınlar və hamısını əsir etsinlər.

Dağıstan qoşunları öz komandanlarının fərmanını həyata keçirməyə səy etdilər[1]. Onlar rus qoşunlarına yaxınlaşınca, general (Lazarev) o saat əmr etdi ki, əjdaha heybətli, od yağdıran topları fitilləsinlər və zəfərnişan soldatlar "hurra" çəkib hücuma keçsinlər. Dağıstan ordusu baxıb gördü ki, top atəşi aləmi od dəryasına çevirdi. Rus qoşunlarının üst-başları bunların qanından qıpqırmızı oldu. Qarşı durmağa taqətləri qalmadı. Davam gətirməyib qaçmağa üz qoydular. Hədsiz zərər çəkdilər. Ölənlərin sayı-hesabı yox idi. Qılınc ağzından canını qurtaranlar qaçdılar və çox çətinliklə özlərini qalan qoşuna yetirdilər. Başlarına gələn əhvalatı olduğu kimi danışdılar. Onlar bu hadisəni eşidib, son dərəcə pərişan oldular və qorxuya düşüb dedilər:

Salari

Biz də namus üçün, ad qazanmaq üçün
Ədavət qılıncını qınından çəkərik.
Bu döyüş meydanında at qovar,
Oxla, nizə ilə və iti qılıncla
Nəhəng kimi, qan dəryasına baş vurarıq,

---

1 General-mayor Lazarevin və şahzadə İoannın komandası altında olan rus və gürcü qoşunları ilə avarlı Ümmə xanın (Ömər xanım) və şahzadə Aleksandrın başçılığı altındakı Dağıstan qoşunları arasında vuraşma İora çayının kənarında, Kakabetu kəndinin yaxınlığında 1800-cü il noyabrın 7-də baş vermişdir. General Lazarevin verdiyi xəbərə görə, dağıstanlılar çoxlu tələfat vermiş və təkcə ölənlərin sayı 2 minə qədər olmuşdur. Ruslardan və gürcülərdən isə 13 nəfər ölmüşdür. B a x: General-mayor Lazarevin general-leytenant Knorrinkə göndərdiyi 1800-cü il 8 və 14 noyabr tarixli 67 və 68 nömrəli raportlar (AKAK, c. I, sənəd 109 və 111, səh. 168, 170-175).

Onlara dava meydanını təng edərik
Əgər biz mərdliklə ad çıxarmasaq
Qoy başımızdakı bu papaq bizə haram olsun.

General fərəh verən bu hadisəni görüncə, istirahət təbilini vurdurdu. Ondan sonra, zəfər nişanəli qoşununu götürüb özünü onların sığınağına yetirdi. Mərdanə həmlələr və igidcəsinə hücumlarla düşmən qoşununu dağıtdı. Ümmə xan və sair sərkərdələr artıq səy və qeyrət göstərdilər. Çalışdılar ki, bəlkə hiylə ilə öz vəhşi əsgərlərini qaçmaqdan saxlasınlar. Bir daha müharibəyə girişsinlər. Lakin mümkün olmadı. Çünki ləzgi əsgərləri rus qoşununun birinci öd yaran zərbəsindən qorxmuşdular.

Gündüz pərisinin işıqlı üzü, Ümmə xanın taleyi kimi, qaralmağa başlayınca, ləzgilər üzüqaralıq etdilər. Hərəkət kəcavəsini fərar dəvəsinə yükləyib qaçdılar. Gəncə torpağınacan, tərsinə əsən yel kimi heç bir yerdə bənd olmadılar və heç bir mənzildə durmadılar. Fikirləri bu idi ki, oradan keçib Qarabağa gəlsinlər. Qışı burada keçirib bahar fəsli öz vətənlərinə qayıtsınlar. Dağlar qar olduğundan, bu fikri həyata keçirmək mümkün olmadı. Gəncə əhli bu əhvalatdan xəbərdar oldu. O az camaatın üstünə tökülüb[1] rəhmsizcəsinə qılıncdan keçirdilər. Ləzgilər daha heç bir yerə sığına bilmədilər. Yüz min müsibətlə Cara qaçdılar. (Oranı) özlərinə qışlaq edib oturdular[2]. İttifaq belə düşdü ki, Ümmə xan orada naxoşlayıb dünyadan getdi[3]. Nəşini orada dəfn etdilər. Onun matəmində ləzgilərin ürəyi yenə qana döndü.

---

1 General-mayor Lazarevin general-leytenant Knorrinkə göndərdiyi 1800-cü il 4 dekabr tarixli raportunda deyilir: "Ümmə xanın Samux torpaqlarına getmiş qoşunlarının bəzi dəstələri qənimət ələ keçirmək üçün gəncəli Cavad xanın mülklərinə basqın etdilər. Xan isə bu basqından xəbər tutaraq onların qabağına qoşun göndərdi". (B a x: AKAK, c. I, sənəd 127, səh. 183).

2 General-mayor Lazarev general-leytenant Knorrinke göndərdiyi 1800-ci il 21 dekabr tarixli raportunda belə yazır: "Gizlicə Cara göndərdiyim adam xəbər gətirdi ki, Ömər xan həqiqətən də oraya gəlmiş və qarlı dağları keçmək mümkün olmadığından, qışı Balakəndə qalmaq niyyətindədir; yanında qoşunu yoxdur, adamları dağılıb öz evlərinə getmişlər" (AKAK, c. I, sənəd 132, səh. 187). Müqayisə et: Cavad xanın general-mayor Lazarevə göndərdiyi məktub (AKAK, c. I, sənəd 812, səh. 606).

3 Avarlı Ömər xan 1801-ci il martın 10-da Balakəndə ölmüşdür. B a x: General-mayor Lazarevin general-leytenant Knorrinke göndərdiyi 1801-ci il 16 mart tarixli 174 nömrəli raport (AKAK, c. I, sənəd 424, səh. 332).

General (Lazarev) dərhal adamlar yolladı. Bu xəbəri Gürcüstana yetirdi. Lakin, kimsə buna inanmadı. Hətta o, öldürülənlərdən bir neçəsinin başını da göndərdi. Yenə heç kəs xatircəm olmadı.

O zaman, mən özüm də Darüssürurda (Tiflisdə) idim. Cənab general bir neçə gündən sonra böyük izzət, ehtiram, son dərəcə dəbdəbə və calalla Gürcüstana daxil oldu. Tiflis əhalisi çox şadlıqlar etdi. Rusiya qoşununun igidliyinə və o müzəffər əsgərlərin rəşadətinə Gürcüstan əhalisinin və sair şəxslərin etiqadı çox-çox artdı[1], çünki (bu hadisə) çox az ittifaq düşən, çətin və müşkül bir iş idi.

Bundan sonra, generalın hörməti, qoşununun hünəri və şöhrəti dilə-ağıza düşdü. Doğrudan da, generalın vəsfə gəlməyən bu igidliyi bütün Qafqaza yayıldı. Onun bu qəhrəmanlığını qələmin dili təsvir etməkən acizdir.

Bu hadisədən sonra, vali bir il də yaşadı. O, qış fəslində vəfat etdi[2]. Qardaşları təcili surətdə hazırlıq görərək, Kartliyadan çoxlu qoşun və camaat toplayıb, Tiflis üzərinə gəldilər. Onlar böyük qardaşları Yulon Mirzəni vali, yuxarı və aşağı təbəqəyə hakim təyin etmək istədilər. Tiflisin üstündə olan Habucala kəndinə gəldilər və orada durdular. General, komandası altında olan zəfər nişanəli əsgərləri götürüb onların qabağına getdi. Onları Başaçığacan qovdu. Qayıdıb gələndən sonra, valinin böyük oğlu Davud Mirzəni müvəqqəti olaraq vali qoydu[3]. Bahara qədər bu qayda ilə keçdi. Qızıl taclı işıqlı Günəş Həməl bürcünə[4] daxil olub, öz yaz mənzilinə yetişdi. Bu zaman, torpağın tumurcuq məməli qızları olan bitkilər dirçəlib,

---

1 Fətəli şah avarlı Ümmə xan üzərində çalınmış qələbədən xəbərdar olan kimi, Gürcüstana qoşun dəstələri göndərmək niyyətindən vaz keçdi. B a x: General-leytenant Knorrinkin çara göndərdiyi 1801-ci il 8 fevral tarixli raport (AKAK, c. I, sənəd 969, səh. 683).

2 Gürcüstan padşahı XII Georgi 1800-cü il dekabrın 28-də ölmüşdür. B a x: General-mayor Lazarevin general-leytenant Knorrinkə göndərdiyi 1800-cü il 28 dekabr tarixli 93 nömrəli raport (AKAK, c. I, sənəd 137, səh. 188).

3 Mirzə Adıgözəl bəy bu xüsusda yanılır. Çünki şahzadə David Georgiyeviç rəsmi surətdə Gürcüstan padşahı və ya hakimi təyin edilməmişdi. B a x: Çarın general-leytenant Knorrinkin adına göndərdiyi 1801-ci il 20 yanvar tarixli fərmanı (AKAK, c I, sənəd 520, səh. 413). B a x: General-leytenant Knorrinkin cara göndərdiyi 1801-ci il 1 fevral tarixli raport (AKAK, c. I, sənəd 407, səh. 319-323). Müqayisə et: şahzadə Davidin katolikos Antoniyə göndərdiyi 1801-ci il 7 fevral tarixli məktub. Burada Şahzadə David özünü Gürcüstanın hakimi adlandırır (AKAK, c. I, sənəd 408, səh. 323).

4 Həməl bürcü mart ayına mütabiqdir.

böyüyərək güllükdə görünməyə başladılar. Bülbüllər ağaclıqlarda və bağlarda qönçə ətrafına hərlənərək ağır-ağır "qələbə çalındı" nəğməsini oxudular. Qumrular da fərəh və şadlıqlarından "müxəmməs" havasında zəngulə vurdular. Sübhün xəfif küləyinin məşşatəsi[1] gözəl və qəşəng çiçəklərə təravət verir, gül qönçələri üzərinə sənət kirşanı və qüdrət ənliyi çəkirdi. Bu zaman Liniyada yaşayan və inspektor mənsəbində olan piyada qoşun generalı Knorrink Tiflisə gəldi[2]. O, burada öz divanxanasını qurdu. Tavadzadələrdən dörd nəfərini seçib dövlətin dörd əsas rüknü, divanbəyi təyin etdi[3]. General Knorrinkin göstərişilə hökumətin mühüm işlərinə və bürün vacibli ərizələrə orada (dördlər məclisində) baxılmalı idi. Özü isə yuxarıda adı çəkilən generalın göstərişilə geri qayıtdı. Bir il bu qayda ilə keçdi. Sonra knyaz Sisianov Qafqazın bu tərəfində olan vilayətlərə (Zaqafqaziyaya) sərdar təyin edildi[4]. O, bu yerləri idarə etmək işində geniş ixtiyar sahibi oldu.

Knyaz Sisianov özü ilə lazım olan vəsaiti gətirib, Tiflisdə quberniya əsasını qoydu və divanxanalar təsis etdi. Bu zaman valizadələrin hamısı Gürcüstanda idilər. Onlar bu işlərə razı olmayıb keçmiş nizam və qaydaları tələb edirdilər. Onlar puç və lüzumsuz xəyalata düşmüşdülər. Knyaz Sisianov xeyirxahlıq üzündən onlara gözəl nəsihətlər etdi. Lakin onlar qəbul etməyib öz fikirlərindən dönmədilər.

Axırda knyaz baxıb gördü ki, çarə yoxdur və onların könüllərinin qönçəsi nəsihət nəfəsilə açılmır. Onların hamısını zorla Rusiyaya göndərdi[5]. O cümlədən, valinin arvadı Deda-Valonu da göndərməli idilər... Lakin o getmək istəmədi və knyazın sözünə

---

1 M ə ş ş a t e – gəlinə bəzək verən xüsusi qadınlara deyilir.

2 General-leytenant Knorrink Qafqaz Liniyasından Tiflisə 1801-ci ilin may ayında gəlmişdir. B a x: General-mayor Lazarev tərəfindən general-leytenant Knorrinke verilən müxtəlif suallar və onun cavabları (AKAK, c. I, sənəd 537, səh. 420).

3 1801-ci ilin iyun ayında gürcü hökuməti yaranmışdı ki, bunun da heyətinə dörd divanbəyi daxil idi. Bu hökumət Gürcüstanda mədaxil və məxaric, eləcə də mülki işlərlə məşğul olmalı idi. B a x: Gürcü divanbəyləri knyaz Zaal Baratova, knyaz İoan Çolakayevə və knyaz İqnati Tumanova göndərilmiş 1801-ci il 6 iyun tarixli, 308 nömrəli məktub (AKAK, c. I, sənəd 542, səh. 425).

4 Knyaz Sisianov Gürcüstanı idarə etməyə 1803-cü ilin fevral ayından başlamışdır (AKAK, c. II, sənəd 1, səh. 4).

5 Şahzadə Vaxtanq İrakliyeviç və şahzadə David Georgiyeviç 1803-cü ilin fevral ayında Peterburqa göndərilmişdilər. B a x: Knyaz Sisianovun general-mayor Qulyakova yazdığı 1803-cü il 19 fevral tarixli, 137 nömrəli əmr (AKAK, c. II, sənəd 112, səh. 69).

qulaq asmadı. Knyaz Sisianov general Lazarevi göndərdi ki, mehribanlıqla nəsihət edib, onu da bu işə razı etsin. General getdi və çox yalvardı, lakin çarə olmadı. Arvad generalın təklifini qəbul etmədi. Onun bütün Gürcüstan əhalisi boynunda olan haqqına və etdiyi yaxşılıqlara göz yumdu. Gizlicə xəncərini çəkdi və onu yaralayıb öldürdü[1]. Knyaz bu hadisəni eşitcək əmr verdi ki, onu da zorla aparsınlar[2]. Bundan sonra, vali övladından o ölkədə kimsə qalmadı. Gürcüstan işlərində arxayınlıq və xatircəmlik hasil oldu.

O zaman Car və Balakən ləzgiləri, əski adətləri üzrə, Gürcüstan vilayətlərinə basqın edərdilər. Əhalisini əsir edib aparardılar. Özlərinin bu kimi çirkin işlərindən əl çəkməzdilər. Knyaz ənbər iyli qələmilə məktublar yazdı, onlara nəsihət edib bildirdi ki, keçmiş zamanda hökumət başında vali dururdu. İndi isə Cəmşid mərtəbəli və yüksək dərəcəli bir padşah durur. Bu cür işlərdən əl götürüb rahat otursunlar. Nalayiq işləri tərk etsinlər; çünki bu cür hərəkətlər peşmanlıqdan başqa bir nəticə verməz.

Knyaz bu barədə onlara dəfələrlə müraciət etdi. Lakin onlar ayılmadılar. Axırda onları cəzalandırmağı qərara aldı. Cüzi qoşun götürüb Dağıstan tərəfinə hərəkət etdi. Ləzgilər bu hadisəni eşidincə yığışdılar, məsləhətləşib müdafiəyə hazırlandılar. Gəlib Qanıq çayının kənarında çadırlarını qurdular və Rusiya qoşunlarının gəlməsini gözlədilər. Onlar belə tədbir qurmuşdular ki, Rusiyanın zəfər nişanəli qoşunlarını Car torpağına girməyə qoymasınlar. Onların qarşısına çıxıb müharibə etsinlər. Lakin bilmədilər ki, od yağdıran ildırıma kol-kos mane ola bilməz və göydən enən bəlanı tədbir qalxanı dəf edə bilməz.

Rusiya qoşunları Qanıq çayına yetişən kimi, ova həris olan şahintək çaydan keçdilər. Onların (ləzgilərin) tüfənglərindən atılan güllələrin səsini istiqbal nəğməsi və qılınclarının parıltısını cahangirlik aynasının əksi bildilər. Bir anda o azğın əsgərlərdən bir əsər qoymadılar. Balakənə qədər heç bir mənzildə düşüb istirahət etmə-

---

1 General-mayor Lazarev 1803-cü il aprelin 21-də çariça Dariya Georgiyevna tərəfindən öldürülmüşdür. B a x: Gürcüstan haqqında qeydlər (AKAK, c. III, sənəd 1, səh. 5).

2 Çariça Dariya Georgiyevna 1803-cü il oktyabrın 25-də Rusiyaya yola düşdü. B a x: Knyaz Sisianovun çara yazdığı 1803-cü il 27 oktyabr tarixli, 98 nömrəli raport (AKAK, c. II, sənəd 167, səh. 102-103).

dilər. (Ləzgilərin) möhkəm aman evi və ümidgahı olan Balakəni... dağıtdılar[1]. Onlara gözəl bir qulaqburması verdilər ki, Gürcüstandan bir daha əsir aparmağa cürət etməsinlər. Qedim və onlardan ötrü çox təhlükəli olan bu məmləkətə qədəm qoymasınlar.

Knyaz Sisianov Car torpağında qoşun qoydu, general-mayor knyaz Orbelianovu (Orbelianini) və general-mayor Qulyakovu sərkərdə təyin etdi. Onlara tapşırdı ki, əgər ləzgilər düşməncəsinə hərəkət edib azğınlıq göstərsələr, onlara qarşı lazımi ölçü götürsünlər. Onları Gürcüstan əhalisinə əziyyət verməyə qoymasınlar.

Özü qayıdıb gəldi və ertəsi il Gürcüstana daxil oldu. Gəncə xanı Cavad xana kağız yazdı və təklif etdi ki, Rusiya dövlətinə itaət etsin, uca olan dövlət məmurlarının hökmünə tabe olsun. Düşmənçilik etməsin və üsyan sahəsinə qədəm qoymayıb itaət etsin. Yoxsa şanlı bir səltənət və qədim bir dövlət məmurlarının düşmənçilik bağçasından zərər çiçəyindən başqa bir gül dərə bilməz. Ziddiyyət toxumu da peşmançılıqdan başqa bir bar verməz.

Cavad xan mehribanlıq yolu ilə edilən bu nəsihətlərə əhəmiyyət vermədi və onun (Sisianovun) sözlərinə qulaq asmadı. Knyaz Sisianov dəryatək coşan qoşunlarla Gəncə tərəfinə hərəkət bayrağı qaldırdı. Tavad, Aznaur və Qazax-Şəmsəddinli süvarilərini yığıb cəm etdi. Səfərə hazır oldu. Zəfər nişanəli orduları Gəncə torpağına girib[2], ətrafı tutdu. (Bu zaman) Cavad xan öz adamlarını və qoşununu götürüb onların qabağına gəldi. Gəncənin iki verstliyində, Qulu-qobu (Quru-qobu) adlı yerdə iki ordu üz-üzə gəldi və hərb atəşi alovlandı. Cavad xan bir qədər hay-huydan sonra qaçdı. Yarımcan və pozğun bir halda qalaya daxil oldu və qalanı müdafiə etməyə başladı. Zəfər nişanəli qoşunlar şəhərə girib içəri qalanı (ərki) dörd bir tərəfdən, sıxı surətdə mühasirəyə aldılar. Bir ay orada qaldılar. Orucluq bayramının gecəsi nərdivanla bir neçə tərəfdən

---

1 Rusiya qoşunlarının Car vilayətinə yürüşü, knyaz Sisianovun əmri ilə 1803-cü ilin aprel ayında general-mayor Qulyakovun komandanlığı altında olmuşdur. B a x: Knyaz Sisianovun çara yazdığı 1803-cü il 17 aprel tarixli, 42 nömrəli raport (AKAK, c. II, sənəd 1387, səh. 685 və ardı). Həmin raporta Car vilayətinin Rusiya tabeliyinə daxil olması şərtləri əlavə edilmişdir.

2 Knyaz Sisianovun Cavad xana yazdığı 1803-cü il 29 noyabr tarixli məktub (AKAK, c. II, sənəd 1172, səh. 588); həmçinin müqayisə et: Knyaz Sisianovun Cavad xana göndərdiyi 1803-cü il, 9, 11, 26, 28 və 29 dekabr tarixli məktublar (AKAK, c. II, sənədlər 1175, 1179, səh. 590-591).

bayıra çıxmağa başladılar. Cavad xan bayıra çıxanları, igidlik və qoçaqlıqda dəf edirdi.

Axırda mayor Lisaneviçin bir gülləsilə həyat barısından yıxılıb, ölüm diyarına düşdü. Soldatlar dərhal dörd tərəfdən hücum edib şəhərə daxil oldular...[1] Uca mərtəbəli və qüdrət sahibi sərdarın hökmündən sonra, şəhər əhalisinin köç-külfətini şəhərə, Cavad xanın ailəsini isə məscidə apardılar. Məsciddən də bir evə gətirib, üstündə qarovullar qoydular. Knyaz orada (Gəncədə) hökumət qurub komendant təyin etdi. Vilayətin əhalisinə təsəlli və arxayınlıq verib Gürcüstana qayıtdı.

## ONUNCU FƏSİL

## KNYAZ SİSİANOVUN İRƏVAN TƏRƏFİNƏ SƏFƏRİ, MÜHARİBƏ VƏ QƏLƏBƏSİ, İRƏVANI ALMADAN MƏYUS QAYITMASI HAQQINDADIR

Knyaz Sisianov Tiflis şəhərinə daxil olduqdan sonra, o qışı qoşun hazırlamaq və səfər tədarükü görməklə keçirdi. Bahar fəsli İrəvan tərəfinə hərəkət etdi[2]. İrəvan hakimi Məmməd xan dəfələrlə knyazın hüzuruna məkrublar göndərib deyirdi: "Vaxt itirməyin, təcili surətdə İrəvana hərəkət edin. Bu yerləri də zəfər dalğalı bayraqlarınızın mahçəsi (ayparası) işıqlandırsın. Müzəffər, səadətli qoşunlarımz gələn kimi, qalaların açarlarını hüzurunuza göndərərəm. Uca olan dövlətə tabe olub itaət yolu ilə gedərəm".

Bu zaman Naxçıvan hakimi Kəlbəli xan da İrəvanda idi. Doğrudur, Məmməd xan İrəvanın müstəqil hakimi idi, lakin o, məmləkəti idarə etmək, yaxın və uzağın mühüm işlərini nizama salmaqda Kəlbəli xanın rəyinə tabe idi. Sərdar irəliləyərək Üçkilsə adlı yerə gəldi və fələk əzəmətli çadırlarını orada qurdu

---

1 . Gəncə qalası 1804-cü il yanvarın 3-də dan yeri ağaran zaman hücumla alınmışdır. B a x: Knyaz Sisianovun Qafqaz mülki qubernatoru Kasparova yazdığı 1804-cü il 8 yanvar tarixli, 5 nömrəli məktub (AKAK, c. II, sənəd 1182, səh. 592).

2 . Rusiya qoşunları knyaz Sisianovun komandası altında 1804-cü il iyun ayının axırında İrəvan qalasına yaxınlaşdılar. B a x: Knyaz Sisianovun irəvanlı Məmməd xana yazdığı 1804-cü il 26 iyun tarixli 318 nömrəli məktub (AKAK, c. II, sənəd 1232, səh. 615).

İran dövləti də kiçik bir uşaq olan Abbas Mirzəyə çoxlu qoşun verdi. Onu baş komandan təyin edib, hədsiz hazırlıqla sərdar Sisianovun qarşısına göndərdi. Abbas Mirzə də, müharibə etmək sövdası ilə, hücum bayrağı qaldırdı. Üçkilsədə iki qoşun üz-üzə gəldi. Burada böyük bir müharibə oldu. Atların qaldırdığı toz və dumandan ulduzların üzü qaraldı. Qılıncların panltısından dördüncü göydə işıqlı günəşin gözü qamaşdı.

Salari

O dava meydanında atların qaldırdığı tozdan,
Nə Günəş parlayırdı, nə də Ay.
Heyvanların dünyanı dolduran sədası,
Döyüşkən cavanların qışqırığı,
"Tut", "vur" səsi,
Ağlı başdan aparırdı, taqəti candan,
O mərəkədə qan su yerinə axdı,
Döyüşçülərin çoxu öldü, qaçıb qurtaran az oldu.

Rusiya qoşunları üç dəstə olmuşdu. Qızılbaşlar bunlara bir cür hücum etdilər ki, (göyə qalxan) tozun çoxluğundan işıq dünya qaranlıq oldu. Rusiya qoşunları bir-birindən xəbərsiz oldu. Hər dəstə elə xəyal etdi ki, o biri dəstə basılıb və məhv olunubdur. Elə ki, hava aydınlaşdı, ruslar baxıb gördülər ki, hamı sağ və salamatdır.

Qızılbaşlar baxıb gördülər ki, qırılan ancaq onlar olmuşdur. Bitkilər də onların qanından qızılbaş olmuşlar. Bundan sonra, ixtiyar cilovu əllərindən getdi, artıq müqavimət göstərə bilmədilər. Çox qorxuya düşdüklərindən düşmənə yaxın düşmədilər. Köçüb İrəvandan yuxarı, bərk və möhkəm bir sığınaq olan Kenakir adlı yerdə düşərgə etdilər.

Sisianov orada istirahətlə məşğul oldu və qoşunu dincəldi. Sonra, onların ardınca yürüş etdi. İş belə düşdü ki, bunlar qızılbaşlara ikindi çağı çatdılar. Qızılbaşlar bu halı görən kimi, çadırlarını, bütün şeylərini və düşərgələrini qoyub qaçdılar. Rusiya qoşunu onlardan qalan bütün şeyləri və qənimətləri ələ keçirdilər[1]. Oradan gedib İrəvanı mühasirəyə aldılar[2].

---

1 1804-cü il iyun ayının 30-da Kenakir yaxınlığındakı vuruşma və İran qoşunları düşərgəsinin işğalı haqqında knyaz Sisianovun knyaz Tenişevə yazdığı 1804-cü il 7 iyul tarixli 332 nömrəli məlumata bax (AKAK, c. II, sənəd 1668, səh. 809).

2 İrəvan qalası rus qoşunları tərəfindən 1804-cü il iyul ayının 2-dən etibarən mühasirəyə alındı (AKAK, c. II, sənəd 1668, səh. 810).

Fətəli şah Abbas Mirzəni yola saldıqdan sonra, özü də onun ardınca hədsiz-hesabsız qoşunla hərəkət etdi. Yolda Abbas Mirzənin sınmaq xəbərini eşitdi. İldırım və külək sürətilə gəlib Dədəli (?) adlı yerdə ona çatdı. İranhlar İrəvan şəhərinin yuxarısında ruslarla böyük bir müharibə etdilər. Lakin məqsədlərinə çatmadan tamamilə məyus oldular və düşərgə salıb oturdular. Onlar azuqə gətirən adamlara hücum etdilər. Rusiya qoşunu İrəvan şəhərini mühasirəyə aldı. Qızılbaşlar da onları araya aldılar. Qızılbaşlar gəliş-gediş yollarını bir dərəcədə kəsmişdilər ki, Rusiya qoşununun çarəsi hər bir tərəfdən üzülmüşdü. Hətta Sisianova qoşulub, onunla bir yerdə gəlmiş olan gürcü knyazları qaçdıqları zaman, qızılbaşların əlinə keçib əsir olmuşdular[1].

Fətəli şah Pirqulu sərdarı Gürcüstan valisi Aleksandr Mirzə ilə oradan Darüssürura (Tiflisə) göndərdi. Əvvəlcə Qazax və Borçalı elatı Rusiya dövlətindən üz çevirdilər və o dövlətin itaətindən boyun qaçırdılar. Nəsib bəy Gəncə müharibəsində mayor Lisaneviçin yanında olub, böyük xidmətlər göstərmişdi. Şəmsəddinli mahalı, Tiflis şəhəri və Nəsib bəydən başqa bütün elat, kəndlər, hətta Başaçığa qalan valizadələr də gəlib valiyə qoşuldular və üsyan etdilər[2].

Qarakilsə kəndində bir az soldat vardı. Onları kənd əhalisi ilə birlikdə mühasirə etdilər. Lakin axırda oranı ala bilmədilər.

Cənab Sisianov qoşununun azuqəsi azalmış idi. O, mayor Montrezoru[3] 150 nəfərə yaxın soldatla Gürcüstana azuqə gətirməyə göndərdi.

---

1 B a x: Knyaz Sisianovun İrəvandan çara göndərdiyi 1804-cü il 15 avqust tarixli 44 nömrəli raport. Bu raporta "Avqustun 7-də Tiflisə gəlmiş knyazların və dvoryanların siyahısı" əlavə edilmişdir. Siyahıda qeyd edilmiş şəxslərin çoxu İran qoşunları tərəfindən əsir edilmişdilər (AKAK, c. II, sənəd 1672, səh. 811). Həmçinin bax: Knyaz İv. Orbelianinin Təbrizdən knyaz Sisianova yazdığı 1804-cü il 10 noyabr tarixli məktub (AKAK, c. II, sənəd 1678, səh. 813). Müqayisə et: Fətəli şahın hicri 1219 (1804)-cu il cəmadiyələvvəl ayında İmeretiya padşahı Salomona göndərdiyi fərman (AKAK, c. II, sənəd 1682, səh. 815, 816).

2 Borçalılar, qazaxlılar, şəmsəddinlilər və pənbəklilərin bir hissəsinin İran qoşunları tərəfinə keçməsi haqqında Fətəli şahın kabardin, çeçen və osetin knyazlarına, bəylərinə, özdənlərinə, kətxudalarına və xalqlarına hicri 1219 (1804)-cu il cəmadiyəssani ayında göndərdiyi fərmanına bax (AKAK, c. II, sənəd 1689, səh. 820-821).

3 Mətndə Montrezor familiyası əvəzinə "Qandarov" göstərilmişdir. İrəvan yaxınlığındakı korpusdan göndərilmiş mayor Montrezorun dəstəsinin sərgüzəşti haqqında "Gürcüstan qeydləri"nə bax (AKAK, c. III, sənəd 1, səh. 5).

Bu mayor xalq arasında Qara mayor adı ilə məşhur idi. Məlik Əbu oğlu Rüstəm bəyi də öz adamları ilə onlara qoşdu. Tapşırdı ki, azuqəni orduya tezliklə yetirsinlər. Qızılbaş qoşunu bu əhvalatdan xəbərdar oldu. Onları təqib edərək üç gün müharibə etdi. Pənbəkə yetişdikdə, Pirqulu sərdara və valizadələrə məlumat verdilər ki, üç gündür bunlarla müharibə edirik. Biz nəinki bunları cana gətirmişik, hətta özümüz də cana gəlmişik. Gərəkdir ki, bizə kömək edəsiniz. Pirqulu sərdar və valizadələr də köməyə gəlib onlara qoşuldular. Səhərdən ikindiyədək müharibə etdilər. Çox adam tələf oldu. Nə qədər mayor yaralanmamışdı, döyüş bazarı qızğın idi. Mayor üç yerindən güllə ilə yaralandı, sonra döyüş bazarında solğunluq əmələ gəldi. Mayor öldü, əsgərləri də basılıb zəlil oldular. (Düşmən onun) soldatlarını dağıtdı. Ermənilər qaçıb bir mağaranı özlərinə sığınaq və səngər etdilər. Axırda, onlar da əsarət kəməndinə düçar oldular.

(Qızılbaşlar) oradan qayıtdılar. Qarakilsəni mühasirəyə alıb oturdular. Fitnə və fəsad tozunu hərlənən fələkə çatdırdılar.

Qubernator sərdarın qoşunu üçün Darüssürurdan (Tifüsdən) az bir soldatla çoxlu azuqə göndərdi. Bu azuqə təqribən iki yüz araba olardı. Onlar Cılğı adlı yaylağa yetişdikdə orada sakin olan elat gəlib onların yolunu kəsdi. Soldatlar çarəsiz qalıb arabaları özlərinə səngər edib oturdular. Elatın sürüsündən bir qədər qoyun gətirib səngərə girdilər və özlərini qorumağa başladılar. Elat çox çalışdı, lakin səngəri ala bilmədi. Axırda, onlar çarəsiz qalıb əhvalatı Pirqulu sərdara bildirdilər və ondan kömək istədilər. Pirqulu sərdar tez hərəkət edib yola düşdü. Onların yanına gəldi. O, çox çalışdı və tədbir yollarını düşüncə qədəmlərilə ölçdü. Lakin fikrinin kəməndi o səngəri almaq bürcünə çatmadı. O, ağac səngəri (arabalardan düzələn səngəri) almaqdan aciz qaldı. Axırda məqsədinə çatmadı, tamamilə naümid oldu. Xəcalətindən üzü qızardı, həsrətinin çoxluğundan ağladı, yaşlı gözü ilə Ağlağan dağının ətəyinə gəlib, öz göz yaşının bir damcısı kimi orada düşdü. Bu xəbər Tiflisdə yayılınca, bir general ilə üç yüz soldat və dörd araba top göndərildi ki, özlərini onlara yetirsinlər. Azuqəni birlikdə sərdar qoşununa çatdırsınlar. Heç bir mənzildə durmayıb, təcili surətdə getsinlər. Göndərilən general səngərdəki qoşuna yetişdiyi zaman, elatdan kimsə onların qarşısına getməyə cürət etmədi. Pirqulu sərdarın da dava meyda-

nına çıxmağa cəsarəti olmadı. Azuqəni götürüb sağ və salamat Qarakilsəyə yetirdilər.

(O tərəfdən) knyaz Sisianov gördü ki, azuqə gəlmədi və qala da ələ keçmədi. Rus qoşununa da titrətmə-qızdırma azarı düşmüşdür. Qayıdıb Qarakilsəyə gəldi və azuqəni qoşununa payladı.

Pirqulu sərdar və bədbəxt valizadələr bu halı gördükdə çarəsiz qalıb, ildırım sürətilə qayıdıb qaçdılar. Borçalı və sair Gürcüstan elatı da, bünövrəsi möhkəm olan dövlətdən üz çevirərək, üsyan sədasını ucaltmışdılar. Onlar xahiş etdilər ki, köçüb Qarabağa gəlsinlər və öz qədim vətənlərini tərk etsinlər. Mayor Lisaneviç bundan xəbərdar oldu. Nəsib bəylə birlikdə gəlib onlara gözəl nəsihətlər etdi. Onların ürəklərini yumşaltdı. Sərdar Gürcüstan torpağına daxil olana qədər onları əyləndirdi. (Sisianov) Sadaqlı kəndində o elatın ağalarını hüzuruna çağırdı. Tünd və acı hənzəl[1] ilə onların damağını zəhərləyib dedi: "Bu qüvvətli dövlətə qarşı nə üçün üsyan etmişsiniz. Sizin sağlam düşüncənizi kim zəhərləmişdir?!"

Onlar Sisianovun suallarına cavab tapmayıb ağızlarına sükut möhrü vurdular. İstər-istəməz təslim oldular. Cənab sərdar bu halı görüncə, mərhəmət dəryası cuşa gəlib, onlara buyurdu: "Siz bu çirkin hərəkətləri və nalayiq işləri qanuna bələd olmadığınız üçün görmüşsünüz. Buna görə, mən dövlətə qarşı olan xəyanətinizə göz yumub, günahınızdan keçirəm. Lakin Gürcüstandan qarət edib apardığınız şeylərin hamısını tamamilə sahiblərinə qaytarmalısınız".

Bundan sonra (knyaz Sisianov) Gürcüstana daxil oldu. Bir neçə gündən sonra üsyan edən dağ əhalisini sakit etmək üçün getdi. Oralarda əmin-amanlıq yaratdıqdan sonra qayıdıb Tiflisə gəldi. Qışı (orada) keçirdi, baharı isə Gəncəyə getdi.

---

1 “Əbucəhi” qarpızı adlanan çox acı bir meyvədir.

## ON BİRİNCİ F Ə S İ L

## SƏRDARIN MƏRHUM İBRAHİM XAN VƏ SƏLİM XANLA SÜLH ETMƏSİ VƏ ƏMƏLƏ GƏLƏN BƏZİ HADİSƏLƏR HAQQINDADIR

Knyaz Sisianov Gəncəyə daxil oldu və şəhərin ətrafında zəfər nişanəli çadırlarını qurdu. Qarabağ hakimi İbrahim xanın və onun damadı Səlim xanın yanına vəkillər göndərdi və onlara məktub yazdı. Səlim xan İbrahim xanın tərəfindən Şəki vilayətinə xan təyin edilmişdi. Onun köməyilə mərkəzi hökumətə arxalanırdı. Knyaz Sisianov bu vasitə ilə onlara uca Rusiya dövlətinə itaət etməyi təklif etdi. İşarə etdi ki, öz hökumətlərinin binasını Cəmşid mərtəbəli padşaha itaət etməklə möhkəmləndirsinlər. Adları çəkilən xanların xahişlərini qəbul zinətilə bəzədi. (Sonra) İbrahim xan Qarabağdan, Səlim xan Şəkidən və knyaz Sisianov Gəncədən gəlib Kürəkçay (kənarında) görüşdülər[1]. Aralarında bir çox danışıqlar oldu, şərtlər qoyuldu və müahidələr bağlandı: hər iki tərəf əhd və peymanla sülhün binasını möhkəmləndirdilər[2]. Sonra traktatlar (müqavilənamələr) bağlandı. Ondan sonra, uca mərtəbəli sərdar, mayor Lisaneviçi 500 soldatla Qarabağa, bir o qədərini də Şəkiyə göndərdi[3]. Özü isə Tiflisə qayıtdı. Gürcüstan və Başaçıq işlərini nizam və intizama salmaqla məşğul oldu. Onun əsas fikri bu idi ki, iki dəniz arasındakı sahə əldə edilsin və hər iki dənizdən xalqın gəliş-gedişi təmin edilsin. Buna görə, Minqrel torpağında Qara dəniz kənarında İdət-Quli qalasını bina etdi

---

1 Knyaz Sisianovun qarabağlı İbrahim xanla görüşü Kürəkçay kənarında vaqe olmuşdur. B a x: Knyaz Sisianovun knyaz Çartoriyskiyə yazdığı 1805-ci il 9 may tarixli, 298 nömrəli məktub (AKAK, c. II, sənəd 1435, səh. 702). Müqayisə et: Knyaz Sisianovun general-mayor Portnyakinə göndərdiyi 1805-ci il 23 may tarixli 605 nömrəli əmr (AKAK, c. II, sənəd 1438, səh. 707).

2 Qarabağlı İbrahim xanın Rusiya təbəəliyinə keçməsi haqqındakı traktat 1805-ci il mayın 14-də bağlandı. B a x: Knyaz Sisianovun knyaz Çartoriyskiyə göndərdiyi 1805-ci il 22 may tarixli 328 nömrəli təliqə (AKAK, c. II, sənəd 1437, səh. 705). Yuxarıdakı traktatın lahiyəsinin mətni (AKAK, sənəd 1436, səh. 705).

3 Şəkili Səlim xanın Rusiya təbəəliyinə daxil olması haqqında traktat Kürəkçay kənarındakı düşərgədə 1805-ci il mayın 28-də bağlandı.

Sonra onun əsas fikri bu oldu ki, Bakını da alsın. Bu şəhər sahəsini qalib bayraqların malıçəsi (ayparası) ilə işıqlandırsın. Bu məqsədlə Darüssürura (Tiflisə) qayıtdı. Dəniz kimi coşan qoşun və dəmir geyimli alaylarla Bakını almağa hərəkət etdi. Mərhum İbrahim xandan kömək istədi. Behiştlik (İbrahim) xan da öz böyük oğlu səadətli Mehdiqulu ağanı köməyə göndərdi.

Şirvanlı Mustafa xanın ölkəsi, zəfər nişanəli rus qoşunlarının yolu üstündə idi. Buna baxmayaraq o, bu böyük dövlətin itaətini qəbul etməkdən boyun qaçırdı. Düşmənçilikdən dəm vurub ədavət yolunda sabitqədəm durdu. Cənab sərdar onu[1] cəzalandırmağı və qəflət yuxusundan oyatmağı vacib bildi. Buna görə o, Şirvan tərəfinə yola düşdü. Mustafa xan bu kədərli hadisəni eşidincə, qorxuya düşdü. O öz elat və təbəələrini yığıb möhkəm bir sığınaq və məskən olan Fit dağına[2] çəkildi və orada səngər qurub əyləşdi. Cənab sərdar gəlib çatdıqdan sonra aralarında barışıq oldu və traktatlar (müqavilələr) bağlandı[3]. Sərdar dəfələrlə bir atlı götürüb, Mustafa xanın yanına gedirdi. Mustafa xan xeyirxahlıq üzündən cənab sərdara dedi: "Bu cür gəzməkdən sizə və xoşbəxt vücudunuza ziyan toxunar". Sərdar ona belə cavab verdi: "Cəmşid mərtəbəli, əzəmətli və calallı olan dünya padşahının mənim kimi milyonlarca soldatı vardır. Əgər mən yox olsam, onun bir soldatı əskik olar. Mənim kimi bir rütbə sahibi ölsün, ya bir soldat, heç bir təfavütü yoxdur".

Sonra oradan köçdülər, Bakını həm dənizdən və həm də qurudan mühasirə etdilər[4]. Bir müddət keçdikdən sonra Badkubə (Bakı) xanı Hüseynqulu xan, cürbəcür vasitə və bəhanələrlə sülh və saziş binasını qoydu. Sərdar da onun üstüörtülü sözlərinə inandı. (Hüseynqulu xan) qaladan çıxdı, çadırlar qurdurub oturdu. Sonra sərdar həz-

---

1 Knyaz Sisianovun Mustafa xana 1805-ci il 12, 14, 15 və 24 dekabr tarixli məktubları (AKAK, c. II, sənədlər 1359, 1360, 1362, 1364, səh. 671-673).

2 Fit dağı Lahıc kəndinin yaxınlığındadır. Mustafa xanın Fit dağında olması haqqında knyaz Sisianovun Mustafa xana yazdığı 1805-ci il 15 dekabr tarixli 933 nömrəli məktubuna bax (AKAK, c. II, sənəd 1362, səh. 673).

3 Şirvanlı Mustafa xanın Rusiya təbəəliyinə daxil olması haqqında traktat 1805-ci il dekabrın 25-də bağlanmışdır. B a x: Knyaz Sisianovun çara yazdığı 1805-ci il 27 dekabr tarixli, 51 nömrəli raport (AKAK c. II, sənəd 1366, səh. 674).

4 B a x: Knyaz Sisianovun general-mayor Zavalişinə göndərdiyi 1806-ct il 31 yanvar tarixli 63 nömrəli əmr (AKAK, c. II, sənəd 1521, səh. 745).

rətlərinə belə bir xəbər göndərdi: "Sizə söyləməyə bir para vacibli və gizli sözlərim vardır. Onları şifahən sizə danışmalıyam. Buna görə məsləhətdir ki, mənim çadırıma təşrif gətirəsiniz".

Saf və təmiz qəlbli cənab Sərdar bu işdə bir qərəz olduğunu ürəyinə gətirmədi. Hüseynqulu xanın çadırına gəldi. Orada oturub danışır və məsləhətləşirdilər. Danışıq və müşavirə əsnasında, Hüseynqulu xanın qohumlarından İbrahim bəy adlı bir şəxs namərdlik edib, güllə ilə sərdarı yaraladı. Sərdar haman saat vəfat etdi.

Şeir

Dünya gözəllik etibarilə bir behişt olardı.
Əgər onda qocalıq və ölüm olmasaydı.

(Hüseynqulu xan) bu hərəkəti qızılbaş dövlətinə qarşı uca bir xidmət və gözəl bir sədaqət hesab etdi. O, mənzil kəsən və yel kimi iti gedən çaparlar vasitəsilə Qızılbaş dövlətini bu hadisədən xəbərdar etdi. Qızılbaş dövləti tərəfindən də həddən artıq təchiz edilmiş və ulduzlar qədər çoxlu qoşun göndərildi. Onlar gəlib Bakı səhrasına doldular. Xas və avam camaatın yığışmasından, əsgərlərin və qoşunların toplanmasından, yel və külək kimi iti gedən dördayaqlıların hərəkətindən dağ və səhralar məhşərdən bir nümunə olmuşdu.

Rusiya əsgərləri bu hadisədən xəbərdar oldular. Quru yol ilə qayıtmaqdan çəkindilər. Gəmilərə oturub Hacı Tərxana getdilər.

Bu vilayətlərdə İran qanunları tətbiq edildi və (ölkə) onların əsassız nizamlarına tabe oldu. Nəticədə az qalmışdı ki, bu vilayətlərə qarışıqlıq düşsün.

Starşiy komandir (baş komandir) vəzifəsilə Pənbəkdə sakin olan cənab general-mayor Svidaev (Nesvetayev)[1], müvəqqəti olaraq sərdarlıq yerini dolandırırdı. O, xas və avam camaatın ürəyini ələ gətirməyə və onları sakit etməyə çalışırdı.

Yeddi-səkkiz ay keçdikdən sonra, cənab general-feldmarşal qraf Qudoviç, sərdarlıq mənsəbilə Qafqaza gəldi. Darüssürura (Tiflisə) daxil olub, öz vəzifəsinə başladı[2].

---

1 Nesvetayev Pyotr Daniloviç, general-mayor. B a x: Knyaz Sisianovun general-mayor Nesvetayevə yazdığı 1805-ci il 25 avqust tarixli 1066 nömrəli əmr (AKAK, c. II, sənəd 1165, səh. 585).

2 1806-cı ilin iyun ayında general-feldmarşal İ.V.Qudoviç knyaz Sisianovun əvəzində Qafqaz işləri ilə məşğul olurdu. B a x : AKAK, c. III.

Bir çox illər və aylar keçdikdən sonra, Rum (Türkiyə) sultanı ilə düşmənçilik yolu açıldı. Qraf feldmarşal (Qudoviç) külli tədarük və əndazəsiz hazırlıqlar gördü. Mühasiblərin fikir və zəkası onu sayıb hesablamaqdan aciz idi. General Nesvetayevi zəfər nişanəli və ulduzlar qədər saysız-hesabsız xoşbəxt qoşunla Gömrüdə qoydu. Özü isə düşmən əzən döyüşkən dəstələr, yağıya od vuran əsgəri hissələrlə, böyük bir cah-calal, şövkət və iqbal ilə Axalkalak tərəfinə sel kimi getdi. O zaman Xümşizadə Səlim paşa Axısxada hakim və hökumət işlərini idarə edib, nizama salmaqda idi. O bu qorxulu xəbərləri və qeyrətli hadisələri eşitdi. O saat boş xəyalat və puç fikirləri nəticəsində ruhdan düşdü (özünü itirdi). Axalkalakm mühafizəsi və rusları dəf etmək üçün qoşun təyin edib göndərdi. O bilmədi ki, axan selə kol-kos mane ola bilməz. İnsan və cinnin tədbir qalxanı meteor daşını dəf edə bilməz. Qraf Qudoviç cənabları, döyüş meydanının igidlərilə (öz əsgərləri ilə) heç bir mənzildə düşmədi. Gecə və gündüzünü yəhər üzərində keçirdi. Axalkalak sahəsini zəfər nişanəli orduların seyrəngahı etdi. Qaniçən döyüşçülərin qalibiyyət çadırlarını orada qurdu. Axalkalakı üzük qaşı kimi dörd bir tərəfdən mühasirəyə aldı[1]. Səkkiz gün bu qayda ilə durdu. Sonra, nərdivanlar düzəltdirib dörd tərəfdən şəhərə yürüş etdilər. Orada yaşayan əhalinin ürəyinə qorxu saldılar. Sübhün açılmasına iki saat qalmış (müharibəyə girişdilər). Sübhün açılmasından üç saat keçmişdi, parlaq qılıncların məşşatəsi adlı-sanlı pəhləvanların qanı ilə, döyüşçülərin üzünü gültək qızartmaqda idi. (Axırda) qraf gördü ki, zəfər qalasını fəth etmək mümkün olmur. Məqsədinə çatmadan geri qayıtdı. O gecəni durub səhər Gürcüstan tərəfinə getdi. Tiflisə yetişdiyi zaman eşitdi ki, Yusif paşa sərəskər olub, müharibə məqsədilə Qarsa gəlmişdir. Qraf hazırlıq görüb Gömrüyə hərəkət etdi[2].

---

1 Rusiya qoşunları Axalkalak qalasını 1807-ci ilin may ayında mühasirəyə aldılar.B a x: Qraf Qudoviçin general-mayor Rıkqofa Axalkalakidən yazdığı 1807-ci il 10 may tarixli 36 nömrəli əmr (AKAK, c. III, sənəd 942, səh. 542). Axalkalak qalasının mühasirə edilməsi haqqında türk mənbələrinin verdiyi məlumatla tanış olmaq üçün b a x: Anadoluda Türkiyə ordusunun baş komandanı Yusif Ziya paşanın Yuxan Şoragildə olan rus generalı Nesvetayevə göndərdiyi hicri 1222 (1807)-ci il 15 rebiülevvəl tarixli elan (AKAK, c. III, sənəd 922, səh. 531).

2 General Qudoviçin Gömrüyə tərəf hərəkət etməsi haqqında bax: Qraf Qudoviçin Lori çayı yanındakı düşərgədən general-mayor Nesvetayevə göndərdiyi 1807-ci il 3 iyun tarixli 158 nömrəli əmr (AKAK, c. III, sənəd 947, səh. 545).

Arpa çayında iki ordu bir-birinə rast gəldi. Hər ordu çayın bir tərəfində düşdü. Bir müddət keçdikdən sonra müharibə başlandı. İkindiyə yaxın osmanlı qoşunu (məğlub oldu). Ruslar osmanlılardan böyük qənimət və çoxlu toplar aldılar[1]. Sərdar böyük bir dəbdəbə ilə istədiyi kimi Tiflisə yola düşdü.

Qışda çoxlu tədarük və hazırlıq görüb zəfər nişanəli bayraqları qaldıraraq İrəvan tərəfinə hərəkət etdi[2]. General Nebolsini Qarabağ tərəfindən çoxlu zəfər nişanəli qoşun dəstələrilə Naxçıvan vilayətini almağa göndərdi. Naxçıvan alındı[3]. İrəvan sıx bir mühasirə altında qaldı. Uzun bir müddət keçdikdən sonra yürüşə başladılar. Dövranın saqisi çox adamların həyat piyaləsini daşdırdı. Əcəl küləyi hədsiz-hesabsız insanların gözünə bu işıq dünyanı qaranlıq etdi.

Axırda öz himmət əlini qalibiyyət gözəlinin ətəyinə çatdıra bilmədi. Məqsədinə çatmadan[4] qayıtmaq təblini çaldırdı və gedib Darüssürura (Tiflisə) daxil oldu.

Bundan sonra, general ot infanteri (piyada qoşun generalı) Tormasov, əbədi dövlətin baş məmurları tərəfindən sərdarlıq vəzifəsinə təyin edildi və o, uca mənsəbin piyaləsindən sərxoş oldu. Qrafı Rusiyaya çağırdılar[5]. General Tormasov sülhü hərbdən əlverişli görüb, Osmanlı dövlətilə barışdı.

General Tormasov qızılbaşlarla davanın arasını kəsməz və döyüş məclisini sovutmazdı. Bəsirət gözünü yumub İran tərəfindən rahat-

---

1 Sərəskər Yusif paşanın komandası altında olan türk ordusu 1807-ci il iyunun 18-də Arpa çayında məğlub edilmişdir. Rusiya qoşunları bu döyüşdə qənimət olaraq 10 top və 2 mortir ələ keçirdilər. B a x: Qraf Qudoviçin Arpa çayı düşərgəsindən çara göndərdiyi 1807-ci il 20 iyun tarixli 11 nömrəli raport (AKAK, c. III, sənəd 957, səh. 548).

2 Rusiya qoşunları 1808-ci ilin oktyabr ayında qraf Qudoviçin komandanlığı ilə İrəvanı mühasirəyə almışdılar. B a x: Qraf Qudoviçin general-mayor Nebolsinə yazdığı 1808-ci il 18 oktyabr tarixli 149 nömrəli əmr(AKAK, c. III, sənəd 875, səh. 496).

3 Naxçıvanın Rusiya qoşunları tərəfindən alınması haqqında bax: Qraf Qudoviçin knyaz A.A.Prozorovskiyə yazdığı 1809-cu il 5 yanvar tarixli 1 nömrəli təliqə (AKAK, c. III, sənəd 895, səh. 507, 508).

4 İrəvan qalasının iki aylıq mühasirəsi, qala üzərinə edilən müvəffəqiyyətsiz hücum (17 noyabr 1808-ci il) və Rusiya qoşunlarının geri çəkilməsi haqqında bax: Qraf Qudoviçin knyaz A.A.Prozorovskiyə yazdığı 1809-cu il 5 yanvar tarixli 1 nömrəli təliqə (AKAK, c. III, sənəd 895, səh. 509-510).

5 Qraf İ.V.Qudoviç Gürcüstandakı qoşunlara 1809-cu il martın 5-dək komandanlıq etmişdir, lakin o, aprelin axırlarına qədər Qafqaz işlərinə baxırdı (AKAK, c. III, səh. 111). B a x: General-leytenant Repinin Bakıdan qraf Qudoviçə yazdığı 1809-cu il 27 aprel tarixli 460 nömrəli raport (AKAK, c. III, sənəd 904, səh. 516).

lıq yuxusuna getməzdi. Buna baxmayaraq, qızılbaşlar uca Rusiya dövləti əmirlərini yatırtdılar. Məhəmmədəli Mirzəni gizlincə sərhəddən keçirtdilər. O, Gürcüstana gəlib Borçalını çalıb-çapdı. Hədsiz zərərlər vurdu və bir çox əsir apardı[1]. Ertəsi il irəvanlı Sərdar Hüseyn xanı vali ilə birlikdə Gürcüstan tərəfinə göndərdilər ki, gedib Axısxadan Gürcüstana iğtişaş və şuluqluq salsınlar. Sərdar Tormasov əhvalatdan xəbərdar oldu. Şəmkirdən keçdi və tələsik (gəlib), Sədra körpüsünün yanında düşdü. General-leytenant Pauluççiyə və general Lisaneviçə qoşun verib Axısxaya Hüseyn xanın qabağına göndərdi. Sanki bu zaman dünya abbasilər kimi, qara libas geyib[2], ölən qızılbaş əsgərlərinə matəm saxlamaqda idi.

Göndərilən zəfər nişanəli əsgərlər, gecə yarısı qəflətən qızılbaş qoşununa şəxbun vurdular. Qətl və qarət edib çox adam qırdılar. Qızılbaş əsgərləri özlərini itirdilər. Onlardan bəzisi çox çətinliklə öz canını ölüm və fəlakət girdabından qurtardı. Atlı və piyada olaraq başlarını görürüb qaçdılar[3]. Yolda osmanlı əsgərləri onların çoxunu tutub soydular, lüt və çılpaq etdilər. Qılıncdan canlarını qurtaranlar çox çətinlik, zillət və məşəqqətlə İrəvan hüduduna çatdılar. Sərdar Hüseyn xan, qızılbaş dövlətindən utanıb qorxduğundan, Koroğlu qalasına qaçdı. Bir neçə müddətdən sonra onu arxayın edib öz yerinə apardılar.

Ertəsi il Tormasov Rusiyaya getdi. Dövlət başçıları markiz Pauliççini sərdar təyin etdilər. (O), Tiflisə gəldi[4]. Oradan Bakı səfərinə yola düşüb Gəncə vilayətinə daxil oldu. Cavad xanın dustaq olan

---

1 Fətəli şahın böyük oğlu Məhəmmədəli Mirzənin Borçalı nahiyəsinə girməsi haqqında bax: General Tormasovun Maşaveri çayı altındakı düşərgədən qraf Rumyantsova yazdığı 1809-cu il 10 sentyabr tarixli 88 nömrəli təliqə (AKAK, c. IV, sənəd 1075, səh. 695). Yenə də b ax: General Tormasovun general-mayor Portnyakinə yazdığı 1809-cu il 16 sentyabr tarixli, 390 nömrəli əmr (AKAK, c. IV, sənəd 1076, səh. 697).

2 Abbasilər qara paltar geyirdilər.

3 İran-Türkiyə qoşunlarının düşərgəsi, 1810-cu il 5 sentyabr gecəsi darmadağın edildi. Bu zaman irəvanlı Hüseynqulu xan və şahzadə Aleksandr bu düşərgədə idilər. Rusiya qoşunlarına general-mayor Pauluççi və polkovnik Lisaneviç komandanlıq edirdilər. B a x: General Tormasovun çara göndərdiyi 1810-cu il 19 sentyabr tarixli, 185 nömrəli raport (AKAK, c. IV, sənəd 1242, səh. 819).

4 Gürcüstanda olan hərbi korpusun komandanlığı və mülki işlərin rəhbərliyi 1811 -ci il iyulun 6-da general-leytenant markiz Pauluççiyə tapşırılmışdı. B a x: Çarın markiz Pauluççi adına göndərdiyi 1811-ci il 6 iyul tarixli fərman (AKAK, c. V, sənəd 1, səh. 1). Markiz Pauluççi Zaqafqaziyanı idarə etməyə, ehtimal ki, 1811-ci ilin sentyabr ayından başlamışdır (AKAK, c. V, sənəd 2, səh. 1).

əhli-əyal və oğul-uşağını[1] bir neçə qızılbaş xanları ilə birlikdə həbsdən azad etdi. Oradan Bakı tərəfinə getdi[2].

Buzaman Kaxet və Qısıq (əhalisi) bunt (üsyan) etdilər, azğınlıq və üsyan yolunu tutub getdilər[3]. Mərhum İbrahim xanın nəvəsi polkovnik Cəfərqulu ağa Qarabağdan qaçıb, qızılbaş dövlətinə (İrana) getdi. Naibüssəltənə (Abbas Mirzə) də Qarabağa gəlib Qırçıda olan batalyonu dağıtdı[4]. Markiz bu dəhşətli xəbəri eşidincə Bakı səfərindən əl çəkib, Şirvana - Mustafa xanın yanına gəldi. Oradan Qarabağa hərəkət etdi. Şəhərə daxil olunca, Qırçı hadisəsindən ötrü bir para adamlara acıqlanıb bərk məzəmmət etdi. Haman gecə arvadından kağız aldı ki, Kaxet və Qısıq gürcüləri bunt (üsyan) etmişlər. (Məktubda deyilirdi ki,) kağızı alan kimi, bu tərəfə hərəkət edin və xalqın ürəyini ələ alıb yumşaldın. Sərdar durmadan Darüssürura (Tiflisə) tərəf yola düşdü[5]. Yolda sərdar Qazax əhalisindən qorxuya düşüb ehtiyat edirdi. (Onlar) isə sərdarı istiqbal edərək hörmət və ixlas, son dərəcə canfəşanlıq və səmimiyyətlə Tiflisə ötürdülər. Qazax əhalisi neçə dəfə gürcülərə hücum edib onları çalıb-çapdılar. Doğ-

---

1 Mərhum Cavad xanın arvadlarına, qızlarına və nəvələrinə İrana getməyə icazə verilmişdi. B a x: Markiz Pauluççinin Yelizavetpoldan Abbas Mirzəyə yazdığı 1812-ci il 20 fevral tarixli 161 nömrəli məktub (AKAK, c. V, sənəd 167, səh. 119). Həmçinin bax: Markiz Pauluççinin qraf Rumyantsova göndərdiyi 1812-ci il 7 aprel tarixli, 103 nömrəli təliqə (AKAK, c. V, sənəd 169, səh. 119).

2 Markiz Pauluççi 1812-ci il fevral ayının birinci yarısında Bakıda olmuşdur. B a x: Markiz Pauluççinin çara göndərdiyi 1812-ci il 22 fevral tarixli 46 nömrəli raport (AKAK, c. V, sənəd 88, səh. 59).

3 1812-ci il fevral ayının əvvəllərində Kaxetiyada başlanmış üsyanın başlıca səbəbi (bax: Markiz Pauluççinin çara göndərdiyi 1812-ci il 26 mart tarixli 85 nömrəli raport (AKAK, c. V, sənəd 97, səh. 68 və ardı). Rusiya komandanlığının camaatdan vergi şəklində topladığı taxıl zamanı tətbiq etdiyi cəzalar idi. 1811-ci ildə baş vermiş qıtlıq aclığa və epidemiyaya səbəb oldu. Kəndlilərin vergini taxılla verməyə imkanı yox idi. B a x: "Kaxetiya üsyançılarının Telav komandanı və qəza polis rəisinə yazdıqları məktublar" və "Kaxetiya camaat məclisinin markiz Pauluççiyə göndərdiyi məlumat" (AKAK, c. V, səh. 81-82).

4 Qarabağ xanlığı varisi Cəfərqulu xanın İrana qaçması və Troitski polku batalyonunun İran qoşunları tərəfindən məğlub və əsir edilməsi haqqında bax: Markiz Pauluççinin çara göndərdiyi 1812-ci il 22 fevral tarixli 46 nömrəli raport (AKAK, c. V, sənəd 88, səh. 59).

5 General-mayor Pauluççi 1812-ci il 21 fevralda Qarabağdan (Şuşadan) Tiflisə yola düşdü, oraya isə beşinci günü gəlib çatdı. B a x: Markiz Pauluççinin çara göndərdiyi 1812-ci il 26 mart tarixli 85 nömrəli raport (AKAK, c. V, sənəd 97, səh. 75).

rusu budur ki, o zaman Qazax əhalisi sərdara çox xidmət, sədaqət və hədsiz ixlas göstərmişdilər. Tiflisdən üsyançıları cəzalandırmaq üçün zəfəraişan əsgərlər göndərildi. Üsyançıların bəzisi müqavimət göstərdi, bəzisi isə öz xahişləri ilə tabe oldular[1].

Bu zaman fransızların Rusiyaya gəlməsi xəbəri dillərdə və ağızlarda söylənib məşhur oldu.

Markiz Pauluççini sərdarlıqdan götürüb, Rusiyaya geri çağırdılar. Yerinə general Rtişşev sərdar təyin edildi[2]. O, Gürcüstana gəldikdən sonra, məsihi (miladi) 1814-cü ildə Qızılbaş dövlətilə sazişə girib dostluq binasını qoydu. Sülhdən ötrü İran tərəfindən Mirzə Əbülhəsən xan Peterburqa gəldi. Böyük bir calal və təntənə ilə sülh haqqında danışığa başladılar[3]. Bu sülh "Gülüstan sülhü" adı ilə məşhurdur[4]. Bu günə qədər xalq arasında xas və avam camaatın dilində söylənməkdədir.

Bundan sonra, əmin-amanlıq oldu və fitnə ilə dolu olan dünya asayiş tapdı. Bir müddətdən sonra, general Rtişşevi işdən götürüb general Yermolovu sərdar təyin etdilər[5]. O böyük general vilayətlərin işlərinə baxıb vəziyyətin tələbinə görə, bəzi yerlərdə təzə

---

1 Kaxetiya kendlilərinin üsyam 1812-ci il martın 10-da yatırılmışdı (AKAK, c. V, sənəd 97, səh. 80).

2 Markiz Pauluççi I Aleksandrın 1812-ci il 16 fevral tarixli fermam ilə Peterburqa geri çağırılmışdı, həmin bu fərmanda qeyd edilmişdi ki, onun yerinə general-leytenant Rtişşev təyin olunur. B a x: Çarın markiz Pauluççiyə göndərdiyi 1812-ci il 16 fevral tarixli fərman (AKAK, c. V, sənəd 32, səh. 20). Markiz Pauluççi 1812-ci ilin aprel ayından tez olmayaraq işləri general Rtişşevə təhvil vermişdir. B a x: Markiz Pauluççinin general-leytenant Rtişşevə yazdığı 1812-ci il 7 aprel tarixli 333 nömrəli təliqə (AKAK, c. V, sənəd 40, səh. 23).

3 Burada Mirzə Adıgözəl bəy o qədər də haqlı deyil. Hadisələrin müasirləri səfarətxanaların gizli məqsədlərini bilə bilməzdilər. I Aleksandr Yermolova verdiyi təlimatında belə yazmış: "Bu işdə İran sarayının başlıca məqsədi, İrandan bizə güzəşt olunmuş torpaqların İrana qaytarılmasını xahiş etməkdən ibarət idi. Bunun nəticəsində səfir Mirzə Əbülhəsen xan təsdiq olunmuş müahidə nüsxələrinin mübadiləsindən sonra dərhal S.-Peterburqa göndərilmişdi" (AKAK, c. VI, h. II, sənəd 267, səh. 122).

4 Gülüstan sülh müahidəsi 1813-cü il 12 oktyabrda bağlandı. B a x: General Rtişşevin çara göndərdiyi 1813-cü il 14 oktyabr tarixli 195 nömrəli raport (AKAK, c. V, sənəd 879, səh. 736).

5 General-leytenant A.P.Yermolov 1816-cı il oktyabrın 10-da Tiflisə gəldi (AKAK, c. VI, h. I, səh. 11).

qanunlar qoydu. Bu dövrdə Qarabağ və Şirvan xanları qızılbaş tərəfinə (İrana) qaçdılar[1].

Şəki xanı İsmayıl xan da vəfat etdi[2]. (Beləliklə) üç xanlıq ədalət və əzəmət nişanəli dövlət və səltənətin idarəsi altına keçdi. Cənab Yermolov bu yerlərdə divanxanalar açdı, divanbəyilər seçdi[3] və komendantlar təyin etdi. İşləri özü qoyduğu qanun üzrə apardı.

ON İKİNCİ FƏSİL

## QIZILBAŞLARIN ÖZ ƏHDLƏRİNİ DÜBARƏ SINDIRIB ƏZƏMƏTLİ DÖVLƏTƏ QARŞI ƏDAVƏT VƏ İNAD GÖSTƏRMƏLƏRİ HAQQINDADIR

İki uca və işıqlı dövlət arasında lazımi əsaslar üzrə sülh bağlandı. Keçmişdə olduğu kimi, əlaqə və münasibət davam edirdi. Məsihi (miladi) 1826-cı ildə xas və avam camaatın arasında belə bir şayiə yayıldı: İranın dövlət adamları sülhü və müahidəni pozub ədavət fikrinə düşmüşlər. Rusiyanın dövlət başçıları buna inanmadılar. Onlar bu şayiələri yalan hesab etdilər. Bu əsnada, uca mərtəbə sahibi böyük imperator və əziz şahənşah tərəfindən knyaz Menşikov səlahiyyətli səfir sifətilə İrana gedirdi. O, Qarabağa gəlib Xudafərin körpüsündən keçdi və İrana getdi[4]. Bu iş xas adamları və

1 Şirvanlı Mustafa xan 1820-ci il avqustun 19-da İrana qaçmışdır. B a x: General-mayor Vlasovun Səlyan kəndindən general Yermolova göndərdiyi 1820-ci il 19 avqust tarixli 43 nömrəli raport (AKAK, c. VI, h. I, sənəd 1212, səh. 810). Qarabağlı Mehdiqulu xan 1822-ci il noyabrın 21-də İrana qaçmışdır. B a x: Knyaz Madatovun general-leytenant Velyaminova yazdığı 1822-ci il 21 noyabr tarixli 916 nömrəli raport (AKAK, c. VI, h. I, sənəd 1293, səh. 848).

2 Şəkili İsmayıl xan 1819-cu il iyulun 24-də vəfat etmişdir. B a x: 9-cu Yeger polku mayoru 2-ci fon-Disterlonun general-leytenant Velyaminova yazdığı 1819-cu il 24 iyul tarixli 81 nömrəli raport (AKAK, c. VI, h. I, səh. 738).

3 Divanbəyilər komendantların sədrliyi altında iclas edərdilər və vilayəti idarə etmək işində müşavir və müavin sifətilə işləyirdilər.

4 Knyaz Menşikov 1826-cı il mayın 23-də Xudafərin körpüsü yanında, iyunun əvvəllərində isə Təbrizdə idi. B a x: General-mayor knyaz Menşikovun Arazın sol kənarı Xudafərin körpüsü yanında general-leytenant Velyaminova yazdığı 1826-cı il 23 may tarixli raport (AKAK, c. VI, h. II, sənəd 620, səh. 344).

avam camaatı arxayın etdi. Mən özüm üç il olardı ki, İrəvan tərəfində sərhəd qarovulçuluğuna təyin edilmişdim. Hər gün qarapapaqlardan[1] doğru xəbərlər və səhih əhvalat bilib naçalnikə yazırdım. Axırda o böyük cənab (naçalnik) məni başa saldı ki, bundan sonra mənə bu qorxulu xəbərləri yazmayın; çünki mən də labüd qalıb bu xəbərləri dövlət başçılarına yazıram. Onlardan isə məzəmmətdən başqa bir cavab almıram. Sən öz tədarükündə hazır ol və öz işlərinə ehtiyatla yanaş.

Müxtəsər, yuxarıda adı çəkilən elçi Təbrizdən və Qoçandan keçdiyi zaman qızılbaş qoşunu ilə görüşüb vəziyyətlə tanış oldu. Bu barədə dövlət adamlarına və qüdrət sahibi olan səltənət başçılarına xəbərdarlıq edə bilmədi[2]. Qızılbaşlar gəlib Araz çayından keçdikləri zaman[3] çayda çimən bir neçə qazağı öldürdülər. Qarabağlıların məsləhət və məşvərətilə oradan Gorusdakı batalyon üzərinə yeridilər. Batalyona da hökm olunmuşdu ki, durmadan və ləngimədən təcili surətdə Qalaya (Şuşaya) hərəkət etsin. O zaman naib (mənsəbində) olan poruçik Səfərli bəy də bələdçi idi. Yol ilə gedərkən Korunzor yaxınlığında (qızılbaş) qoşununa rast gəldilər. Orada müharibə oldu. Günəş hərarətindən qoşuna bərk susuzluq üz verdi. Özlərini Həkəri çayına yetirməyə çalışdılar. Kapitan Hacı Ağalar bəy (əhvalatdan) xəbərdar oldu. Bir neçə nəfər bəyzadə ilə əlbir olaraq kürdlərin piyada və süvarisini topladı. Gəlib çayın bu tərəfini kəsdi. Soldatlara hər iki tərəfdən keçməyə macal vermədilər. Bəzisini iti qılıncdan keçirdilər, bəzisini də əsirlik kəməndinə

---

1 Qarapapaqlar - Zaqafqaziyanın müxtəlif yerlərinə səpələnmiş bir Azərbaycan tayfasıdır.

2 Knyaz Menşikov İran hökumətinin Rusiyaya qarşı müharibə etmək niyyətində olduğunu göstərən faktlar haqqında general-leytenant Velyaminova xəbər vermişdi. B a x: General-mayor knyaz Menşikovun Xoca Qiyas kəndi yanındakı düşərgədən general-leytenant Velyaminova yazdığı 1826-cı il 23 iyun tarixli raport (AKAK, c. VI, h. II, sənəd 628, səh. 347). Həmçinin bax: Knyaz Menşikovun general-leytenant Velyaminova verdiyi 1826-cı il 2 iyul tarixli məlumat (AKAK, c. VI, h. II, sənəd 633, səh. 349).

3 İran qoşunlarının böyük qüvvələrlə Qarabağa daxil olması haqqında bax: Çara I 1826-cı il 30 iyul tarixində göndərilən raport (AKAK, c. VI, h. II, sənəd 651, səh. I 357). İran qoşunlarının ilk dəstələri 1826-cı il iyunun 15-də sərhədi bir neçə yerdə keçmişdilər. B a x: N.Dubrovin " История войны и владичество русских на Кавказе", c. VI, səh. 617, SPb capı, 1888-ci il

saldılar[1]. Kimsə nicat tapa bilmədi, heç kəsin qaçıb qurtarmağa macalı olmadı. Sonra, bu əsirləri götürüb Korunzora Hacı Ağalar bəyə qonaq getdilər. Oradan bir fəthnamə yazıb polkovnik Nazimkanı və mayor Kovalenskini, sair zabitlər və əsir edilən soldatlarla Fətəli şahın hüzuruna göndərdilər. O zaman şah, qoşunu ilə birlikdə Ərdəbildə idi. Qarabağlı Mehdiqulu xan və sərdar Əmir xan Naxçıvandan yola düşüb gəldilər. Korunzorda şahzadəyə yetişdilər. Səhər vaxtı köçərək, Mehdiqulu xanı dağlıq yerlərdən, kürd obaları içindən yola saldılar. Şahzadə Çanaxçıda olan rus qoşununu məhv etmək üçün oraya getməyi qərara aldı.

Araz kənarında qazaqlar öldürüldüyü zaman Mehdiqulu xanın Vərəndə mahalında sakin olan qardaşı Süleyman bəy, sair əqrəbası ilə dönüklük və xəyanət etdi. Bu zaman polk komandiri general Reutt cəld tərpənib qoşunu Qalaya (Şuşaya) daxil etdi[2].

Zərgər, Darağoz və sair ətrafda olan Cavanşir elatı, ağruq[3] gətirənlərə macal verməyib Ağoğlanı, qoşunun vəsait və ləvazimatını talan etdilər. O zaman mən də qoşun üçün azuqə göndərmişdim. Onlar azuqə aparanların yüklü ulaqlarını da çal-çap edib apardılar.

Şahzadə oradan Gorus yolu ilə Çanaqçıya getmək fikrində idi. Bu əhvalatı eşidib Qalaya tərəf hərəkət etdi. Bir mənzil qalmış yürüşə başladı. Qalanın bir güllə mənzilliyinə, hətta barısı və hasarı altına yetişmiş olduğu halda, yenə məqsədinə çatmayıb geri qayıtdı; çünki polkovnik və komendantın möhkəm tədbirləri onu naümid edib, (geri) qayıtmağa məcbur etdi. Bir para ermənilər də şuşa-kəndli Səfər yüzbaşını görürüb, Qalanın cənub tərəfində olan Xəzinə qayasında səngər qayırıb oturdular. (Şahzadənin əsgərləri) onların səngərini almaqdan aciz qaldılar. Lakin şəhərdən başqa Qarabağ əhalisi,

---

1 Gorusdan Şuşaya gedən Rusiya qoşunları dəstəsinə vurulan zərbə haqqında bax: Abbas Mirzə tərəfindən göndərilmiş və 1926-cı il 25 iyulda Təbrizdə elan edilmiş məlumat (AKAK, cild VI, h. II, sənəd 650, səh. 356-357). Müqayisə et: N.Dubrovinin yuxanda göstərilən əsəri, c. VI, səh. 624.

2 42-ci Yeger polkunun komandiri polkovnik Reutt doqquz rotadan ibarət olan Qarabağdakı polkunun beş rotası ilə Şuşa qalasında sığınaq etmişdi. Bu qala bir az sonra, 1826-cı il iyulun 25-dən başlayaraq İran qoşunlarının əsas qüvvələri tərəfindən mühasirəyə alınmışdı. B a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 30 iyul tarixli raport (AKAK, c. VI, h. II, sənəd 651, səh. 357). Müqayisə et: N.Dubrovinin yuxarıda göstərilən əsəri, c. VI, səh. 635.

3 Ağruq - qoşunun çadır, azuqə və sair ləvazimatı deməkdir.

bütün bəylər, sultanlar və məliklər xanın yanına və Naibüssəltənənin hüzuruna gedib, əmr və nəhyini yerinə yetirdilər[1]. Gözəl xələtlər aldılar və bollu nemətlərlə başı uca oldular. Qızılbaş və Qarabağ qoşunlarını götürüb şəhəri üzük qaşı kimi ortaya aldılar. Hər gün dava və müharibə (ilə məşğul olub) bir saat müqavimət və çarpışmadan əl çəkmirdilər. Bu zaman rus qoşunu Talış vilayətindən çıxdığı üçün Talış xanları itaət boyunduruğunu öz boyunlarından atdılar[2]. Talış hakimi Mir Həsən xan öz qardaşlarını buraya, şahzadənin[3] hüzuruna göndərmişdi. Şirvanlı Mustafa xan da Şirvana getdi. Şirvan əhalisi onun hiyləsinə aldanıb itaətini qəbul etdi. Üsyan havası ilə dönüklük nağarasının səsini ucaltdılar[4]. Rus qoşunu ilə dəfələrlə müharibə etdi. Axırda ruslar Şirvan kəndlərində olan əsgər və tərəfdarlarını toplayıb, Quba tərəfinə getdilər. Mustafa xan da müstəqil olaraq xanlıq taxtına təkyə etdi və köhnə Şamaxıda oturdu. Şəkidəki rus böyükləri də Şəkini boşaldıb Tiflisə getdilər[5]. Səlim xanın oğlu Hüseyn xan da gedib Şəkidə xanlıq taxtında müstəqil oldu. Zurnabadda olan qoşun gəncəlilərdən xahiş etdi ki, onlara izn versinlər Gəncədən keçib Tiflisə getsinlər. Gəncə əhalisi əhva-

---

1 Öz rahatlıqlarını xan hökmranlığının bərpası ilə əlaqədar etmiş bəylərin bir hissəsi İran qoşunları tərəfinə keçdi. İrana tərəf keçən bəylərin bu hissəsinə onlara bağlı olan nökərlər və maafların bir hissəsi də qoşulmuşdu. Kəndlilərin əsas kütləsi isə İran qoşunlarına düşmən idi.

Yerli əhalinin Rusiya qoşunlarına olan xeyirxahlığını şişirtməyə heç də mail olmayan A.P.Yermolov general Paskeviçə göndərdiyi öz əmrlərinin birində qeyd etmişdir: Tatarlardan (azərbaycanlılardan - V.L.) bir çoxları ya xəyanətdə iştirak etmirlər, ya da məcburi olaraq bu xəyanətə sövq edilirlər. Onların hamısı cidd-cəhdlə qulluq edəcəklər, yaxud heç olmasa ərzaq toplanışı işində yardım göstərəcəklər". General Yermolovun general-adyutant Paskeviçə göndərdiyi 1826-cı il 4 sentyabr tarixli məktub (AKAK, c. VI, h. II, sənəd 676, səh. 373).

2 Talış xanı Talış xanlığında olan Kaspi dəniz batalyonu postları üzərinə hücum etmiş və onlara olduqca böyük tələfat vermişdi. B a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 30 iyul tarixli raport (AKAK, c. VI, h. II, sənəd 651, səh. 357).

3 Burada Abbas Mirzə nəzərdə tutulmuşdur.

4 Mustafa xanın Şirvana girməsi haqqında bax: AKAK, c. VI, h. II, sənəd 651, səh. 357. Şirvanda Rusiya qoşunlarına qarşı olan üsyanda iştirak edənlər, öz rahatlıqlarını xanlar hökmranlığında görən ayrı-ayrı əhali qrupları idi. Kəndli kütlələri isə nə Mustafa xana və nə də onunla gələn İran qoşunlarına yardım edirdilər.

5 Şəki rayonunda yerləşən iki rotanın geri qaytarılması haqqında b a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 13 avqust tarixli məktub (AKAK, c. VI, h. II, sənəd 661,səh. 362).

latdan xəbər tutan kimi, onlara mane oldu. Rus qoşunu geri qayıtdı. Uğurlu xan da gəlib Gəncədə xan oldu. Knyaz Səvirzə mirzə (Savarsamidze) Pənbək[1] və Şoragildən çıxdıqdan sonra, Hüseyn xan[2] və Həsən xan[3] İrəvan tərəfindən gəlib, Rusiya hökumətinə aid dam-daşı yıxıb od vurdular və oralara yiyələndilər[4]. Hətta Həsən xan gedib Borçalı mahalında Künçik altında yaşayan nemesləri soyub çox əsirlər gətirdi. Qızılbaşlar hər gün yalan şayiələr çıxarıb deyirdilər ki, sərdar general Yermolov Tiflisi boşaldıb Rusiyaya getmək istəyir, Madatovdan da bir xəbər yoxdur.

Mənim qasidim gəlincəyə qədər belə keçdi. Sonra o, gəlib xəbər gətirdi: "Sərdar Yermolov Tiflisdə çox vüqar və arxayınlıqla oturmuş, Madatov da külli qoşunla Rusiyadan gəlmişdir. Deyirlər ki, onun ixtiyarında olan əsgərlər padşahın öz xüsusi alaylarındandır".

Bu xəbərləri eşitdikdən sonra, qızılbaşlar qəflət yuxusundan ayıldılar. Naibüssəltənə vəliəhd Məhəmməd Mirzəni, dayısı Əmir xan sərdarı və Nəzərəli xanı külli qoşunla göndərdi ki, gedib Gəncədə dursunlar. Tam ehtiyatla qalanı möhkəmləndirib hüdudları qorumaqla məşğul olsunlar.

Burada, əvvəla, Qala (Şuşa) mühasirə olunduqdan bir neçə gün sonra, vəliəhd öz hüzuruna yaxın olan adamlardan Bicən xanı ümid, müjdə və nəvazişlər vədilə Qalaya (Şuşaya) göndərdi ki, şəhəri təslim etsinlər. Ondan sonra mayor Qlukini (Klugenaunu)[5] Qaladan göndərdilər. Xülasə, çox müşavirə və hədsiz danışıqlardan sonra belə qərara gəldilər ki, komendant mayor Çilyayevi bir kapitanla girov versinlər. Mayor Klugenaunu bir yüzbaşı ilə birlikdə sərdar Yermolovun hüzuruna göndərdilər ki, qalanı təslim etməyə razı olsun. Sərdar Yermolov da cavabında yazdı: "Rus dilində kapi-

---

1 Polkovnik knyaz Savarsamidze Pənbək və Şoragil distansiyalarının rəisi idi. İran ordusunun böyük qüvvələrinin 1826-cı il iyul ayında etdikləri hücum zamanında rus dəstələri sərhəd postlarını tərk etməyə məcbur oldular.

2 Hüseyn xan İrəvan sərdarı idi.

3 Həsən xan sərdar Hüseyn xanın qardaşı idi.

4 Rus qoşunlarının Penbək və Şoragildən Gəncəyə (Yelizavetpola) geri çəkilmələri və İran sərdarı Hüseyn xanın hərəkatı haqqında b a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 12 sentyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 681, səh. 375).

5 Mayor Klugenaynun Abbas Mirzə ilə etdiyi müzakiratın müfəssəl mətni N.Dubrovinin "История войны и владичество русских на Кавказе" adlı əsərində dərc edilmişdir (c.I, SPb, 1888 səh. 637-639).

tulyasiya yoxdur; çünki kapitulyasiya fransız dilində qalanı təslim etməyə deyilir".

Mayor özü orada qalıb kağızı İbrahim adlı bir yasavulla göndərdi. Burada kağızı tutub vermədilər. Bu əsnada Allahyar xan çoxlu əsgərlə gəlib şahzadənin qoşunu ilə birləşdi. Yenə yürüş binası qoydular. Lakin bir nəticə hasil olmadı. Şəhərin ətrafında düşdülər. Bu əsnada, Əmir xan sərdarın Madatovla müharibə etməsi, öldürülməsi və qoşununun sınması (xəbəri)[1] şahzadəyə çatdı. Köç edib Ağdama yetişdi. Oradan komendantı[2] və məni Təbrizə göndərdi. Mehdiqulu xanı Qarabağda qoyub özü Gəncə tərəfinə getdi. Madatov Əmir xan sərdarı öldürüb Gəncəyə girdi[3]. Ardınca sərdar Paskeviç öz qoşunu ilə gəlib, onlara yetişdi. Qızılbaşlar çəkilə-çəkilə gəlib Gəncə torpağına girdilər. Yük və çadırlarını Kürək çayında qoydular. Yalnız atlı və serbazları götürüb Gəncə vilayətində olan Zazalı çayının üstündə gecəni keçirdilər.

Səhər vaxtı sərdar Paskeviç və general Madatov qoşunlarına nizam verib Şeyx Nizami türbəsinə yaxınlaşdılar. Qızılbaş qoşunu ilə üz-üzə gəldilər. Burada böyük, sultani bir müharibə oldu. Bir saatdan sonra qızılbaşlar basıldılar[4]. Məğlubiyyətin qabağını almaq

---

1 Mirzə Adıgözəl beyin qeyd etdiyi vuruşma rus qoşunları ilə İran qoşunları arasında 1826-cı il sentyabrın 2-də Şamxor çayının sağ tərəfində baş vermişdir. Abbas Mirzənin oğlu Məhəmməd Mirzənin və sərdar Əmir xanın başçılığı altında olan qoşunlar 2 min mütəşəkkil piyadadan və 8 min atlıdan ibarət idi. Bu qoşunlar general-mayor Madatovun komandası altında olan min beş yüz nəfər rus əsgəri tərəfindən darmadağın edildilər. İntizamsız bir halda qaçan İran qoşunlarının təqibində Qazax rayonunun atlıları da iştirak edirdilər. Bu atlılar İran qoşunlarına böyük tələfat verib çoxlu qənimət aldılar. B a x: General Yermolovun çara yazdığı 1826-cı il 7 sentyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 677, səh. 373, 374).

2 Yuxarıda adı çəkilən mayor Çilyayev.

3 İran qoşunları Şamxor yaxınlığında məğlub olandan sonra Gəncəni tərk etdilər. General Madatov sentyabrın 4-də bir güllə belə atmadan Gəncəni işğal etdi. B a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 7 sentyabr tarixli raport (AKAK, c VI, h. II, sənəd 678, səh. 374).

4 Şahzadə Abbas Mirzənin riyasəti altında olan İran qoşunları və general Paskeviçin komandanlıq etdiyi rus qoşunları arasında vaqe olan şiddətli vuruşma 1826-cı il sentyabrın 13-də Gəncənin yaxınlığında Nizami məqbərəsi yanında baş vermişdir. Bu müharibədə qırx min nəfərlik İran ordusu on min nəfərlik rus dəstələri tərəfindən məğlub edildi. İran ordusu bu məğlubiyyətdən sonra Şuşanın mühasirəsindən əl çəkib Araz çayının o tərəfinə qaçdı. B a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 30 sentyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 690, səh. 380).

mümkün olmayıb qaçdılar. Bir gün bir gecədə Arazdan keçdilər. (Onların) iki topu Tərtər çayı ilə İncə çayı arasında qalmışdı. Arazdan keçdikdən sonra, yenə tab gətirməyib dağıldılar. Şah o zaman Ərdəbildən köçüb gəlmiş və Əhərin yaxınlığında olan Təviləyi-Şam adlı yerdə durmuşdu. Naibüssəltənə şahın hüzuruna getdi. Sərdar Paskeviç də gəlib bir müddət Təxti-Tavusda qaldı və istirahətlə məşğul oldu. Mustafa xan Şirvanda, Hüseyn xan da Şəkidə idilər. Hüseyn xanın qardaşı Hacı xan Şəki qoşunlarını toplayıb, Kür çayından keçdi. Mənim bir obamı və iki padşahlıq obasını qarət etdi. Sonra Mustafa xan özbaşına Şirvandan keçib Qaradağa öz evinə getdi[1]. Hüseyn xan isə, haman yerdə durmuşdu. Sərdar bu tərəfdən qoşun ilə gəlib Nuxanın üç ağaclığına çatdı. Hüseyn xan qarşı durmağa və müdafiəyə taqəti olmadığını görüb qaçdı. Arazdan keçib İrana qaçdı[2]. Sərdar Paskeviç də Arazdan keçdi, gedib Qaradağ ölkəsini qarət edərək çoxlu əsir gətirdi[3]. Qarabağda xalqı yerbəyer və sakit etdi. Artıq qoşununu götürüb Tiflisə yola düşdü. Sonra Madatov Qaradağ[4] və Şirvanat qoşununu cəm etdi və soldatlarını götürüb Mişkinədək getdi[5]. Çoxlu qarət edib Şahsevən xanlarını

---

1 Gəncə yaxınlığında müharibədə məğlub olmuş və Araz çayının o tayına qaçmış İran ordusu özünün Quba və Şirvan vilayətlərində olan dəstələrinə kömək etmək üçün bir daha bu tərəfə gəlməyə cəsarət etmədi. Quba vilayətində olan şahzadə Şeyx Əlimirzə və şirvanlı Mustafa xan, yolların ruslar tərəfindən kəsiləcəyindən qorxaraq sentyabrın 24-də Quba torpaqlarını tərk edərək İrana qaçdılar. B a x: General Yermolovun çara yazdığı 1826-cı il 21 oktyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 694, səh. 383).

2 General Yermolov Kaxetiyadan toplanmış rus qoşunları ilə Alazan çayından keçərək 1826-cı il oktyabrın 19-da Nuxa şəhərinə daxil oldu. Rus qoşunlarının yaxınlaşmasını eşidən Nuxa xanı İrana qaçdı. B a x: General Yermolovun çara yazdığı 1826-cı il 21 oktyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 694, səh. 383). General Yermolov bu raportunda Şəki vilayəti əhalisinin İran qoşunlarına qarşı münasibətindən bəhs edərək belə yazır: "Şəki vilayətində bəylərin çox hissəsi alçaqcasına xəyanət etməkdə müqəssirdirlər. Lakin qara camaat (Abbas Mirzə tərəfindən göndərilmiş - V.L.) xanın qovulmasından sevinirlər. Əhalinin əhval-ruhiyyəsi başqa vilayətlərdə də belədir".

3 Abbas Mirzənin qoşunlarını Araz çayından uzaqlaşdırmaq məqsədilə general Paskeviç oktyabrın 25-də Arazın sağ tərəfinə keçdi. Rus qoşunları altı gündən sonra, yəni oktyabrın 31-də Arazın sol tərəfinə qayıtdılar. B a x: General Yermolovun çara göndərdiyi 1826-cı il 14 noyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 698, səh. 385).

4 Mətndə səhv getmişdir, "Qarabağ" olmalıdır.

5 M i ş k i n - İran Azərbaycanı şəhərlərindən birinin adıdır.

itaətə gətirdi. Xəyanət fikrinə düşməmək üçün onlara and içdirdi[1]. İran məmləkətinə bir vəlvələ düşdü. Təbriz şəhərində müdafiə işləri görüldü[2]. "Rus qoşunu gəlir" sözü ağızlarda söylənməyə başladı.

Bu zaman biz Təbrizdə dustaq idik. Şəhərin vəziyyətindən və əhalisinin hal və hərəkətindən anlaşılırdı ki, əgər general Madatov gəlsə idi, qorxu və davasız Təbrizi ala bilərdi. Bu halda Madatovun qayıtmaq xəbəri onlara çatdı. O camaata çox şadlıq üz verdi. Madatov qayıdıb Tiflisə hərəkət etdi. O, tədarük və hazırlıq görürdü ki, bahar fəsli İran tərəfinə getsin. Sərdar Yermolov da lazımi tədarüklərlə Madatovu İran səfərinə yola saldı. Madatov Xudafərin körpüsünə qədər gəlmişdi. Qızılbaşlar da (onu) qarşılamış və dava qızışmışdı. Bu zaman Yermolov sərdarlıqdan götürüldü. Paskeviç[3] müstəqil olaraq sərdarlıq taxtında oturdu. Polkovnik knyaz Abxazovu[4] bu şəhərlərə hakim təyin etdi. General Madatov isə, hökmü altında olan ordunu general Pankratiyevə[5] tapşırdı. Abxazovu ştab naçalniki təyin etdi. Tiflisdən (çıxıb) beş günə Xudafərin körpüsündə orduya yetişdi. O gecəni qalıb işləri Madatovdan (təhvil) aldı. Səhəri Madatovu Tiflisə yola saldı. Qoşunu köçürüb qayıtdı. Gəlib Qozluçay adlı yerə çatdı. Sərdar Paskeviç isə lazımi təda-

---

1 1826-cı il dekabrın 28-də rus qoşunlarının bir dəstəsi general-leytenant Madatovun komandanlığı ilə Araz çayını keçdi. Bu dəstənin içində Qarabağ və Şirvan atlıları da var idi. Bu qoşun Mişkin qəzasında olduğu zaman Mişkin qəzasənən hakimi şahsevənli Əta xan, Şeqaqi xalqının nümayəndələri, Qarabağ xanlığının hörmətli ağsaqqalları və qaraqoyunlu Məhəmməd xanın Qaradağda yaşayan oğlu knyaz Madatovun yanına gələrək rus himayəsi altma alınmalarını xahiş etdilər. Rus qoşunlarının bu dəstəsi 1827-ci il yanvarın 16-na qədər Qaradağ xanlığında qaldı və sonra Arazı keçərək Qarabağa qayıtdı. B a x: General Yermolovun çara yazdığı 1827-ci il 12, 20 və 26 yanvar tarixli raportlar (AKAK, c. VI, h. II, sənəd 703-705, səh. 387-389).

2 Yenə orada.

3 General İ.F.Paskeviç 1827-ci il mart tarixli fərman üzrə əhaliddə Qafqaz korpusu komandanı, Gürcüstan, Astraxan və Qafqaz vilayətləri mülki və sərhəd işləri idarəsi rəisi vəzifəsinə təyin edilmişdir. B a x: Çarın dövlət senatına göndərdiyi 1827-ci il 28 mart tarixli fərman. SPb (AKAK, c. VII, sənəd 2, səh. 1).

4 Knyaz Abxazov general Madatovun yerinə Qarabağ, Şəki və Şirvan vilayətləri idarəsi rəisliyinə 1827-ci ilin aprel ayında təyin edilmişdir.

5 General-mayor Pankratiyev artıq 1827-ci ilin may ayında Qarabağ qoşunları komandanı idi. B a x: General Paskeviçin Ağzıböyük postundan çara yazdığı 1827-ci il 17 may tarixli 17 nömrəli raport (AKAK, c. VII, sənəd 507, səh. 542).

rüklərlə İrəvan torpağına hərəkət etdi[1]. İrəvan sərdarı bütün elatı köçürtdü. Yalnız qardaşı Həsən xanı Sərdarabad[2] və İrəvan qalalarını mühafizə etməkdən ötrü qalada qoydu. Özü isə ətrafda dolanmaqda idi. Bu əsnada, Dəralagözdə olan Qarabağ hakimi həmail sahibi general-mayor cənab Mehdiqulu xanla Paskeviç arasında gəliş-gediş oldu. Mehdiqulu xan İran dövlətindən üz çevirib bu işıqlı dövlətin itaətinə gəlmək istəyirdi. Knyaz Abxazov Pankratiyevlə müşavirə etdi. İki batalyon qoşun götürüb Mehdiqulu xanın yanına getdi. İki dövlətin sərhədində olan Ağ karvansarada görüşdülər. Knyaz onu xatircəm etdi. Ona qoşulan və tabe olan adamları köçürməklə məşğul oldu[3]. O vaxt naxçıvanlı Ehsan xan Abbasabad qalasının mühafizi idi. Mənim orada olduğumu bilib yanıma bir qasid göndərdi. O mənə xəbər verdi: "Knyaza bildirin ki, bu tərəfə hərəkət etsin, buraya gələn kimi qalanı ona təslim edərəm".

Bunlar da (məsələni) ətraflı surətdə müzakirə etdilər. Sərdarın izni olmadığından cəsarət etməyib keyfiyyəti sərdarın hüzuruna ərz etdilər. Özləri Qarabağa gəldilər. Uca nəsilli sərdar bu xəbəri eşidən kimi İrəvandan əl çəkib Abbasabad tərəfinə hərəkət etdi. Bu xəbər Qızılbaş dövləti başçılarının qulağına çatdı. Qacar Məhəmmədəmin xanı neçə min nəfər qoşun, Bəxtiyari[4] sərbazları və bir neçə nəfər xanla Abbasabad qalasına[5] göndərdilər. Abbasabad qalasının ixtiyarı Ehsan xandan alındı. Sərdar gəlib Abbasabadı mühasirə etdi. Bir neçə gündən sonra Naibüssəltənə çoxlu əsgərlə o

---

1 General Paskeviç artıq 1827-ci ilin iyun ayında öz qoşunları ilə İrəvanın yaxınlığına çatmışdı. B a x: General Paskeviçin Eçmiədzindən qraf Nesselroda yazdığı 1827-ci il 18 iyun tarixli 90 nömrəli təliqə (AKAK, c. VII, sənəd 511, səh. 548).

2 Sərdarabad qalasının müdafiəsi və qalanın 1827-ci il 19 sentyabrda rus qoşunları tərəfindən alınması haqqında. B a x: General Paskeviçin təliqəsi (AKAK, c. VII, sənəd 1518, səh. 561).

3 Mehdiqulu xanın Qarabağa qayıtması və Mirzə Adıgözəl bəyin bu işdə olan xidməti haqqında. B a x: General Paskeviçin Eçmiədzindən qraf Dibiçe yazdığı 1827-ci il 12 iyun tarixli 62 nömrəli raport (AKAK, c. VII, sənəd 402, səh. 453, 454).

4 Bəxtiyari - İranda yaşayan tayfalardan birinin adıdır.

5 Abbasabad qalası Araz çayının kənarında Naxçıvanın 10 verstliyində idi. Naxçıvanlı Ehsan xanın və təbrizli Məhəmmədrza xanın komandası altında olan 3 min nəfərlik qarnizon bu qalanı müdafiə edirdi. Onların hər ikisi şahın kürəkəni baş komandan Məhəmmədəmin xana tabe idilər. B a x: General Paskeviçin Abbasabaddan çara göndərdiyi 1827-ci il 4 aprel tarixli raport (AKAK, c. VII, sənəd 513, səh. 550).

tərəfdən görünməyə başladı[1]. Sərdarın əmrinə görə, əvvəl süvari qazaqlar, sonra da soldatlar Arazdan keçdilər. Düşmənlə müharibə etdilər, Abbas Mirzə basıldı[2]. Rusiya qoşunu qayıdıb qalanın dörd tərəfindən yürüş etdi. Xəndəklər qazıyıb lağımlar atdılar. Qala əhalisi şahzadənin köməyindən məyus oldu. Onlar lağımların yaxınlaşdığını görüb Ehsan xanı da özlərinə xain hesab etdiklərindən, qalanı təslimə razı oldular. Sərdar Paskeviç qalanı aldıqdan sonra toplarını və sair hərbi sursatını öz ixtiyarına aldı[3]. Qalada olan Məhəmmədəmin xanı, sair xanlar və sərbazlar ilə əsir edib Qarabağ yolu ilə Tiflisə göndərdi. Ehsan xana da xidmətinin müqabilində, Naxçıvan qalasının naibliyini mərhəmət etdi. Hava həddindən artıq isti olduğundan qalada kutval (qalabəyi) qoyub özü Qarababa yaylağına köçdü və orada yerləşib oturdu.

Sonra Abbas Mirzə eşitdi ki, qalaları kökündən yıxmaq üçün böyük toplar gətirirlər. Məktublar yazdı, Araz çayının o tərəfindən yürüş edib, çaydan keçdi. Avaran adlı yerdə Rusiya qoşunu ilə sultani bir müharibə oldu[4]. Hər iki tərəfdən igidlik və rəşadət göstərildi. Susuzluq soldata çox əziyyət verdi. (Bu vuruşmada) hətta general Krasovskiyə də bir neçə güllə dəydi. Şahzadə bununla kifayətləndi, şadlıq və sevinclə (geri) qayıtdı. Seyr və səfa yeri olan Xoy şəhərinə yola düşdü.

Bu zaman sərdar Paskeviç Qarababa yaylağında bu qorxunc hadisəni eşitdi. Öz zəfər nişanəli əsgərlərinin ağır yüklərini və ava-

---

1 İran ordusunun mühüm bir hissəsi Araz çayının sağ tərəfində Abbasabad qalasının qabağında 1827-ci il aprelin 5-də göründü. B a x: General Paskeviçin Abbasabaddan çara göndərdiyi 1827-ci il 7 iyul tarixli raport (AKAK, c. VII, sənəd 515, səh. 551).

2 Vuruşma Araz çayının sağ tərəfində Cavan bulağı yaxınlığında əmələ geldi. Abbas Mirzənin komandanlığı altında olan 16 min nəfərlik İran ath qüvvələri məğlub oldular. B a x: General Paskeviçin Abbasabaddan çara yazdığı 1827-ci il 7 iyul tarixli raport (AKAK, c. VII, sənəd 515, səh. 551).

3 Abbasabad qalası 1827-ci il iyulun 7-də rus qoşunlarına teslim edildi. Qalada olan 18 top rusların əlinə keçdi. B a x: General Paskeviçin yuxarıda göstərilən raportu (AKAK, c. VII, sənəd 515, səh. 552).

4 General-leytenant Krasovskinin dəstəsi ilə Abbas Mirzənin qoşunları arasında vuruşma 1827-ci il avqustun 17-də, Krasovskinin dəstəsi Eçmiədzinə getdiyi zaman, yolun Abaran çayına yaxınlaşdığı yerdə baş vermişdir. Bu vuruşmada Krasovskinin dəstəsi çoxlu tələfat vermişdi. B a x: General Paskeviçin 1827-ci il avqust ayında çara yazdığı raport (AKAK, c. VII, sənəd 517, səh. 560).

danlığını orada qoyub dava meydanına hərəkət etdi. Sərdar yetişincəyə qədər şahzadə hərəkət cilovunu çevirib (getmişdi). Sərdar oradan topları götürüb əvvəl Sərdarabad tərəfinə üz qoydu. Od yağdıran topların zərbəsilə onun bürc və barılarını tar-mar edib qalanı aldı. Sərdarabadda hədsiz ərzaq, pambıq və sair hərbi sursat ələ keçdi[1]. Oradan asudə olduqdan sonra, İrəvan tərəfinə hərəkət etdi. Keçmiş qayda ilə, bir neçə gün atəş püskürən toplar ildırım yağdırdılar. Şəhərin divarını alt-üst edib bir ovuc külə çevirdilər. Şəhər əhalisi çox çalışıb-çapaladı, bir fayda vermədi. Axırda Həsən xan və sair İran əmirləri tutuldular[2]. İrəvan işlərini yoluna qoyduqdan sonra, qoşunu toplayıb yeriyən atlarını yel kimi Xoy tərəfinə sürdülər. Knyaz Eristovun komandanlığı altında olan Qarababa yaylağındakı qoşuna, icrası vacib və lazım olan bir hökm verdi ki, tər tökərək at başı salıb təcili surətdə Təbriz tərəfinə getsinlər[3].

Özü gedib Xoy vilayətini aldı. Bu zaman knyaz Eristov da davasız-döyüşsüz və qan tökmədən Təbriz sahəsini zəfər bayrağının mahçəsi

---

1 Rus qoşunları Sərdarabad qalasını mühasirə etdikləri zaman mühasirə toplarından istifadə etmişdilər. Bu toplar vasitəsilə qalanın dördguşəli orta bürcünü dağıtmış və qala divarını zədələmişdilər. İran qarnizonu sentyabrın 19-da qaçmaq fikrinə düşdü, lakin rus qoşunlarının hücumuna məruz qalaraq bir hissəsi qırıldı, qalanları da əsir düşdü. Sərdarabad qalasında 13 top, içində 14 min çetvert buğda olan bir anbar, çoxlu pambıq və külli miqdarda bant və güllə rus qoşununun əlinə keçdi. B a x: General Paskeviçin Sərdarabaddan çara göndərdiyi 1827-ci il 21 sentyabr tarixli raport (AKAK, c. VII, sənəd 521, səh. 563).

2 İrəvan qalasının mühasirəsi və ələ keçirilməsində əsas rolu rus mühasirə topları oynamışdır. Bu topların atəşi nəticəsində qalanın divarları bir neçə yerdən sökülmüş və şəhərin içində mühüm təxribat əmələ gəlmişdi. İrəvan əhalisi şəhəri müdafiə etmək istəmirdi, ilk dəfə ağ yaylıqları qala divarları üstündə yerli əhali qaldırdı. İrəvan 1827-ci il oktyabrın 1 -də alındı. Qalada 48 müxtəlif top, əlliyə yaxın falkozer (kiçik top) ələ keçirildi. B a x: General Paskeviçin İrəvandan çara yazdığı 1827-ci il 3 oktyabr tarixli raport (AKAK, c. VII, sənəd 523, səh. 564).

3 Knyaz Eristovun dəstəsi 1827-ci il sentyabrın 11-də Mərənddən çıxıb Təbrizə tərəf yola düşdü. Knyaz Eristov Azərbaycan əhalisinin rus qoşunlarına bəslədikləri münasibət haqqında belə yazmışdrr: "Hər yerdə əhali bizim qoşunları düşmən deyil, öz himayəçisi kimi qarşılayırdı. Onlar böyük dəstələrlə bizim qoşunu pişvaz edir və adətləri üzrə öküzləri qurban kəsirdilər". B a x: General Paskeviçin Mərənddən çara göndərdiyi 1827-ci il 16 oktyabr tarixli raport (AKAK, c. VII, sənəd 526, səh. 568).

(ayparası) ilə işıqlandırdı[1]. Abbas Mirzənin qoşunu dağıldı. Özü isə çox xəcalətli bir halda Marağa hüdudunda vaxt keçirməkdə idi.

Sərdar Paskeviç (artıq) Dehxarqana daxil olmuşdu. Abbas Mirzə hərçənd bir çox tədbirlər düşündü, lakin bundan başqa bir çarə taprnadı: bir neçə adamla sərdarın hüzuruna getdi. Sərdar da ona böyük izzət və hörmət göstərdi. Uzun müddət bir yerdə qaldılar. Sərhəd, barışıq və təzminat barəsində aralarında danışıq və müşavirələr oldu. Şah vaxtı uzatmaq məqsədilə bəzi təkliflərə razı olmadı. Axırda bunlar bir-birindən ayrıldılar. Sərdar Təbrizə daxil oldu. Abbas Mirzə də öz məmləkətinə getdi. Aralarında möhkəm bir əlaqə var idi. Sərdara da məlum idi ki, sülhün binasını yıxan ancaq şahdır. Bundan sonra sərdar vilayətlərə, özünün qalib və sədaqətli qoşunlarına məktublar yazıb onları yığdı (digər tərəfdən də), səs saldı ki, mən Tehrana - paytaxt olan bu şəhəri fəth etməyə gedəcəyəm. Naibüssəltənə də öz atasına məktub yazıb, əhvalatı bildirdi. Məlum etdi ki, sərdar nagəhan bir bəla kimi üstünə gəlir. Axırda şah çarəsiz qalıb sülhə razı oldu. Türkmənçay adlı yerdə sülh oldu. Araz çayını iki uca dövlət arasında sərhəd təyin etdilər. (İran dövləti) yeddi kürur[2] dava xərci verməyə razı oldu. Bir neçə şərtnamə və əhdnamələr bağladılar. Dava xərci ödənincəyə qədər, Xoy vilayətini rəhn və girov saxladılar[3]. Təyin edilmiş dava xərci alındıqdan sonra, seyr və

---

1 Təbriz əhalisi şəhərin ahnmasında rus qoşunlarına kömək edirdi. Rus qoşun hissəsi komandanı knyaz Eristov, təbrizlilərin ruslara qarşı müqavimət göstərmədikləri və şəhəri müdafiə etmək istəmədikləri haqqında belə yazmışdır: "Şəhəri idarə etmək üçün göndərilmiş şahın birinci vəziri və kürəkəni olan Allahyar xan əhalini və orada olan iki batalyon sərbazı müdafiəyə məcbur etmək məqsədilə bütün vasitələrə əl atırdı. Nəhayət, camaata zülm etməyə başladı. O, xalqın burun-qulağını kəsirdi, gözlərini çıxartdırırdı. Lakin onun bütün səyi boşa çıxdı. Rus qoşunları 1827-ci il oktyabrın 13-də döyüşsüz Təbriz şəhərinə girdi və çoxlu qənimət aldı, o cümlədən 40 müxtəlif top, mindən artıq tüfəng, on mindən artıq qumbara və çoxlu top gülləsi ələ keçirdi. B a x: General Paskeviçin Mərənddən çara göndərdiyi 1827-ci il 16 oktyabr tarixli məktub (AKAK, c. VII, sənəd 526, səh. 568, 569).

2 Kürur - rus gümüş pulu hesabı ilə 2 milyon manata bərabərdir.

3 Türkmənçay müahidəsində müəyyən edilmiş təzminatın ödənilməsini təmin etmək üçün Urmu və Xoy şəhərinin rus qoşunları tərəfindən girov götürüldüyü haqqında qraf Paskeviçin Abbas Mirzəyə yazdığı 1827-ci il 16 aprel tarixli 17 nömrəli məktubuna bax (AKAK, c. VII, sənəd 579, səh. 614). Yenə o barədə qraf Paskeviçin Abbas Mirzəyə yazdığı 1828-ci il 29 may tarixli 54 nömrəli məktubuna bax.

səfa yeri olan Xoy vilayətini İran dövləti mübaşirlərinə (məmurlarına) tapşırdılar. Uca nəsilli, şan-şərəf və iqtidar sahibi sərdar qoşununu götürüb, Darüssürura (Tiflisə) hərəkət etdi[1]. Bu zaman osmanlı dövləti tərəfindən dava başlandı[2]. Sərdar onlara qarşı tədarük görməklə məşğul oldu.

Allah qoysa, bu Dağıstan hadisələri, əzəmətli və əbədi dövlət adamlarının arzu etdikləri kimi yazılıb qurtarar. Sonra osmanlı əhvalatı və hadisələri haqqında ənbər qoxan qələmimin ahusu kağızın geniş sahəsində müşklər səpməyə başlayar və bu (mövzunu) ayrı bir cilddə müfəssəl surətdə qələmə alar...[3]

SONUNCU FƏSİL

## ƏSƏRİN MÜƏLLİFİ KAPİTAN MİRZƏ ADIGÖZƏL BƏYİN TƏRCÜMEYİ-HALI

Bu əsərin müəllifi - kapitan Mirzə Adıgözəl bəy bin Haqverdi bəy bin Adıgözəl ağa öz tərcümeyi-halını bu cür yazır: Qarabağda anadan olmuşam. Şuşa məktəbində oxuyurdum. Bu zaman Ağa Məhəmməd şah Şuşa qalasının üstünə gəlib mühasirəyə aldı[4]. El və camaat ilə köçüb Gürcüstan vilayətinə pənah apardıq. O zaman mərhum vali İrakli xan bizlərə hörmət etdi. San Kilsə adlı yerləri qışlaq və əkənəcək üçün bizlərə verdi. Azuqə və toxumla təmin etdi.

---

1 Türkmənçay müahidəsi bağlanandan sonra general Paskeviç Tiflisə getdi. General Paskeviç 1828-ci ilin aprel ayında Tiflisdə idi. B a x: General Paskeviçin Abbas Mirzəyə yazdığı 1828-ci il 16 aprel tarixli 17 nömrəli məktub (AKAK, c. VII, sənəd 579, səh. 614). Rus qoşunları Xoy şəhərini 1828-ci ilin axırlarında tərk etdilər.

2 Zaqafqaziya tərəfindən türklərə qarşı hərbi əməliyyat 1828-ci il iyun ayının 14-də başlandı. B a x: Qraf Paskeviçin Qars qalası düşərgəsindən çara yazdığı 1828-ci il 19 iyun tarixli raport (AKAK, c. VII, sənəd 753, səh. 748).

3 Rusiya-Türkiyə müharibəsi 1829-cu il sentyabrın 2-də Adrianapolda bağlanmış traktatla qurtardı. Hərbi əməliyyatlar isə Zaqafqaziyada 1829-cu ilin oktyabr ayında kəsildi. B a x: Qraf Paskeviçin Tiflisdən çara yazdığı 1829-cu il 14 noyabr tarixli raport (AKAK, c. VII, sənəd 817, səh. 829), "Qarabağnamə"nin axırıncı sətirlərindən məlum olur ki, əsər Rusiya-Türkiyə (1828-1829) müharibəsi qurtarmamışdan qabaq yazılmışdır.

4 Ağa Məhəmməd şah Şuşa qalasını 1795-ci ilin yayında mühasirə etmişdi.

O vaxt Ağa Məhəmməd şah Şuşanı ala bilmədi. O, Cavad xan və Məlik Məcnunun məsləhət və vədlərinə etibar etdi. Tiflis üzərinə yeriməyi qərara aldı. Biz bunu bildikdə Sarı Kilsədən köçüb getdik, Tiflisin yuxarısında olan Qocor dağında gizlənmək fikrinə düşdük. Bu zaman xəbər çıxdı ki, Ağa Məhəmməd şah Alget çayı kənarında düşmüşdür. Qocorda tab gətirməyib yaylaq yolu ilə Kartilə yetişdik. Buradan Axalkalak kəndinə getdik. Gördük ki, əhali mal və heyvanlarını tamamilə yerbəyer qoyub özləri qaçmışlar. Adam tapıb ondan əhval tutduq. Dedi ki, şah keçən gün Tiflisi almışdır[1]. Bizlər də o saat köçüb, Kür çayı boyu ilə yuxarı qaçdıq. Gördük ki, Körpü şəhərində də adam qalmayıbdır. Oradan Kartil kəndinə getdik. Gördük orada da abadanlıq yoxdur. Axırda bu yerlərdə durmağı çətin hesab etdik. Qaçıb şamağacı meşəsinə girdik. Bir yol tutub getdik, hansı tərəfə getdiyimizi bilmirdik. Üç gün üç gecə, heç bir yerdə dayanmadan getdik. Dördüncü gün bir səhraya yetişdik. Gördük (burada) abadanlıq var. Xəbər aldıq, belə cavab verdilər ki, (bu yer) Axısxa torpağıdır. Orada durduq. Bu əsnada Qars və Şoragil qoşunları gəlib bizi qarət etdilər. Sonra Axısxa paşası Şərif paşa bizləri kəndlərdə yerləşdirdi. O qışı orada qaldıq. Bir osmanlı mollasından osmanlıca yazıb-oxumağı öyrəndim. Yay fəslində oradan Gürcüstana köçdük. Məlik Əbu yanında Bolis adlı yerdə sakin olduq. Qarət edilib dağınıq düşən elimiz də bir-bir yığıldı, bir camaat oldu. Bu qayda ilə orada dolanmaqda ikən, İrakli xan vəfat etdi[2]. Oğlu Gürgin (Georgi) xan Gürcüstan valisi oldu. O, böyük imperatordan[3] kömək istəyib qoşun gətirtmişdi. Başçıları general-mayor Lazarev və ministr Kovalenski[4] idi. Sonra vali başqa fikrə düşdü. Öz bacanağı və eşikağası Aslan bəy Orbelianini sultanın qulluğuna göndərmək istədi.

Ministr Kovalenski bunu başa düşüb valinin mirzələrinə etibar etmədi. Osmanlıca kağız oxuyan bir adam axtardı. Məni (ona) nişan

---

1 Ağa Məhəmməd şahın qoşunları Tiflis şəhərini 1795-ci il sentyabrın 12-də aldılar.

2 Padşah II İrakli 1798-ci il yanvarın 11-də ölmüşdür (Н.Дубровин. "Георгий XII последный царь Грузии и присоединение к Росии", səh. 1, II cap, SPb, 1897).

3 I Pavel nəzərdə tutulur.

4 Gürcüstan padşahı XII Georginin sarayına təyin olunmuş nazir Kovalenski 1799-cu il noyabrın 8-də Tiflisə gəldi. B a x: Statski sovetnik Kovalenskinin Tiflisdən; general-leytenant Krıorrinkə yazdığı 1799-cu il 2 dekabr tarixli məktub (AKAK, c. I, sənəd 6, səh. 98).

verdilər. O məni qulluğuna çağırdı. (Mənim) əlimlə gizli olaraq, Axısxa paşası Nayib paşaya bir çox kağızlar yazdırdı. Bunun nəticəsində Aslan bəyi geri qaytardılar. Ministr mənə mərhəmət edib məvacib təyin etdi.

Vali öldü[1], Gürcüstan uca (Rusiya) dövlətinin hakimiyyəti altına keçdi. Bu vaxta qədər mən gizli qulluq edirdim. Mən dövlətin baş məmurları qulluğunda olurdum. Sonra general-mayor Lisaneviç Pənbək və Şoragüdə müdir və rəis olub məni apardı[2]. On birinci ilə qədər onun yanında katiblik etdim. Bu ildə mənə podporuçik rütbəsi (çini) verildi. Nəhayət, on altıncı ildə sərdar Yermolovdan[3] izn alıb Qarabağın keçmiş hakimi general-mayor Mehdiqulu xanın qulluğuna gəldim. Mehdiqulu xan cənablan qədim yerlərimizi, onlardan əlavə bir çox yer, mülk və rəiyyət də mənə mərhəmət buyurdu. Məzkur xan sərhədin o tərəfinə getdikdə dövlət başçıları məni "İyirmi dörd" mahalına naib təyin etdilər. Sonra general Yermolov ilə Hüseyn xan sərdar arasına mübahisə düşdü, sərhəd məsələsi üstündə çəkişmə əmələ gəldi. Bizim sərhədi mühafizə etmək üçün, bir batalyon (soldat) və əlli qazaq təyin edildi. Sonra Yermolov komendanta yazdı: "Kapitan Mirzə Adıgözəl bəyi də sərhəd mühafizi təyin etmişəm".

Bu qoşunlar həmişə yanımda və elat da hökmüm altında idi. Üç il, ta avqust ayının 25-ci gününəcən, bu qayda ilə keçdi: sərhəddə bəylər təyin edib, qarovullar qoyurdum. Hüdudu mühafizə etməklə məşğul olurdum. 1826-cı ildə daha batalyon vermədilər. Bir ofisərlə altmış nəfər soldat, iki yüz elat atlısı və yüz nəfər erməni çəriki (əsgəri) götürüb sərhəddə durduq. Bu zaman qarapapaqlar Göyçədə

---

1 Gürcüstan çarı XII Georgi 1800-cü il dekabrın 28-də ölmüşdür. B a x: general-mayor Lazarevin general-leytenant Knorrinke yazdığı 1800-cü il 28 dekabr tarixli 93 nömrəli raport (AKAK, c. I, sənəd 137, səh. 188).

2 General-mayor Lisaneviçin okruq reisi sifetilə Pənbək və Şoragilə gəldiyi günü düzgün müəyyən etmək mümkün olmadı. Lakin bu qədər məlumdur ki, general-mayor Lisaneviç artıq 1811-ci ilin avqust ayında bu vəzifəni daşıyırdı. B a x: General Tormasovun general-mayor Lisaneviçə yazdığı 1811-ci il 13 avqust tarixli 134 nömrəli əmr (AKAK, c. IV, sənəd 179, səh. 775. Müqayisə et: sənəd 1180, səh. 776).

3 General A.P.Yermolov Tiflisə əlahiddə korpus komandiri və Gürcüstanın mülki işlər idarəsi baş rəisi sifətilə 1816-cı ilin oktyabr ayında gəlmişdir. B a x: General Yermolovun qraf Nesselroda yazdığı 1816-cı il 19 noyabr tarixli raport (AKAK, c. VI, h. II, sənəd 281, səh. 136).

idilər. Onlardan bir neçə nəfəri mənimlə sirdaş olmuşdu. (Onlar) mənə xəbər verdilər ki, qızılbaşlar sülhü pozub dava etmək fikrindədirlər. Mən bu əhvalatı yerli-yerində, dəfələrlə komendant mayor Çilyayevə yazdım. Axırda Çilyayev mənə yazdı: "Siz mənə yazırsınız, mən də məcbur olub general Yermolova xəbər verirəm. O cənab da mənə məzəmmət yazır, (halbuki) mənə də yəqin olubdur ki, qızılbaşlar sülhü pozmaq fikrində olub müharibəyə hazırdırlar. Yanınızda olan poruçik Makarova yazmışam ki, nə vaxt kapitan Mirzə Adıgözəl bəy sizə bildirsə, Qalaya (Şuşaya) gələrsiniz. Qızılbaşlar düşmənçiliyə başladıqları zaman siz də əfsəri yola salın. Özünüz də elatı möhkəm bir sığnağa çəkib oturun".

Mən yazdım ki, bu xalq sığnaq edib mənimlə səngərdə durmaz; çünki Mehdiqulu xan o tərəfdədir[1], onun yanına gedərlər. Siz məni mürəxxəs edin, ya Qalaya (Şuşaya) gəlim, ya da Tiflisə gedim. Komendant razı olmayıb buyurdular ki, siz gərək el içindən çıxmayasınız.

Xülasə, bir vaxt Bazərgan bulağında durmuşduq. Bu zaman Kolani Əliməhəmməd adlı birisi gəlib mənə dedi: "Ayağa dur, səninlə xəlvəti bir sözüm var". Durub bir dərəyə düşdük. O, cibindən çoxlu kağız çıxarıb mənə verdi. Gördüm ki, hamısı Mehdiqulu xanın məktublarıdır. Bütün bəylərə, yüzbaşılara və kətxudalara yazıbdır. Mənə də yazıb ki, Naibüssəltənə Gorusda olan batalyonu qırıb, yerdə qalanı əsir etmişdir. Sən də yanında olan soldatı tamam-kamal, şahzadə Naibüssəltənənin (Abbas Mirzənin) - ruhumuz ona fəda olsun - hüzuruna gətir, hədsiz lütf və mərhəmətə yetişərsiniz, daimi maaş alıb dövlət sahibi olarsınız.

Mən bu kağızı oxuyunca əhvalım dəyişdi. O saat gəlib məzkur əfsəri bu əhvalatdan xəbərdar etdim də (dedim): "Gərək siz bu gecə gedəsiniz". Əfsər də çox qorxuya düşüb dedi: "Mən bu dağlardan, qayalardan, yollardan və Kolani tayfasının içindən necə keçəcəyəm?"

Mən ona tapşırdım: bu sözləri kimsəyə deməyəcəyəm. Sən axşam yalandan bir kağız oxu, mənə də və xalq arasında yay ki, guya padşahlıq ilxısı Çiləbördə gəlibdir. Sənə hökm olubdur ki, gedib ona qarovul olasan. Gərək bu gecə otuz ulaq hazır olsun. Mən deyərəm: Sən belə tez getmək istəyirsən, halbuki (obalar) uzaqdadır.

1 Yəni Qarabağ xanı Mehdiqulu xan İran qoşunları tərəfində, Abbas Mirzənin yanındadır.

Əgər az ulaq istəsən, yanımda olan süvarilərin atlarından alıb sənə verərəm.

Xülasə, əfsər 8 at istədi. Yanımda olanlardan alıb ona verdim və dedim: "Axşamdan bir saat keçmiş yola düş. Səhər açılıncaya qədər böyük yerlərdən keçib Həsənrız kəndinə get. Orada durma, tez koxadan atlar alıb ilxı bəhanəsilə yola düş. Bütün soldat şeylərini və başqa azuqələri kilsədə qoy, hər yerdə meşə ilə gedərək özünü Qalaya yetir".

Bu qayda ilə yaxşı göstərişlər verib əfsəri yola saldım. Özüm isə orada qaldım. Sabahı, günortaçağı xalqa da xəbər oldu.

Onlar dəstə-dəstə gedərək, (bir-birlərinə) "rus qaçıb" deyirdilər. Mən onlara dedim: "Rus padşahlıq ilxısını mühafizə etmək üçün gedibdir". Xülasə, o qədər qaldım ki, təxminən soldat qorxulu yerlərdən ötüb getdi. Sonra mən xalqa nəsihət edib (dedim): "Sisianov İrəvana gedən ildə Qazax və Borçalı əhalisi Rusiya dövlətinin gücünə bələd deyildilər. Onlar da sizin kimi asi oldular. Sonra isə peşmançılıq çəkdilər. İndi siz də o cür bir vəziyyətdəsiniz. Çalışın bu cür əsassız bir işdə aldanmayın və sədaqətinizi itirməyin".

Bu sözləri dəfələrlə onlara deyib öz evimə tərəf getdim. İstədim ki, özümü Gəncədəki soldatlara yetirim, oradan da Tiflis şəhərinə gedim.

Bu zaman xəbər gəldi ki, gəncəlilər dönüklük və qızılbaşlar da Tiflis tərəfinə hərəkət etdilər. Bu işlərdən də naümid və məyus olub yenə elatın içinə gəldim. Orada hər gün şahzadə və xan tərəfindən mənə məkrub gəlirdi. Məkrublarda deyilirdi: "Bütün vilayətlərin xalqı gəldi, siz nə səbəbə gəlmirsiniz". Mən onların hər birini bir bəhanə ilə dəf edərək vaxtı uzadırdım.

Nəhayət, bir gün istədim ki, elatın içinə gedib yenə onlara nəsihət edim. Əlirza yüzbaşının evində qonaq idim. Bir nəfər gəlib mənə xəbər verdi ki, evində qonaq olduğun bu yüzbaşı adam göndəribdir ki, Xanlar ağadan əlli nəfər kürd atlısı alıb gətirsin. Səni tutub şahzadənin hüzuruna aparsın. Mən bu sözü eşitdikdə çox fikrə gedib təşvişə düşdüm. Fikrim bu oldu ki, qolubağlı getməyim. Sonra düşünüb qardaşlarımın dilindən bir məktub yazdım. Naməlum bir adama verdim ki, gecə gətirib mənə versin. Məzkur adam bu kağızı aparıb bizim ailəmiz tərəfindən Qaraqoyunlu obasına yetirir. Deyir

ki, bu kağız Mirzə Adıgözəl bəyə çatacaqdır, qardaşları göndərmişdir. Lakin mənim atım yorulubdur, mən gedə bilmirəm. Gərək bu kağızı siz aparıb ona verəsiniz.

Gecəyarısı mən fikir etməkdə idim, gördüm yüzbaşı deyir: "Sən kimsən?", o biri cavabında: "Kağız gətirmişəm".

Yüzbaşı kağızı alıb (gətirdi). Ayaqlarımdan tutub məni oyatmaq istədi. Mən heç yatmamışdım, fikrə getmişdim. Xülasə qəsdən oyanıb dedim: "Nə xəbər var?" Dedi: "Mən adamları yığıb sizə keşikçi qoyurdum ki, sizə güllə atıb bir sədəmə toxundurmasınlar". Halbuki mənim qəsdimdə olan o özü idi.

Xülasə, yüzbaşı mənə dedi ki, çıraq gətirin, oxuyun görək bu nə kağızdır. Mən dedim səhər oxuyaram. O təkrar etdi ki, gərək indi oxuyasız, məlum olsun nə xəbər var.

Çıraq gətirdi, kağızı açıb oxudum, şad olub dedim: "Atı hazır edin, getməliyəm". Yüzbaşı (mətləbi) xəbər aldı. Dedim: "General Madatov Gəncəyə gəlib məni istəyibdir. Yermolov da Şəmkirə gəlmişdir."

Onlar sakit olub atı gətirdilər. Yüzbaşı xahiş etdi ki, kağızı ona verim, sabah xalqa göstərsin. Çəkinib kağızı ona verdim. Özüm ata minib yola düşdüm. Yenə düşündüm ki, Tiflis tərəfinə qaçım. Bu halda Verdiyev adlı bir erməni mənə rast gəldi. Xəbər verdi ki, Uğurlu xan[1] gəlib Gəncədə xan olmuş və rus qoşunu da getmişdir. Şəmkir, Şəmsəddinli və Qazax əhalisi də itaətə gəlmişdir. Bu xəbərləri eşitdikdə naümid oldum və çox iztirabla Allah-taalaya pənah aparıb (orada) qaldım.

İki gündən sonra gördüm ki, Tülü Mustafa oğlu İsmayıl şahzadədən bir fərman və Mehdiqulu xandan bir kağız gətirdi. (Onlar bu vasitə ilə) mənim ürəyimi ələ alaraq hüzura çağırırdılar. Mən istədim üzr gətirib getməyim. İsmayıl gizli olaraq mənə bir kağız göstərib (dedi): "Hərgah getməsəniz, gərək bu kağızı xalqa verim".

Gördüm ki, Naibüssəltənə yazıbdır: "On iki gündür ki, Qala (Şuşa) üstündəyəm, bütün aləm, hətta Şirvanat, Gəncə və bütün Qarabağ xalqı mənim itaətimi qəbul etmişdir. Yalnız Mirzə Adıgözəl azğınlıq və sərkeşlik fikrindədir. Onun başını və ya əsir olaraq özünü mənim yanıma gətirin. Yerdə qalan dövləti sizin olsun".

---

1 Uğurlu xan, gəncəli Cavad xanın böyük oğludur. B a x: Gəncə xanlarının şəcərəsi. AKAK, c. VI, h. II, səh. 906.

Mən bunu görcək çarəsiz qalıb öz-özümə dedim: "Bir can üçün bu qədər cana qəsd etmək rəva deyildir. Özüm gedərəm. Mən nə qızılbaş üzü görmüşəm və nə də onlara qulluq etmişəm. Hərgah insaflı olsalar, mənə bir şey etməzlər".

Xülasə, gedib əvvəlcə xanı gördüm. O da öz eşikağası Əlimərdan bəyi mənə qoşub Naibüssəltənənin hüzuruna göndərdi. O, çadırda kürsü üstündə oturmuşdu. Baş əydim. Xəbər aldı: "Bunlar kimdir?" Eşikağası ərz etdi: "Mirzə Adıgözəl, Məlik Usub və filankəslərdir". Buyurdu: "Mirzə Adıgözəl budur?" Ərz etdi: "Bəli". Buyurdu: "Fələqqə[1] gətirin".

Haman saat məni yıxıb ayaqlarımı fələqqəyə salaraq beş yüz çubuq vurdular. Nə qədər yalvardım-yaxardım, fayda vermədi. Axırda dedim: "Siz Gürcüstana səfər edəcəksiniz, (orada mənim kimi bir adam) axtararsınız, ancaq tapa bilməzsiniz". Bunu deyincə, buyurdu: "Bəsdir, aparın zəncirləyin". Məni aparıb zəncirlədilər. Keçmişdə mən deyərdim ki, rus dövlətinin əfsəri qızılbaş xanından yüksəkdir; çünki əfsəri çubuqla döymək olmaz, xanı isə döyərlər. Demə, mənim bu sözlərimi şahzadəyə xəbər veriblərmiş. Məni döyəndə buyurdu: "Bu əfsərdir, döymək olmaz, amma xanı döymək olar". Bunu deyib məni zəncirlədilər. Haman saat fərraşbaşı[2] qələmdan və kağız gətirib dedi ki, bir kağız yaz. Dedim: "Mən bu halda necə yazım". Dedi: "Doğrusu budur ki, sənin Əlirza yüzbaşıya yazdığın kağızı Naibüssəltənənin hüzuruna yetirmişlər. Xəttini tutuşdurmaq istəyirdilər". O kağızı mən sol əlimlə yazmışdım, qətiyyən oxşatmaq mümkün olmayacaqdı. Hərçənd qəbul etmədim, lakin əl çəkmədilər, (dedilər) ki, yazmasanız olmaz. Axırı çarəsiz qalıb Sədinin bu fərdini yazdım:

Doğrudur məlahət sahibi olan padşahlar ova getdikləri zaman,
Onu tutub ayağını bağlarlar, lakin (bəzən) də açıb buraxarlar.

Bu fərdi aparıb gördülər ki, bənzəri yoxdur. Fərd yazdığıma təbəssüm edib gülüşdülər. Ondan sonra xanın qardaşı Süleyman bəyi[3]

---

1 Fələqqə - ağacdan qayrılmış bir alət idi ki, günahkarların ayağını ona bağlayıb, sonra ağac və ya qamçı ilə vururdular.

2 Fərraşbaşı - "saray qulluqçusu" deməkdir.

3 Süleyman bəy, qarabağlı Mehdiqulu xanın kiçik qardaşıdır. B a x: İbrahim xan və uşaqlarının şəcərəsi (AKAK, c. II, sənəd 1415, səh. 695).

yerimə naib təyin edib oraya göndərdilər. Sonra xanın nökəri Əvəzxan bəyə əmr verdilər (ki, bizə getsin). O da gedib bütün var-yoxumu yazıb siyahıya aldı. Qardaşlarımı da tutub gətirdi.

Mən zəncirdə idim. Mənə hər gün cürbəcür əzab və əziyyətlər verirdilər. Keçmişdə rus qoşunu gəldiyi zaman, komendant yazıb məndən xahiş etmişdi ki, qoşun üçün azuqə göndərim. Mən də evlərdən yüz yük un cəm edib göndərmişdim. Şahzadə bunu da bir gün eşidib əmr etmişdi ki, Mirzənin gözünü çıxarın. O hökmə görə, məni yıxıb əllərimi ağaca bağladılar. Bıçağı gözümün üzərinə qoydular ki, çıxartsınlar. Haman saat Mirzə Məhəmmədəli Mustovfi gəlib dedi: "Beş min əşrəfi ver, gözlərini çıxarmayım". Dedim: "Mənim hər nə dövlətim var, tamam siyahı edib zəbt etmişsiniz. İndi quru canımdan başqa bir şeyim yoxdur".

O zaman Məhəmməd bəy adlı birini təyin etdilər ki, gedib bütün var-yoxumu gətirsin. O, yola düşdükdən sonra qardaşım Mustafa ağa bu xəbəri eşitmişdi. Əlinə düşən şeylərimi götürüb qaçmışdı ki, bəlkə özünü Gürcüstana yetirsin. Süleyman bəy, çox atlı yığaraq (onun) dalısınca getmişdi. Gəncə yaylağında yetişib qardaşımı tutmuş, əhli-əyalını və dövlətini qaytarıb gətirmişdi. (Ona) çox əzab və əziyyət verib ilxı, mal, qoyun və sair müxəlləfatımı tamam zəbt edib gətirdilər. Ailəm ac və çox çətinlik içində qalmış, qardaşlarımdan Məhəmməd ağa və Əli ağa Şəki vilayətinə qaçmışdılar. Mustafa ağaya isə çox əziyyət verdiklərindən yaralanmış və uşaqlarının yanında qalmış idi. Bizim xeyirxah dostlarımız, gecələr gizli olaraq uşaqlara çörək və yavanlıq verirlərmiş. Məni əvvəl tutub zəncirlədikləri zaman sərdar Yermolova bir kağız yazdım. Məhəmmədəli və Rəvas adlı adamlarıma beş tümən verib kağızı göndərdim. Onlar gedib Qazaxda qraf Simoniçin[1] yanına çıxırlar. Qraf onlardan əhvalatı soruşur, bütün işləri və qalanın alınmadığını öyrənir və çox xoşhal olur. Onlara buyurur ki, siz gərək Tiflisə gedəsiniz. Məhəmmədəlini Tiflisə göndərib Rəvası öz yanında saxlayır. Məhəmmədəli gizlicə Tiflisə daxil olub, knyaz Madatovun evinə gedir. Madatov onu görüb bütün əhvalatı öyrənir. Çox şadlıqla Yermolova xəbər verir. Yermolov haman saat Madatovun evinə gəlir

1 Qraf Simoniç, podpolkovnik, Gürcüstan qrenader polku komandiri (AKAK, c VI, h. II, səh. 939).

və bütün əhvalatı qasiddən xəbər alır. Onu üç gün gizli saxlayırlar, heç kəs bilmir. Dördüncü gün iki kağız yazırlar. Birini İosif Antonoviçə[1], birini də mənə yazırlar. Məhəmmədəliyə də otuz əşrəfi verirlər. Kağızları da yəhərinin içində gizlədib yola salırlar. Məhəmmədəli təsadüfən gecə vaxtı Şəmkirdə qarovullara rast gəlir. Onu tutub Gəncəyə Uğurlu xanın yanına aparırlar. Uğurlu xan ondan təkidlə sorğu-sual edir, lakin o boynuna heç bir şey almır. Buna görə onu azad edirlər. Sonra qarabağlılardan biri Uğurlu xana deyir ki, o, qasid idi, nahaq yerə əldən buraxdın. Bu sözü dedikdə yenə adam göndərir, onu Şeyx Nizami türbəsinin yanında rutub Uğurlu xanın yanına aparırlar. Diqqətlə hər yerini axtarır, axırda qaltağın içindən kağızları tapıb, şad olurlar. (Sonra) onu kağızlarla Naibüssəltənənin qulluğuna göndərirlər. Naibüssəltənə onu danışdırıb kağızları alır və məni hüzuruna istəyir. O saat cəllad gəlib məni zəncirdə apardı. Çatan kimi mənə buyurdu ki, qasidin gəlib, xəbər al gör, dindaşların nə işdədirlər. Mən ərz etdim ki, Qazax və Borçalı (mahallarında) mənim bir çox adamlarım var. Ola bilər ki, bu öz işlərindən ötrü və orada olan qohum-qardaşlarını görmək üçün gedibdir. Buyurdu: "Bəs, bu kağız nədir ki, Yermolov sənə yazıbdır". Mən sakit oldum. Buyurdu: "Xahiş edirsən oxuyum". Özü sərdarın mənə yazdığı kağızı oxudu. Axırda o yerə gəldi: "Siz hamıdan artıq və hörmətlisiniz, sədaqətinizi dövlət başçılarına göstərdiniz" yazılmışdı. Bu sözləri oxuyan kimi kürsüdən qalxdı, qəzəblənərək buyurdu: "Bir bax gör ki, Dərbənddən Tiflisə qədər sən rutan işləri kim tutubdur. Səni öldürmək mənə vacib oldu".

Haman saat cəllada əmr etdi: "Bunu apar və qalaya bağlanan topların ağzına bağla, atarkən bəlkə onun ətindən bir parça gedib yoldaşlarının içinə düşsün, gorbagor olsun". Haman saat məni zəncirləyib apardılar. Lakin axşamdı, qaranlıq düşmüşdü. Məni geri qaytardılar. Buyurdu: "Bu gecə saxlayın, sabah günorta vaxtı atarsınız ki, baxanlara da ibrət olsun".

O gecə bir zəncir də artıq vurdular. Saxladılar ki, səhər top ağzına qoyub atsınlar. Fikir etdim və belə məsləhət gördüm: fərraşbaşıdan

1 İosif Antonoviç Reutt, polkovnik, 42-ci eger polku komandiri, 1826-cı il iyul ayının 22-dən sentyabrın 6-na qədər İran qoşunları mühasirəsinə düşmüş Şuşa qalasının komendantı idi (AKAK, c. VII, səh. 9).

kağız və qələmdan istədim, (guya) vəsiyyətnamə yazacağam. O da verdi. Mehdi xana[1] yazdım ki, xan, mən bu zəncirə düşən gündən özümü ölmüş bilirəm. Lakin bu qədər var ki, mən burada ölən kimi, ruslar da Qalada dustaq olan bəyləri öldürəcəklər. İstəmirəm ki, mənə görə, o qədər bəylər ölsün. Xüsusilə Rüstəm bəy[2]. Kağızı haman saat bir adamla göndərdim. Məktubu aparıb xana verirlər. Xan onu oxuduqdan sonra Hacı Ağalar xanı çağırtdırıb Kərim xanla bir yerdə Naibüssəltənənin hüzuruna göndərir. Ondan xahiş edir ki, Qala alınıncaya qədər Mirzə Adıgözəli öldürməsin; çünki ruslar da bəyləri öldürərlər. Allah qoysa, Qala zəbt edildikdən sonra öldürərsiniz. Xülasə, o, çox çətinliklə (bu təklifi) qəbul edir. Bundan sonra mən yenə zəncirdə qaldım.

Uğurlu xan bir dəfə də (Naibüssəltənəyə) yazır ki, (Mirzə Adıgözəlin) qardaşları yolu kəsib gələn-gedəni öldürürlər. Buna görə, məni bir də hüzuruna istədi. Aparan vaxtda müctəhid qoymadı, aparıb zəncirdə saxladılar. Sonra mənə gizlicə xəbər gətirdilər ki, Madatov Şəmkirdə (İran) qoşununu basıb Əmirxan sərdarı öldürmüşdür. Naibüssəltənənin ordusu haman saat köçdü. Bizləri zəncirdə Ağdama apardılar. Orada komendantı[3] və bizləri bir yerə yığdılar. Ayaqlarımıza kötük qayırıb vurdular. Çarvadar yabıları kirayə edib (bizləri) palanlı yabılara mindirdilər. Gəraylı Həsən xana beş yüz şahsevən atlısı verdilər. Qardaşı fərraşbaşı Ağa Ələkbər bəyi də üstümüzə qoydular. Bizi Təbrizə göndərdilər. Özü də köçüb Gəncə tərəfinə getdi.

Mənim qardaşım Mustafa ağa qaçan kimi, gedib Madatova məlumat verir ki, şahzadə gəlir, xəbərdar olasınız. Madatov da qardaşımı oradan qaytarıb ona deyir: "(Şahzadə) gələn vaxtda (sizin) özünüzü və uşaqlarınızı əsir edəcəkdir. (Onları) bir tərəfə qaçırarsınız". Qardaşım haman saat gəlir, uşaqlarımızı götürüb obadan çıxır. Bu zaman Mustafa xan dörd yüz nəfər ilə gəlib yetişir. Oba xalqı deyirlər ki, (Mirzə Adıgözəl bəyin) qardaşı evini götürüb qaçmışdır. Sonra əqrə-

---

1 Qarabağlı Mehdiqulu xan nəzərdə tutulur.

2 Rüstəm bəy qarabağlı Mehdiqulu xanın yaxın qohumu idi. 1826-cı ildə özünü İran tərəfdarı kimi göstərmişdir. B a x: General Yermolovun knyaz Madatova yazdığı 1826-cı il 4 dekabr tarixli 512 nömrəli əmr (AKAK, c. VI, h. II, sənəd 330, səh. 870).

3 Mayor Çilyayev nəzərdə tutulur.

bamızdan doqquz nəfərini tutub şahzadənin yanına aparır. Onları da zəncirləyirlər. Allahın köməyilə, Naibüssəltənənin qoşunu məğlub olur[1], onları aparmağa fürsət tapmırlar. Zəncirdə qoyub gedirlər. (Onlar da) zənciri özlərilə görürüb evlərinə gəlirlər.

Bizləri və komendantı haman gecə aparıb Arazdan keçirdilər. Bu zaman şahzadənin məğlub olması xəbəri o tərəfdə yayıldı. Bizləri bütün Qaracadağ mahallarında gəzdirdilər. Şayiə yaydılar ki, ölkələrimizi geri qaytarmaq üçün Yermolov bunları zamın veribdir. Bunlar çox böyük adamlardır.

Xülasə, bizləri Təbrizə apardılar. Komendantı ayrı bir yerdə saxlayıb üstündə güclü qarovul qoydular. Bizləri də zəncirə və kötüyə vurdular. Bu qayda ilə bizə bir neçə ay dünyada misli görünməmiş əzablar verdilər.

İbrahim adlı sünni bir təbrizli bizimlə məhbus idi. O, cana gəlib bizlərə deyərdi "Gəlin qaçaq". Mən razı olmurdum. Axırda cana gəldik. İyirmi nəfər dustaq idik. Bir gecə həbsxana məmurunu tutub (əl-ayağını) bağladıq. Açarları çıxartdıq və qıfılları açdıq. Həbsxana məmurunu zəncirlədik. Yanımızda çadır vardı, onun iplərini kəsib götürdük. Bir yol ilə gəldik, divardan ip ilə sallanıb düşdük. Əvvəl mən düşdüm. Gördüm ki, ip əlimin ətini sıyırıb aparıbdır. Yoldaşlarıma dedim ipi palazla tutun ki, əliniz sıyrılmasın. Bu qayda ilə ipi tutub hamımız düşdük. Düşən vaxtda ip qırılıb yoldaşımın birinin baldırı sındığı üçün, orada qaldı. Yenə ip ilə xəndəkdən bu tərəfə keçdik. Təbrizlilər Seyid Həmzə türbəsinə getdilər. Bizlər də qaçıb Payan dağında bir böyük daşın altında axşamadək gizləndik. Axşam durub yola düşərək gəldik. Acı çayını üzü yuxarı gedib körpüdən keçdik. Su kənarı ilə gəlib bir bəndərə yetişdik. İki adam yol kənarından qalxıb bizə dedilər: "Kimsiniz?" Biz cavab verdik ki, gəncəliyik. Haman saat "vurunuz" dedilər. Yüzədək tüfəng üzümüzə açıldı. Yoldaşlarımız özlərini suya atdılar. Mən yol ilə geri qaçdım. İki nəfər adam dalımca gəlirdi. Yetişə bilməyib geri qaldılar. Mən dağa çıxdım, bir daşın dalına söykənib qulaq asdım. Gördüm, yoldaşlarımdan (bəzisini) tutub məni xəbər alırlar. Onlar deyirlər: "Vallah görmədik, qaçdı".

---

1 İran qoşunlarının 1826-cı il sentyabrın 13-də Gəncə yaxınlığında məğlub olduqları nəzərdə tutulur.

Bu halda bir ayaq səsi eşitdim. Gördüm ki, Zeynalabdin yasavuldur. Çağırdım, o da məni tanıyıb yanıma gəldi. Oradan dağ yuxarı getdik, bir daşın altına girib qabağımıza da daş yığdıq. Səhərəcən orada qaldıq. O ətrafda olan kəndlərin bütün əhalisini dağa çıxarıb (bizləri) axtarırdılar. Neçə dəfə yanımızdan keçdilər, Allahın lütfü ilə, bizi görmədilər. Axşam oldu, gördük ki, özümüz nabələd, yollar tamamilə tutulmuş və heç bir tərəfə də gedə bilməyəcəyik. (Axırda) fikir etdik ki, Seyid Həmzə türbəsinə pənah aparaq. Bu fikirlə qayıdıb ayaqyalın, Acı yolu ilə getdik. İki yerdə gördük ki, bizi axtarmaq üçün sərbaz gəlir. Onlardan da gizlənib yüz cür (əziyyətlə) Seyid Həmzə türbəsinə daxil olduq. Türbənin qapısında on nəfər sərbaz qarovul qoymuşdular. Bunlar yuxuda idilər. Yanlarından keçib içəri daxil olduq. Gördük ki, bizim qaçmağımızdan qorxuya düşən bütün fərraşlar buraya gəlib bəstə girmişlər. Məni görən kimi şad oldular və qaçıb şahzadəyə xəbər apardılar. O da şad oldu. Fərraşbaşıdan qaçan dustaq üçün cərimə olaraq, üç yüz əşrəfi almalı idilər. Əksinə, buyurdu (ona) muştuluq verdilər. Səhərə bir saat qalmış (şahzadə) Xacə Ələsgər xacəbaşını və Hacı Ağalar xanı göndərdi ki, məni buradan çıxarsınlar. Onlar and içdikləri vaxt mən Hacı Ağalar xana dedim: "Sən nə üçün and içirsən, məgər bizim (bir-birinə) etibarımız yoxdur? Mənim sənə etibarım var". Onlar ilə (bestdən) çıxıb Hacı Ağalar xanın evinə getdik. Şorba gətirdilər, içib bir az istirahət etmək istədik. Haman saat fərraş gəlib bizi apardı. Gördük ki, bizlərə bələdçilik edən sünni İbrahimi şaqqalamış və həbsxana məmurunun gözlərini çıxarmışlar. Bizləri hüzura çağırmaq münasibətilə də yüz min nəfərdən artıq Təbriz əhalisi tamaşaya çıxmışdı. Şahzadə meydanın (yuxarı) başında durmuşdu. Bizi görüncə qəzəblənib mənə buyurdu: "Ey kafir, rusun donuz supu ilə çaxırı yadına düşdüyü üçün qaçdın?" Mən ərz etdim: "Sən padşahsan, sənin bir saat ədalətin, min ilin ibadətindən artıqdır. Qarabağda da buyurdunuz ki, ruslarla şərab içib belə olubsan. Halbuki mən ömrümdə onun dadını görməmişəm. Bir dəfə xəbər almadınız ki, doğrudur, ya yalandır".

Mən belə dedikdə, Hacı Ağalar xana buyurdu: "Bu nə deyir?" Hacı Ağalar xan ərz etdi ki, sənin başın üçün doğru deyir. Ondan sonra bir saatdan artıq məni danışdırdı. Hər nə buyurdu cavab verdim.

Axırda Hacı Ağalar xan ərz etdi: "Siz buyurdunuz ki, Mirzəni qardaşın Rüstəm bəy əvəzinə sənə mərhəmət edəcəyəm". Buyurdu: "Verdim".

Hacı Ağalar xan məni oradan öz evinə apardı. Əlimin yarasına məlhəm qoydu. Özümə paltar tikdirdi. Bir neçə gün bu qayda ilə yaşayırdım. Sonra Madatov Mişkin tərəfinə gəldi. Bu zaman Mustovfi Mirzə Məhəmmədəli demişdi ki, rus gəlir, mütləq mühasirəyə girmək lazım gələcəkdir. Bunun Təbrizdə olması məsləhət deyil, gərək Şahi[1] dəryasının adasında saxlansın. Bu sözü Hacı Ağalar xan eşitdi, çox yalvarıb-yaxardı. Axırda məni Təbrizdən çıxarıb Bənab kəndinə apardılar. Orada bir aydan artıq üstümdə qarovul qoydular. Sonra adam gəlib məni Təbrizə apardı. Gedən kimi Əbülfət xan mənə dedi ki, şah Qayimməqamı buraya göndərib. Ona buyurubdur ki, hər necə olsa sülh etsin. Qayimməqam da mənimlə məsləhətləşib dedi: "Gərək mötəbər bir adam tapasınız ki, gedib Madatovu ələ gətirsin, sülh edək". Mən səni nişan verdim. Dedim ki, bunu etsə Mirzə Adıgözəl edəcəkdir. Çox xoşhal oldu, səni də bu məsləhətə görə gətirtmişdir ki, göndərsin. Əlbəttə, yaxşı danışarsan.

Mən dedim: "Məgər bu iş Madatovun əlindədir, ya Yermolovun". Dedi: "Bilirəm, məqsədim budur ki, sən xilas olasan". Dedim: "Axı etibar etməzlər". Dedi: "Elə əbləhdirlər ki, sən nə desən, inanarlar. Əbləh və yaltaqdırlar".

Sonra gecə olunca Qayimməqam bir nəfər fərraş göndərib gizlincə məni apartdı. Qayimməqam mənə çox hörmət edib dedi: "Sən məhbussan, mən də möhtac, biz gərək bir-birimizə kömək edək. Qibleyi-aləm məni buraya göndərib və buyurubdur ki, sülh edim. Mən də Madatovun yanına göndərmək üçün səni məsləhət bilmişəm. Səni gərək Madatovun yanına göndərəm, sənin vasitənlə sülh olsun. Madatovu başa salıb İran dövləti tərəfindən arxayın edərsiniz. Ona deyərsiniz ki, yanan imarətin, tələf olan taxıl və sair şeylərin zərərini tamam-kamal və artıqlaması ilə ödəyəcəyik. Sənin də nə zərər və ziyanın varsa, onu da artıqlaması ilə sənə verəcəyik. Gərək Madatovla yaxşı danışasan, onu sülh etməyə həvəsləndirəsən. Bir aya qədər bu məsələnin cavabını mənə gətirəsən".

1 Şahi – Urmu gölü

Mən də Qayimməqamın təbiətinə münasib olan sözlər danışıb onu xatircəm etdim. Məni oradan Naibüssəltənənin hüzuruna apardı. O da mənimlə bu cür sual-cavab etdi, üzr istədi. Mənə gözəl vədlər və ümidlər verdi. Məni azad edib bir ay vaxt qoydu. Mincivanlı Hüseynqulu bəyi də mənə qoşdu. Təbrizdən çıxıb yola düşdük. Şuşa qalasına varid olaraq İosif Antonoviç Reuttun[1] qulluğuna gəldim. Məni görüb şad oldu. Buyurdu ki, gərək Tiflisə gedəsən. Mən də (onun qulluğundan) azad olub əvvəl öz evimə getdim. Gördüm ki, evimdə dövlət, mal və sair şeylərdən heç bir şey qalmamışdır. O halı görüncə tab gətirməyib Tiflisə getdim. Haman gündə oraya çatdım. Gördüm general Dibiç də o gün Tiflisə daxil olmuşdur[2]. Haman gün general Madatovun yanına getdim. O məni gördüyü zaman şadlığından ağladı. (Sonra) məni götürüb sərdar Yermolovun qulluğuna apardı. O da məni görüb boynuma sarıldı. Sonra qarşı-qarşıya oturub danışdıq. Çox sevindi və şad oldu. İranda olan bütün əhvalatı üç gün, üç gecə məndən xəbər aldı. Mənim onları aldadıb xilas olmağıma çox-çox şad oldu və son dərəcə fəxr etdi. (O) məni general Dibiçə tanıtdı. General da (mənim başıma gələn) bütün əhvalatla tanış olub xoşhal oldu. Cürbəcür nəvazişlər göstərdi, məndən razılıq etdi. Başıma gələn əhvalatı məndən bir-bir xəbər aldı. Ondan sonra general Paskeviçin hüzuruna getdim. Qardaşlarım onun qulluğunda olduğundan, o da əhvalımdan xəbərdar idi. (O) mənə çox mərhəmət və nəvaziş göstərdi. Sonra knyaz Madatov buradakı[3] qoşuna rəis təyin olundu. General Yermolovdan xahiş etdi ki, məni öz yanınca aparsın. General Yermolov razı olmadı. Axırda Madatov onunla şərt etdi ki, siz İrəvan torpağına çatanacan mən onu sizin qulluğunuza göndərərəm. Bu şərt ilə məni Madatovla Qarabağa göndərdi. Sonra Madatov işdən götürüldü və yerinə knyaz Abxazov naçalnik təyin edilərək Qarabağa gəldi[4]. Bu zamana qədər mən onun qulluğunda idim. Tariximi yazan Mirzə Hüseyn Məmmədağa oğlu Salari təxəllüs də yuxarıda buna işarə etmişdir.

---

1 İ.A.Reutt - polkovnik, Şuşa qalasının komendantı

2 Ştab rəisi general-adyutant İ.İ.Dibiç, işlərin Yermolov tərəfindən Paskeviçə təhvil verilməsi münasibətilə, 1827-ci ilin yanvar və fevral aylarında Tiflisdə idi.

3 Qarabağ nəzərdə tutulur.

4 Knyaz Abxazov 1827-ci il aprel ayında general Madatovun yerinə Qarabağ, Şirvan və Şeki vilayətləri rəisi vəzifəsinə təyin olundu (AKAK, c. VII, səh. 4).

O gələn kimi (göstərdiyim) xidmətlər və çəkdiyim zəhmətlərlə ətraflı surətdə tanış oldu və rütbəmi artırdı. Onun yaxın adamlarından biri və məxfi məşvərətçisi oldum. Böyük sədaqətlə xidmətlər göstərdim. İran barəsində tədbirlər gördüm, qasidlər göndərib işləri yoluna qoydum. Gördüyüm işlər və tədbirlərin hamısı "İxrabat" jurnalında serdarların dəftərxanasında yazılmış (və qeyd edilmişdir). Hərgah arzu edib görmək istəsəniz, sizə məlum və aşkar olacaqdır.

(Axırda), knyaz Abxazov cənab general Paskeviçin hüzuruna yazdı. Mənə kapitan rütbəsi ilə dörd yüz manat pensiya verilməsi barəsində vasitəçilik etdi[1]. İqtidar və nəcabət sahibi sərdar cənabları da bütün xalqların canlarının sahibi olan böyük imperator və əziz padşahdan xahiş etdi. Buna görə, məni haman rütbə və pensiya ilə sərəfraz etdilər. O vaxtdan bu anə qədər evimdə oturmuşam, əmlakım əlimdə, rəiyyətlərim[2] ixtiyarımda, farağatla yaşayıb Cəmşid mərtəbəli, günəş taclı, ulduz dəstgahlı, aləmlərin pənahı olan Rusiya padşahına, uca nəslinin ömrünə və taleyinin yüksəlməsinə duaçı varam.

Ümid edirəm ki, bu müxtəsər, dəyərsiz və nöqsandan xali olmayan (tarix), uca nəsəbli general Kolyubakinin oğlu, süvari podpolkovniki Mixail Petroviçin nəzərindən keçdikdən sonra onun tərəfindən lazım olan yerə təqdim edilər.

---

1 Mirzə Adıgözəl bəy hələ 1830-cu ildən əvvəl kapitan rütbəsi almaq üçün təqdim edilmişdi; çünki knyaz Abxazov 1830-cu ildə artıq Zaqafqaziyanı tərk etmiş və Osetiyada idi (AKAK, c. VII, səh. 9).

2 Rəiyyət - xana, bəyə tabe kəndlilərə deyilirdi.

## MİRZƏ CAMAL CAVANŞİR VƏ ONUN "QARABAĞNAMƏ"Sİ[1]

Qarabağ xanlarının tarixinə dair ikinci əsərin müəllifi Mirzə Camal Cavanşir (1773-1853) İbrahim xanın vəziri olmuş, xanlığın daxili və xarici işlərində yaxından iştirak etmişdir. Qarabağ xanlığı Rusiya himayəsinə keçdikdən sonra da Mirzə Camal Mehdiqulu xanın yanında həmin vəzifədə qalmışdır[2]. Qarabağ xanlığı ləğv edildikdən sonra o, məhkəməyə təyin edilmiş və burada 18 ilə yaxın çalışdıqdan sonra, 1840-cı ildə qocalığı ilə əlaqədar olaraq istefaya çıxmışdır. Onun tərcümeyi-halından bəhs edən Adolf Berje yazmışdır: "Mirzə Camal fars, ərəb və osmanlı dillərindən başqa avar və ləzgi dillərini də bilirdi. Tarix, coğrafiya və astronomiya haqqında yaxşı məlumatı vardı. Tibb elmini bildiyi üçün istefaya çıxdıqdan sonra ömrünün sonuna qədər xəstələri pulsuz müalicə edirdi. Onun üçün də xalq arasında hörməti vardı"[3].

Mirzə Camal 1853-cü ildə 80 yaşında vəfat etmişdir.

Mirzə Camal həm xanlıq dövründə, həm də Rusiya üsul-idarəsində iştirak etdiyi üçün onun bilavasitə müşahidə etdiyi hadisələr haqqındakı məlumatı böyük əhəmiyyətə malikdir.

Əsər Qarabağın coğrafi vəziyyətinin təsviri ilə başlayır. Sonra Qarabağ xanlığının şəcərəsi verilir. Mirzə Camalın "Qarabağnamə"sində Qarabağ xanlığının öz istiqlaliyyəti uğrunda İrana qarşı ədalətli müharibələri, Rusiya ilə İran arasında davam edən vaxtaşırı döyüşlər hərtərəfli göstərilir. Əsərdə son Rusiya-İran müharibələrinə kimi Qarabağda cərəyan edən ictimai-siyasi hadisələr də müəyyən qədər öz əksini tapmışdır.

Qeyd etmək lazımdır ki, "Qarabağnamə"lərin hər ikisi əsas etibarilə eyni dövrü əhatə edir. Onlar istər materialların məzmunu, istərsə də tərtibatına görə bir-birinə çox bənzədiyi üçün V.N.Leviatov səhv olaraq Mirzə Adıgözəl bəyin (1845) Mirzə Camaldan (1847) istifadə etdiyini və bu barədə heç bir söz söyləmədiyi fikrini irəli sürür[4]. Lakin əsərin mətni ilə bilavasitə tanış olduqca Mirzə Adıgözəl bəyin "Qarabağnamə"sinin Mirzə Camalın əsərindən iki il əvvəl qələmə alındığına şübhə qalmır. "Qarabağnamə"lər ilə bilavasitə tanış olmayan V.N.Leviatov, İ.P.Petruşevskinin[5] və S.A.Ağayanın[6] buraxdığı bu səhvi təkrar etmişdir.

---

1 Əli Hüseynzadə. XIX əsrin ikinci yarısında Azərbaycan tarixşünaslığı, Bakı, 1967.

2 "Kavkaz" qəzeti, 1855, № 61.

3 Yenə orada.

4 V.N.Leviatovun "Qarabağnamə"yə müqəddiməsi (bax: bu kitabda səh. 32).

5 И.П.Петрушевский. Очерки по истории феодальных отношений, səh. 48.

6 Ц.П.Агаян. А.Бакиханов. Bakı, 1948, səh. 89.

Son illərdə Mirzə Camalın "Qarabağnamə"sini nəşr edən mərhum F.Babayev də özündən əvvəlki müəlliflərin buraxdığı səhvə yol vermişdir[1].

Bu iki əsərin bir-birinə bənzəməsi heç də müəlliflərdən birinin digərindən istifadə etməsini söyləməyə haqq vermir. Bizsə, hər iki müəllif öz əsərini əsas etibarilə xalq arasında dolaşan şifahi rəvayətlər, yaşadıqları dövrün tarixi hadisələrini isə öz müşahidələri əsasında yazmış olduqlarından bu oxşayış ancaq təsadüfi bir səciyyə daşıyır. Əgər bunların bir-birindən istifadə ehtimalını şərti olaraq qəbul edəcək olsaq, onda əksinə, Mirzə Camalın Mirzə Adıgözəl bəydən istifadə etdiyi göstərilməlidir. Əslində isə hər iki müəllif öz əsərini müstəqil yazmışdır.

Əli Hüseynzadə

1 F.Babayev yazır: "Ehtimal etmək olar ki, Mirzə Adıgözəl bəy əsərini yazdığı vaxt Mirzə Camalın kitabından istifadə etmişdir" (B a x: Mirzə Camal. Qarabağ tarixi, Bakı, 1959, səh. 25, haşiyə 1).

## SƏRDAR VORONSOVUN TAPŞIRIĞI ÜZRƏ MİRZƏ CAMAL QARABAĞİNİN QARABAĞ VİLAYƏTİ XANLARI MƏRHUM PƏNAH XAN VƏ İBRAHİM XANIN HAKİMİYYƏT VƏ İSTİQLALİYYƏTİ VƏ MÜXTƏLİF HADİSƏLƏR HAQQINDA YAZDIĞI MƏLUMAT

**Rəhmli və mərhəmətli Allahın adı ilə**

Hesabsız həmd, sonsuz məxluqatın pərvərdigarına yaraşar ki, səadət və böyüklük tacını istədiyi adamın başına qoyar və istədiyi adamı ondan məhrum edər. Həqiqətən də izzət, səadət və bəxtiyarlıq onun ümumi kəraməti və əzəli lütflərindən biridir.

Beyt

Bəndəçiliyi və şahlığı qismət etmək işi (sənin ixtiyarındadır).
Səadəti istədiyin adama verərsən.

Yeri-göyü yaradan Allahın dərgahına gizli və örtülü deyildir ki, keçmiş vaqiə və hadisələri bilmək və hər vilayətin vəziyyət və keyfiyyətindən xəbərdar olmaq yalnız məlumatın artmasına və mənfəətin çoxalmasına səbəb ola bilər. Buna görə də hörmət və nəcabət sahibi olan şanlı kavaler polkovnik qarabağlı Şah Əmirxan Bəylərov müsəlman tarixi ilə 1263, xristian tarixi ilə isə 1847-ci ildə Şuşa qalasına gəldiyi zaman mənlə, yəni həqiqi və səmimi dostu, köhnə işçisi, uzun müddət Qarabağ xanları xidmətində qulluq sahibi - mirzə və vəzir olmuş, onların hakimiyyətindən sonra isə yenə də yüksək Rusiya dövlətinin xidmətçiləri sırasında tapşırılan işləri yerinə yetirməyə çalışmış Qarabağlı Mirzə Camal Cavanşirlə (görüşdü). Söhbət zamanı (mənə qarşı olan) xeyirxahlığına görə, habelə səxavət və ehsan mənbəyi, bəxşişlər xəzinəsi, əmirlər və böyüklər pənahgahı seçilmişlər və kiçiklər dayağı, əzəmətli əlahəzrət imperator və kəramətli xaqanın məhəbbətini qazan-

mış aləmpənah padşahın canişini, müxtəlif nişanlar sahibi, general otinfanteri, qraf və knyaz Mixail Semyanoviç Voronsova - qadir və mərhəmətli Allahın inayəti həmişə onun üzərində olsun, - nisbət bəslədiyi səmimiyyətə əsasən dedi: Əzəmətli (Voronsov), öz hökmü altında olan hər bir vilayətin tarixini və keçmiş xanların hakimiyyətini, onların ixtiyar və qüdrətini bilməyə olduqca maraq göstərir. Əgər bunları qələmə alıb, Qarabağ vilayətində üz vermiş (tarixi) hadisələrin həqiqətini və keçmiş xanların ixtiyar və qüdrətini, düzgün və müfəssəl surətdə, kəramət sahibi olan böyük əmirin hüzuruna ərz edən olsa, olduqca bəyənilmiş iş görmüş və onların mübarək xatirənin razılığını əldə etmiş olar.

Cənab canişin knyaza qarşı bəslədiyim səmimiyyətə və xüsusilə onun mənə qarşı göstərdiyi lütf və mərhəmətə görə belə bir xidməti özüm üçün tam xoşbəxtlik və səadət vasitəsi bilərək, özümü kəramət və şövkət sahibi olan o böyük əmirin gözündə zərrə qədər də olsa cilvələndirmək və bununla da onun xoşhal olmasına və mərhəmət göstərməsi səadətinə nail olmaq istədim. Ona görə, Allaha təvəkkül edərək, qədim tarixlərdə oxuduğum, yaşlı və təcrübəli adamlardan eşitdiyim və əlli il müddətində gözümlə görüb-bildiyim həqiqi hadisələrin hamısını artırıb-əskiltmədən yazmağa başladım. Ümid olunur ki, bu kitab onun şanlı dərgahına bir töhfə kimi qəbul ediləcək və icra etdiyim xidmətlərin biri və səmimiyyətimin nümunəsi kimi qarşılanacaqdır. (Bu işdə) Allahdan kömək və müvəffəqiyyət diləröm. Bu vərəqləri neçə fəslə ayırdım və fəsildə müəyyən hadisələri yazmağa başladım. Allah köməkçi və müvəffəqiyyət bəxş edəndir.

BİRİNCİ FƏSİL

## QARABAĞ VİLAYƏTİNİN ƏSİL YAŞAYIŞ YERLƏRİ, SƏRHƏDLƏRİ, QƏDİM ŞƏHƏR VƏ ÇAYLARI HAQQINDA

Qədim tarix kitablarının yazdığına görə, Qarabağ vilayətinin sərhədi belədir: cənub tərəfdən Xudafərin körpüsündən Sınıq körpüyə qədər - Araz çayıdır. İndi (Sınıq körpü) Qazax, Şəmsəddin və Dəmirçi Həsənli camaatı arasındadır və Rusiya dövləti məmurları onu rus istilahilə Krasnı most, yəni Qızıl körpü adlandırırlar.

Şərq tərəfdən Kür çayıdır ki, Cavad kəndində Araz çayına qovuşaraq gedib Xəzər dənizinə tökülür.

Şimal tərəfdən Qarabağın Yelizavetpolla sərhədi Kür çayına qədər - Goran çayıdır və Kür çayı çox yerdən (keçib) Araz çayına çatır.

Qərb tərəfdən Küşbək, Salvartı və Ərikli adlanan uca Qarabağ dağlarıdır.

Nəhayət, keçmiş əsrlərdə (burada) iğtişaşlar və dəyişikliklər üz vermiş, bəzən İran, Rum (Türkiyə) və Türküstan padşahları bu vilayətləri fəth edib ayrı-ayrı sərhədlər qoymuş, qalalar tikmiş və onlara başqa adlar vermişlər.

Qarabağ vilayəti Aran məmləkətinin bir hissəsidir. Çünki Nuh peyğəmbərin, - ona Allahın salamı olsun, - zamanında tufan olduqda və tufandan bir qədər keçdikdən sonra Nuhun övladlarından biri Kür və Araz çayları arasındakı Tiflis, Gəncə, İrəvan, Naxçıvan, Ordubad şəhərləri və hal-hazırda Qarabağ torpağında xaraba qalmış Bərdə və Beyləqan vilayətləri və torpaqlarında hökmran və sahib olmuş, buraları abad etmiş və hamısına öz adını qoymuşdur. Onun adı Aran idi.

Qarabağ vilayətində salınan birinci şəhər Tərtər çayının üstündə və Kür çayının üç ağaclığında olan Bərdə şəhəri və qalasıdır. Bağdadı abad və darülxülafə edərək, orada sakin olan keçmiş Bəni Abbasiyyə xəlifələri zamanında, islam tarixi ilə 306, xristian tarixi ilə isə 886-cı ildə[1] bu şəhərin əhalisi müsəlman oldu. Bundan sonra

1 Xristian tarixi düzgün göstərilməmişdir, çünki hicri 306-cı il 918-ci il iyul ayının 14-də başlayıb, 919-cu il iyunun 3-də qurtarmışdır.

olan Beyləqan şəhəridir ki, onun İran və Fars şahlarından biri olan Qubad padşah təxminən min beş yüz il bundan qabaq tikdirmişdir. O, Kür çayından geniş Beyləqan çölünə böyük arx çəkdirərək, orada şəhər yaratdı və ətrafında Köndələn çaydan Qarqar çaya qədər kəndlər saldırıb camaatı yerləşdirdi və güzəranlarını müəyyən etdi. Əhali oralarda əkin yerləri, otlaqlar, bağlar salıb kəndlər bina etdi. Qədim zamanlarda o böyük arxın adı Barlas idi, indi isə Govurarx adı ilə məşhurdur. Çingiz xan zamanına qədər o şəhər, arx və kəndlər abad idi.

635 (1237-1238)-ci ildə Çingiz xanın qoşunu gəlib, Beyləqan şəhərini mühasirə etdi və bir neçə aydan sonra şəhəri alıb camaatını qırdı. Qarabağ vilayətinin mahal və kəndlərinin əhalisi Qarabağ və Şirvan dağlarına qaçdı. Beyləqan şəhəri və o böyük arx bir müddət xaraba qaldı.

Teymur padşah Türküstandan Rum vilayətinin üstünə hücum etdi. Rum hökmdarı Sultan İldırım Bəyazidlə müharibə edərək, ona qalib gəldikdən sonra oradan qayıtdı, Beyləqan şəhərini yenidən abad etdi, çoxlu camaat topladı və arxı təzədən təmir edərək şəhərə gətirdi. Bu yer, bir müddət Səfəvi dövrünə qədər abad idi. Səfəvi padşahları və Nadir şah zamanında qoşunların Gürcüstana və Şirvana gediş-gəlişi nəticəsində yenə viran oldu, şəhərin əhalisi isə ətrafa dağıldı. (Şəhər) indi də xaraba halındadır.

Doğrudan da bu, böyük faydalı bir arxdır. Bu arxın suyu ilə suvarılan əkin yerlərində taxıl, çəltik, pambıq, çəkil (tut) ağacları və başqa hər cür bitki əkilərsə, bollu məhsul əldə etmək olar. Belə ki, bir çetvert[1] buğdadan iyirmi çetvert, hətta ondan da artıq məhsul yığmaq olar. Xüsusilə buranın çəltiyi və darısı bol olur. Əgər bu bitkilərdən bir çetvert əkilərsə, təxminən əlli çetvert, hətta ondan daha artıq məhsul əldə edilə bilər. Bitkilərin əkilməsi də asandır. Belə ki, bu işi iki baş öküz ilə asanlıqla görmək olar. Əgər bu arxdan lazımi qayda ilə istifadə olunsa, onun ətrafında beş-altı min ailə kəndlər salıb, rahatlıqla yaşaya bilər. Bu böyük arxdan başqa, Arazdan çəkilmiş daha bir neçə arx vardır. Əgər hər arxın ətrafında yüz-iki yüz ailəlik kəndlər salmarsa, əhali taxıl, çəltik və pambıqdan bollu məhsul götürüb rahat yaşaya bilər. Beyləqan şəhərinin

1 Bir çetvert 250 puda bərabərdir.

üç yüz ildən artıq xaraba olduğuna baxmayaraq, Pənah xan və İbrahim xanın hökmranlığının ilk illərində bu arxlardan istifadə olunur və xanlar onlardan gəlir əldə edirdilər. Arxların adı belədir: Kürək arxı, Luvar arxı, Meymənə arxı, Gəmiçi arxı, Sarı arx, Ayaz arxı, Qaşqay arxı, Xan arxı.

İKİNCİ FƏSİL

## QARABAĞ VİLAYƏTİNİN TƏBƏƏLİYİ, KÖHNƏ ADƏT VƏ QAYDALARI HAQQINDA

İranda olan cənnətməkan Səfəvi sultanlarının dövründə Qarabağ vilayəti və Dizaq, Vərəndə, Xaçın, Çiləbörd, Talışdan ibarət olan erməni Xəmsə mahalları və elləri rəhmətlik Nadir şah zamanına qədər Gəncə bəylərbəyinin hökmünə tabe olmuşdur. Cavanşir, Otuziki, Bərgüşad və başqa ellər arasında kiçik xanların olmasına baxmayaraq, bunların hamısı Yelizavetpol bəylərbəyinin hökmü altında idi.

Nadir şah Tiflis, Gəncə, İrəvan, Naxçıvan və Qarabağ vilayətlərini Rum əhli və qoşununun əlindən alıb öz ixtiyarına keçirdikdən sonra, Qarabağ vilayəti yenə qısa müddət Yelizavetpol bəylərbəyi hökmünə tabe olmuş və bəzi vaxt Azərbaycan sərdarının ixtiyarına keçmişdir. Hər elin və mahalın xanları və məlikləri var idi. Bunlar Azərbaycan sərdarının əmri üzrə padşahın tapşırıqlarını yerinə yetirirdilər. Bu vəziyyət, Nadir şahın müsəlman tarixilə 1160, xristian (tarixilə) 1743-cü ildə[1] öldürüldüyü günə qədər davam etmişdir.

1 Hicri 1160-cı il miladi 1747-ci ilə bərabərdir. Nadir şah da 1747-ci ildə öldürülmüşdür.

ÜÇÜNCÜ FƏSİL

## MƏRHUM PƏNAH XANIN ƏSİL-NƏSƏBİ VƏ QARABAĞ VİLAYƏTİNDƏKİ HÖKMRANLIĞI HAQQINDA

Mərhum Pənah xanın əsil-nəsəbi Dizaqın Cavanşir elindəndir. Bu el qədim zamanlarda Türküstandan gəlmiş Bəhmənli elinin bir qolu olan Sarıcalı oymağındadır. Bunların ata-babaları Cavanşir eli arasında məşhur, adlı-sanlı, çörəkli, mal-dövlət və ehsan sahibi olmuş adamlar idi.

Mərhum Nadir şah Qarabağ, Gəncə, Tiflis və Şirvan vilayətlərini aldıqdan sonra, ellər və kəndlər arasında görüb-tanıdığı hər bir şücaətli və işgüzar adamı yanına çağırıb, öz yaxın qulluqçuları sırasına alar və onu məvacib, ehtiram və mənsəb sahibi edərdi. O cümlədən ellər arasında Pənahəli bəy Sarıcalı Cavanşir adı ilə şöhrət tapmış, hər işdə fərqlənmiş, ad çıxarmış, müharibə və davada tay-tuşuna üstün gələn və xüsusilə mərhum Nadir şahın Rum əhli qoşunları ilə etdiyi müharibələrdə şücaət göstərmiş Pənah xanı da öz yanına apardı. O da istər səfərdə, istərsə evdə sədaqətlə qulluq etməyə çalışıb, şahın yanında mənsəb və hörmət sahibi oldu. O, bütün tapşırılan işləri yerinə yetirərdi.

Bir neçə il bu qərar ilə keçdi. Nadir şahın ona qarşı mərhəməti gündən-günə artmaqda idi. O, rütbə və mənsəbdə bütün tay-tuşundan üstün oldu. Şahın evində və ellər arasında olan bir para qəlbi-qara adamlar, paxılların adəti üzrə, açıqda və gizlində Pənah xanı mərhum Nadir şahın yanında o qədər pislədilər ki, mərhum şahın ona qarşı olan məhəbbətini ədavətə çevirdilər.

İşin həqiqətindən agah olan Pənah xan canının qorxusundan, şah Xorasanda olduğu zaman, fürsət tapıb bir neçə qohumu və yaxın adamı ilə 1150 (1737-1738)-ci ildə Qarabağ vilayətinə qaçdı. Şah onun qaçmasından xəbər tutarkən, onu yolda ələ keçirmək üçün ardınca çaparlar göndərdi. Lakin mümkün olmadı. Azərbaycan sərdarına, Gəncə, Tiflis və Şirvan hakimlərinə qəti fərmanlar göndərildi ki, Pənah xanı harda tapsalar, tutub şahın hüzuruna göndərsinlər. Şahın əmri ilə Pənah xanın ailəsini və qohum-əqrəbasını çox incidib cərimə etdilərsə də, fayda vermədi.

Pənah xan Qarabağ torpağına çatıb vaxtını yaxın adamları ilə birlikdə gah Qarabağın dağlarında, gah da Şəki vilayətinin Qəbələ mahalında keçirirdi. O zaman təqribən on beş yaşına çatmış böyük oğlu İbrahimxəlil xan Xorasanda, öz evlərində yaşayırdı. Bir neçə vaxtdan sonra o da möhtərəm atasının ardınca Qarabağa gəldi.

Bu vəziyyət iki-üç il davam etdi. Nəhayət, Nadir şah hicri 1160 (1747)-cı ildə öldürüldü. Pənah xan Qarabağın yerdə qalmış xalqı arasında üzə çıxdı, bacarıqlı cavanları başına toplayıb Gəncə, Naxçıvan və sairəni qarət etməyə başladı. Yanında olan bütün cavanları və özünün yaxın adamlarını mal, paltar, at və yaraq sahibi etdi. Bu zaman xəbər çatdı ki, vaxtilə şah tərəfindən Xorasana köçürülmüş Cavanşir və başqa ellər özbaşına bütünlüklə oradan köçüb, vətənlərinə gəlməkdədirlər. Pənah xan yanında olan adamlarla birlikdə Qarabağ ellərini qarşılamaq üçün İraq və Azərbaycan sərhədinə qədər getdi. Onu salamat görən, nökər və köməkçilərinin çoxluğunu müşahidə edən bütün el əhli və qohum-əqrəbası sevindi və Pənah xanla bərabər Qarabağ torpağına daxil oldular. Hər kəs öz əvvəlki yurduna gedib rahatlandı. Ellərin camaatı var-yoxdan çıxmış, soyulmuş, əziyyət çəkmiş və yoxsul olduğuna görə Pənah xan onların və öz qohumlarının bacarıqlı cavanlarından bir çoxunu öz tərəfinə çəkərək Şirvan, Şəki, Gəncə, İrəvan və Qarabağ vilayətlərini qarət etməyə başladı. Bütün cavanları mal və dövlət sahibi etdi. Mal, at və xələt paylamaqla başqa camaatın da səmimiyyətini qazandı; müxalifət göstərənləri isə öldürmək və cəzalandırmaq yolu ilə özünə tabe etdi. Cavanşir, Otuziki və başqa ellər və kəndlərin əhalisindən heç bir kimsə Pənah xanın əmrindən çıxmağa cəsarət edə bilməzdi.

Şirvan və Şəki hakimləri Pənah xanın Qarabağ vilayətində belə bir istiqlaliyyət sahibi olduğunu görüb-eşitdikdə, onu özləri üçün zərərli bildilər, hər ikisi Pənah xanı aradan qaldırmaq üçün ittifaq bağladılar.

Hələ Qarabağın Xəmsə mahalları ona tabe olmadığı zaman (Pənah xan) ətraf xanların öz üzərinə hücum edəcəkləri təqdirdə ailə və qohumlarının, qulluqçu və yaxın adamlarının və (el) böyüklərinin qorunması üçün ellərin arasında münasib bir yerdə qala tikilməsini lazım bilmişdi. Məşvərətdən sonra, indi Kəbirli mahalı içində olan Bayat qalasının binası qoyuldu. Qısa bir zamanda möhkəm

hasar və xəndək qayrıldı, bazar, hamam və məscid tikildi. Xan bütün ailəsini, qohumlarının və el böyüklərinin əhli-əyalını oraya topladı. Ətrafda olan camaat, hətta Pənah xanın tərəqqisini, onun rəftar və məhəbbətini eşidən Təbriz və Ərdəbil vilayətlərinin bir çox əhalisi və sənətkarları belə öz ailələri ilə birlikdə gəlib Bayat qalasında yerləşdilər. Bayat qalası müsəlman tarixi ilə 1161, xristian tarixi ilə 1745-ci ildə[1] tikilmişdir.

Bayat qalası möhkəmləndikdən və Pənah xanın camaatı artdıqdan sonra, onlardan çoxlu zərər görən Şirvan və Şəki hakimləri ittifaq bağlayıb, Pənah xanı aradan qaldırmaq üçün böyük qoşunla Bayat qalasına hücum edərək onu mühasirə etdilər.

Mərhum Pənah xan, hər iki-üç gündə bir dəfə qohumlarının və ellərin adlı-sanlı atlıları və bacarıqlı nökərlərilə birlikdə qaladan bayıra çıxaraq, qala ilə düşmən qoşunu arasında olan böyük meydanda müharibəyə girişir, qəhrəmanlıqlar göstərir, Şirvan və Şəki qoşununa qalib gələrək qalaya qayıdırdı.

Şirvan və Şəki xanları heç bir iş görə bilmədilər. Mühasirə bir aydan artıq çəkdi. Hər gün qoşunlarının qırılmasını, at və eşşəklərinin qarət olunmasını görən xanlar peşman və pərişan halda köçüb getdilər və hər kəs öz vilayətinə qayıtdı. Zəmanəsinin kamil adamlarından olan Şəki vilayətinin hakimi Hacı Çələbi qayıdan zaman bu sözləri dedi: "Pənah xan bir xan idi. Biz gəldik onunla dava elədik və bir iş də görə bilmədik. Biz indi onu şah edib qayıdırıq".

Bu hadisədən sonra, hakimiyyət və istiqlaliyyəti gündən-günə artmaqda olan Pənah xan, Xəmsə mahallarını özünə tabe etmək fikrinə düşdü. Ən əvvəl Çiləbörd, Talış və Dizaq məliklərilə ədavəti olan Vərəndə mahalının köhnə məliki Məlik Şahnəzər bəy mərhum Pənah xana itaət etməyi məsləhət bilib onun (təklifini) qəbul etdi və var qüvvəsilə ona dostluq və səmimiyyət göstərdi. Pənah xan da hörmət və dövlət sahibi olan belə bir böyük şəxsin itaət etməsini özü üçün xoşbəxtlik sanıb, ona qarşı hörmət və ehtiramını gündən-günə artırırdı.

Xaçın mahalının məliki bir müddət düşmənçilik edərək əl-qol atdısa da, axırda (xana) tabe oldu və mərhum Pənah xan tərəfindən ata-babasından qalmış və indi də mövcud olan özünün ayrıca mül-

---

1 Hicri 1161-ci il miladi 1748-ci ilə bərabərdir.

künə təyin edildi. Bütün Xaçın əhalisi itaət edərək tapşırılan xidmətləri düzgün yerinə yetirirdilər. Dizaq, Çiləbörd və Talış məlikləri isə bir neçə il onunla düşmənçilik və dava etdilər. Axırda, qətl-qarət və lazımi tədbirlərdən sonra (onlar da) itaət etdilər.

Beş il Bayat qalasında yaşadıqdan sonra, ətrafı düşmən bürüdüyünə görə burada əbədi şəhər və qala tikmək ehtiyatsızlıq hesab edilərək (məsləhət görülmədi). Qarabağ ellərinin mal-qarasını dava zamanında düşmənin ziyanından möhkəm, keçilməz dağlarda qoruya bilmələri üçün qalanın Qarabağ dağlarına bitişən bir yerdə tikilməsi lazım bilindi. Şahbulağının üstündə Tərnəküt[1] adlı yerdə yaşayan Xaçın mahalının əhalisi həmişə Pənah xana qarşı ədavət bəsləyərək, onunla düşmənçilik etdiklərindən (Pənah xan) əvvəlcə onların fəsadını aradan qaldırmağı qət etdi. Süvari və piyada qoşunla onların üstünə getdi. Xaçın mahalının əhalisi iki min tüfəngli və ailələri ilə birlikdə Ballıqaya yaxınlığında olan möhkəm bir yerdə sığınıb, ədavət və düşmənçiliyə başladılar. Mərhum Pənah xan onların səngərinə hücum etdi. Üç gün arasıkəsilmədən qızğın müharibə oldu. Üçüncü gün Pənah xan onların səngərini tutdu...

Belə bir keçilməz yerin və iki min nəfərə qədər tüfənglinin möhkəm səngəri Pənah xanın əlinə keçəndən sonra ətrafdakı əhalinin və Xəmsə mahalları camaatının canına böyük qorxu düşdü. Onlar Pənah xanla gah sülh və barışıq, gah da düşmənçilik edirdilər. Çoxlu camaatı və dövləti olan Çiləbörd və Talış mahallarının qədim məlikləri Məlik Hatəm və Məlik Usub bəylə neçə dəfə müharibə oldu. Axırda onlar tab gətirə bilməyib, bir müddət çətin keçidləri olan yerlərdə, dərin dərələrdə, uca dağlar başında yaşadılar. Əkinlərinin, bağlarının və mal-qaralarının Pənah xanın adamları və qoşunu tərəfindən paymal və qarət olunduğunu, güzəranlarının pis keçdiyini görüb təngə gəldilər; evlərini, bağlarını və əkinlərini tərk edərək Gəncə vilayətində və Şəmkir mahalında qaldılar.

Pənah xan Xaçın əhalisinin fəsad və ədavətindən asudə olduqdan sonra, Xaçın mahalına ayrıca məlik təyin etdi. (Mahalın) yerdə qalan əhalisi ona itaət etdi.

Bu hadisədən sonra, indi Şahbulağı adı ilə məşhur olan Tərnəküt qalasının binası qoyuldu. Məsləhətə görə, Bayat qalasını tərk

1 Tərnəküt – Tərtər çayın orta axını hissəsindədir.

etdilər. Şahbulağındakı böyük çeşmə yanında qala tikərək, onun ətrafında yüksək yerdə geniş hasar hördülər, bazar, çarsu (meydan), hamam və məscid tikdilər. Müsəlman (tarixi ilə) 1165 (1751-1752)-ci ildə el camaatının bütün evləri - böyüklərin, sənətkarların, xanın yaxın adamlarının və xidmətçilərinin (ailəsi) Şahbulağı qalasına köçürüldü.

(Xan), tamamilə müstəqil olaraq üç-dörd il Şahbulağında yaşadı. Mərhum xanın gündən-günə artmaqda olan istiqlaliyyətinin şöhrəti, adamlarının çoxluğu və qüdrətinin səsi ətrafa yayıldı. Şirvan, Şəki, Gəncə, İrəvan, Naxçıvan, Təbriz və Qaradağ xanları Pənah xanın yanına elçi və məktub göndərib, onunla dost və müttəfiq olmaq istədiklərini bildirirdilər. O da xanların bəzisi ilə qohum oldu. Naxçıvan, Təbriz və Qaradağ hakimlərinin hökmü altında olan Naxçıvanın Zəngəzur, Təbrizin Qapan və Qaradağın Çuldur və Meqri mahallarına əl uzadaraq hamısına sahib oldu. Onları Qarabağın başqa rəiyyətlərinə qataraq, hamısına məliklər və sultanlar təyin etdi. Hamı mərhum Pənah xanın əmrinə tabe oldu...

## DÖRDÜNCÜ FƏSİL

### MƏRHUM PƏNAH XANIN ADINA XANLIQ FƏRMANI YAZILMASI VƏ ONUN HAKİMİYYƏTİ HAQQINDA

Mərhum Nadir şah öldürüldükdən sonra, qardaşı oğlu Əliqulu xan, Adil şah[1] ləqəbilə mərhum Nadir şahın şahlıq taxtına çıxdı. Adil şah tərəfindən Azərbaycan ölkəsinə sərdar təyin edilmiş Təbriz şəhərində yaşayan Əmir Aslan xan, Pənah xanın Qarabağda olan belə bir şöhrət və istiqlaliyyətini eşitdikdə, öz adından ona (hədiyyə olaraq) at, qılınc və xələt göndərərək, onu Adil şaha itaət etməyə dəvət və təşviq etdi[2].

1 A.Bakıxanov yazır ki, o, Əlişah ləqəbilə taxta çıxmışdır (bax: A.Bakıxanov. "Gülüstani-İrəm", Bakı, 1951, səh. 159).

2 Mirzə Adıgözəl bəy yazır ki, Əmir Aslan xan Pənahəli bəyi görmək arzusu ilə gəlib onunla görüşdü. B a x: bu kitabda səh. 39.

Mərhum Pənah xan onun elçilərinə layiq olan hörmət və mehribanlıq göstərdi. Ellərin bacarıqlı mötəbər, adlı-sanlı kətxudalarından bir neçə nəfərini elçilərlə birlikdə Əmir Aslanın yanına göndərdi. Çünki, hələ belə bir şövkət və dövlət sahibi olan əmirlə düşmənçilik, ədavət və müharibə etmək vaxtı deyildi. (Digər tərəfdən) ətrafda olan bəzi vilayətlərin xanları, üzdə dostluqdan və sədaqətdən dəm vurduqlarına baxmayaraq, ürəkdə Pənah xanın pisliyini istəyirdilər. Buna görə o, Adil şahın dövlətinə itaət etməyə hazır olduğunu və ona xidmət edəcəyini bildirərək, sədaqətini andıran cavablar və hədiyyələr göndərdi.

Sərdar Əmir Aslan belə bir itaəti və elçilərin gəlişini Adil şah dövləti üçün böyük xidmət sanıb, Adil şahın hüzuruna məktub yazdı.

Müsəlman tarixi ilə 1161, xristian tarixi ilə 1745-ci ildə[1] Adil şahın (Pənah xana) xan adı verilməsi və Qarabağ hakimi vəzifəsinə təyin edilməsi haqqında imzaladığı fərman, qiymətli xələt, qızıl yəhərli at və qaş-daşla bəzənmiş qılıncla birlikdə Sərdar Əmir Aslanın yaxın adamı vasitəsilə, o zaman yaşadıqları Bayat qalasına gəlib çatdı. Sərdar Əmir Aslan özü də Pənah xana ayrıca töhfələr göndərmiş, Pənah xanın elçi sifətilə göndərdiyi kətxudalara xələt və bəxşişlər verib, onlara hörmət və mehribanlıq etmişdi.

Beləliklə, xanlıq və hakimlik adı Pənah xana ilk dəfə mərhum Nadir şahın qardaşı oğlu Adil şahın fərmanı ilə verilmişdir.

Az bir müddətdən sonra Pənah xana xəbər çatdı ki, mərhum Nadir şahın oğlu Şahrux Mirzə, Adil şah adlandırıları Əliqulu xanı öldürərək, Xorasanda şahlıq taxtında oturmuş və İraq, Azərbaycan və Fars torpaqlarında qarmaqarışıqlıq üz vermişdir.

Bu zaman Pənah xan Gəncə, İrəvan, Naxçıvan və xüsusilə Ərdəbil vilayətlərini ələ keçirmək və o yerlərin xanlarını özünə tabe etmək qərarına gəldi. Az bir müddətdə onların bir parasını zorla, bəzisini isə məkrub və elçi göndərmək və ya qohumluq vasitəsilə öz itaəti altına aldı. Xüsusilə, Sarıcalı Dərgahqulu bəyi Ərdəbilə hakim təyin etdi. Gəncə xanzadələrindən kefi istədiyi adamı hökumət işinə təyin edir, istəmədiyini isə vəzifəsindən çıxarırdı. O vilayətlərin xanlarının uşaqlarından bir neçəsini girov adı ilə gətirib, Şahbulağı qalasında saxlayırdı.

1 Hicri 1161-ci il miladi 1748-ci ilə bərabərdir.

Bu vəziyyət, Məhəmmədhəsən xan Qacarın Mazandaran, İraq və Azərbaycan tərəflərində özünü müstəqil elan etdiyi günə qədər davam edirdi. Hökumət işlərini bir an belə unutmayan mərhum Pənah xanın işgüzar və bacarıqlı adamları, xanın əmrinə görə məsləhət üçün yığışıb dedilər: "Mərhum Nadir şah vəfat etdikdən sonra bizimlə Əliqulu xan və Sərdar Əmir Aslanın arasında sülh, ittifaq və dostluq əlaqəsi davam etməkdə idi. İndi, çox mümkündür ki, belə bir münasibət və dostluq əlaqəsi bizimlə Məhəmmədhəsən xan arasında olmasın. Ətraf xanlarından da bir o qədər xatircəm deyilik. Onların Məhəmmədhəsən xanı üzərimizə təhrik edərək, onunla birlikdə bizə qarşı çıxacaqları ehtimalı vardır. (Belə bir vəziyyətdə) Qarabağın elləri, adlı-sanlı adamları Qızılbaş qoşununun ayağı altında paymal olar, biz isə Şahbulağı qalasında elə bir qüvvətli düşmənin və ətraf xanların qarşısında müqavimət göstərə bilməyib, bütünlükdə qırılarıq. Ona görə də işin əlacım qabaqdan görmək lazımdır. Biz gərək dağların içində, möhkəm və keçilməz yerdə elə bir əbədi və sarsılmaz qala tikək ki, onu güclü düşmən belə mühasirə edə bilməsin. Qalanın bir tərəfi dağlarda olan ellərin üzünə daima açıq olmalı və mahallarla rabitəmiz, əlaqəmiz (bir an belə) kəsilməməlidir".

Bu məsləhəti həmişə xeyirxahlıq göstərən Məlik Şahnəzər bəyə söylədilər və onun məsləhəti və bələdçiliyi ilə Şuşa qalasını tikmək qərarına gəldilər. Xanın bir neçə nəfər bilici və məlumatlı adamı gedib, qalanın yerini və ətrafını yoxladı. Qalanın içində iki-üç bulaqdan başqa axar su yox idi. Bu bulaqların suyu isə qala camaatına kifayət etməzdi. Ona görə, güman gələn yerlərdə quyu qazdırıb, müəyyən elədilər ki, buranın bir çox yerlərində su quyuları qazmaq mümkündür. Bu xəbəri mərhum Pənah xana çatdırdılar. (Xan) sevinərək, bir neçə nəfər öz yaxın adamı ilə buraya gəldi, yerlə tanış olub, əzmlə qalanın binasını qoydu.

İslam tarixi ilə 1170, xristian tarixi ilə 1754-cü ildə[1] Şahbulağı qalasının sakinləri olan bütün rəiyyətləri - əyanın, məliklərin, mülazimlərin, ellərin və bir para kəndlərin kətxudalarının ailələrini köçürüb, bu qalanın içində yerləşdirdi. O vaxta qədər burada yaşayış evləri yox idi. Bura, şərq tərəfdə, qalanın altı verstliyində yaşayan Şuşa kəndi əhalisinin əkin yeri və otlağı idi.

1 Hicri 1170-ci il miladi 1756-1757-ci ilə bərabərdir.

Xalqı yerləşdirib hamıya, xüsusilə özü üçün yurd və imarət müəyyən etdikdən sonra mahir ustalar, ağıllı işgüzar adamlarla qalanın hasarını çəkdirdi. Mərhum Pənah xanın tikdirdiyi hasar indi xarab olmuşdur. Yalnız bəzi yerlərdə divarların qalıqları görünür.

Qalanın tikilişindən bir il keçdikdən sonra Ağa Məhəmməd şahın atası Məhəmmədhəsən xan Qacar İraq və Azərbaycan qoşunu ilə Şuşa qalasını almaq və mərhum Pənah xanı özünə tabe etmək məqsədilə Arazdan keçib qalanın dörd ağaclığında çadırlar qurdular. Mərhum Pənah xanı tabe etmək və beləliklə, Şuşa qalasını ələ keçirmək üçün çox düşündü, tədbirlər tökdü. Bir ay orada oturdu. Lakin bu qədər çoxlu qoşun ilə qalaya yaxınlaşa bilmədi. Əksinə, Qarabağın qoçaq əhalisi Məhəmmədhəsən xan ordusunun at-qatırını və başqa mal-qarasını istər açıq, istərsə də gizli surətdə qarət edərək, onun qoşununa çoxlu ziyan vurdu.

Bu zaman Kərim xan Zəndin Fars məmləkətinin Şiraz şəhərində qüvvət tapması və qoşun toplayıb, İraqı və Mazandaranı almaq niyyətində olması xəbəri Məhəmmədhəsən xana çatdı. Məhəmmədhəsən xan, belə bir vəziyyətdə qalanı almaq, Gəncəyə, Şirvana və başqa yerlərə sahib olmaq fikrindən əl çəkərək, sürətlə İraq, Fars və Mazandaran tərəfə hərəkət etdi. (Lakin) Kərim xan Zənd Məhəmmədhəsən xan gəlib çatana qədər bütün Fars vilayətini, İraq və başqa vilayətlərin bir para yerlərini ələ keçirib, Məhəmmədhəsən xanla müharibəyə hazırlaşmışdı. Bir tərəfdən də Məhəmmədhəsən xan Azərbaycanın, Gilanın və başqa yerlərin çoxlu qoşunu ilə Kərim xanı dəf etmək üçün Farsa tərəf hərəkət etdi. Lakin bəxt və dövlət Allah vergisi olduğundan, Məhəmmədhəsən xanın bir neçə yaxın adamı xəyanət fikrinə düşüb, onu öldürdülər və böyük mənsəb və ənam almaq təmənnasilə başını kəsib, Kərim xanın yanına apardılar. Belə yaramaz işlərdə böyüklər və sərdarların qeyrətini qorumaq sərdarların öhdəsinə düşdüyündən Kərim xan, Məhəmmədhəsən xanın qatillərini mərhəmət və ənamdan məhrum edərək, başqaları da öz xeyirxah ağalarına qarşı belə bir xəyanətə əl atmasınlar deyə onlara cəza verdi.

Məhəmmədhəsən xan hadisəsindən sonra, Nadir şahın sərdarlarından biri olan urmiyalı Fətəli xan Əfşar, dövlət iddiasilə Urmiya vilayətindən baş qaldıraraq, bütün Azərbaycanı tutdu. Mərhum Pənah xanın yanına mahir elçilər göndərib, onu itaətə və ittifaqa dəvət

etdi. Lakin Pənah xan belə sərdarlara itaət etməyi haqlı olaraq, özü üçün əskiklik və ar bilib, elçiləri kobud cavablarla geri qaytardı.

Elçilər qayıdıb (yerlərinə) çatdıqdan sonra Fətəli xan, Azərbaycan, Urmiya və başqa vilayətlərin əhalisindən çoxlu qoşun toplayıb qalanı almaq, Qarabağı ələ keçirmək və Pənah xanı aradan qaldırmaq məqsədilə Şuşa qalasına gəlib qalanın bir ağaclığında düşərgə qurdu.

Gizlində mərhum Pənah xana ədavət bəsləyən Çiləbörd və Talış mahalının melikləri Fətəli xanın yanına getdilər. Onlar altı ay qalanın yaxınlığında oturdular. Hər neçə gündən bir, mərhum Pənah xanın qoşunu ilə Fətəli xan ordusu arasında vuruşma üz verir və hər dəfə mərhum Pənah xanın qoşunu Qızılbaş ordusuna qalib gəlirdi. Bu müddətdə bir iş görə bilməyən Fətəli xan (vəziyyətinin) gündən-günə çətinləşdiyini və məğlubiyyətinin (artdığını) müşahidə edirdi.

Nəhayət, bir gün özünün bütün atlı və piyada qoşunları və adı çəkilən mahalların meliklərinin piyadaları ilə birlikdə hücuma başlayıb, Şuşa çayından keçərək qalanın yarım verstliyinə çatdı.

Bu tərəfdən də Pənah xan adlı-sanlı igid cavanlar, ellərin, habelə Vərəndə və Xaçın mahallarının qoçaq tüfənglilləri ilə birlikdə, başqa tərəfdən isə ellərin süvari sərkərdələri mərhum Pənah xanın şücaətli qohumları ilə bərabər hücum edərək Fətəli xan ordusu vurub-öldürməkdən əl çəkməyincə, onları dərin dərələrdə və dar keçidlərdə tutub öldürməyi davam etdirdilər.

Bu hücumda Fətəli xanın qoşunundan təxminən iki min nəfər piyada və süvari qırıldı və əsir düşdü. Məğlub olan (düşmən) sonsuz pərişanlıq və peşmanlıqla öz düşərgəsinə qayıtdı. Pənah xan isə əsirləri və ələ keçən qəniməti götürüb, qələbə və zəfərlə qalaya gəldi.

Bu hadisədən sonra Fətəli xan Əfşar, qoşununun məğlub olması və qış fəslinin yaxınlaşmasına görə, sülh və barışıq təklif etdi. Mahir elçilər göndərib, and-aman içərək belə vədə verdi: "Əgər Pənah xan, qoşunumdan aldığı əsirləri geri qaytarsa, mənlə ittifaq və dostluq etsə, qızımın kəbinini onun böyük oğlu İbrahimxəlil ağaya kəsdirəcəyəm. (Beləliklə də) biz əbədi qohum və dost olacağıq. Bir şərtlə ki, İbrahimxəlil ağanı mənim yanıma göndərsin. O isə orduda şirni içilib, kəbin kəsildikdən və iki-üç gün burada (qonaq) qaldıqdan sonra geri qayıtsın".

Pənah xanı xatircəm etmək üçün İbrahimxəlil ağa qayıdana qədər özünün övladı və qohumlarından üç nəfər adlı-sanlı şəxsi girov adı ilə saxlamaları üçün Pənah xanın yanına göndərmişdi.

Mərhum Pənah xan Fətəli xanın and-amanına, övladına və qohumlarını göndərməsinə inanıb, İbrahimxəlil ağanı bir neçə kətxuda ilə Fətəli xanın ordusuna yola saldı. Fətəli xan bu xəbəri eşitcək sevindi. Övladından bir neçə nəfəri onu qarşılamaq üçün göndərdi. İbrahimxəlil ağanı hörmət, təntənə və çalğı ilə orduya gətirdilər. Saatın nəhs olmasını bəhanə edərək, İbrahimxəlil ağanı iki gün ordugahda, kef məclislərində saxladılar. Bu müddət içərisində qalaya, Pənah xanın yanına dəfələrlə etimadlı, şirindilli adamlar göndərib, adətləri üzrə adam aldatmaq və öz işlərini düzəltmək üçün bütün fırıldaqları və lazım olan rəsmi mərasimi əmələ gətirdilər. O iki günün içərisində əsir və dustaqlarını xilas etdilər. Üçüncü gün isə İbrahimxəlil ağanı və kətxudaları dustaq kimi, özlərilə bərabər götürüb getdilər və Urmiya qalasına çatana qədər heç bir yerdə dayanmadılar.

Bu hadisədən mərhum Pənah xan və Qarabağın əyanları çox pərişan, peşman və məyus oldular. Nəhayət, qəmginliyin, çox peşmançılığın faydasız olduğunu düşünərək, İbrahimxəlil ağanı xilas və Fətəli xanı dəf etmək üçün məsləhət və tədbirlər görməyə başladılar.

Pərvərdigari-aləm, insi-cinsi yaradan xaliq hər anda və zamanda düzgün, vəfalı və haqşünas adamların dostu və köməkçisidir. Xüsusilə o, əhd-peymanda və sözündə möhkəm olan, alçaqlıq və peşmançılıqla nəticələnəcək məkr və hiylədən qaçan şəxslərə müvəffəqiyyət və qələbə bəxş edər. Buna görə də belə bir zamanda İraq və Fars torpaqlarında dövlət sahibi olmuş Kərim xan Zənd Allahın köməyilə tam istiqlaliyyət əldə etdi. O, adı çəkilən Fətəli xanla düşmənçiliyə başlayıb öz qohumlarından bir nəfəri[1] Fətəli xan müharibəsinə namizəd edərək onu İraq və Fars qoşunları ilə Azərbaycana göndərdi. Fətəli xan da bu xəbəri eşitcək, Kərim xanın qoşunları gəlib çatmamış, Azərbaycanın və ətraf (nahiyələrin) bütün qoşunları ilə onun qarşısına çıxdı. İki tərəfin qoşunu İsfahan yaxınlığında bir-birilə üzləşib döyüşə başladılar. Kərim xanın qoşunu məğlub, qoşun sərdarı olan qohumu isə döyüş meydanında həlak oldu. Fətəli xan zəfər tapıb, İraq vilayətinin bir parça yerlərini da aldıqdan sonra geri qayıtdı.

Bu hadisədən sonra Kərim xan Zənd intiqam almaq fikrinə düşdü. Çoxlu qoşunla Fars vilayətindən hərəkət edərək, Fətəli xanı

---

1 Mirzə Adıgözəl bəy yazır ki, Kərim xan Zend qardaşı İskəndər xanı böyük hazırlıq və təntənə ilə Fətəli xanın müharibəsinə göndərdi. B a x: bu kitabda səh. 54.

dəf etmək əzmilə Azərbaycana tərəf getdi. Azərbaycana çatmamış bir etimadlı adamını mərhum Pənah xanın yanına göndərib, ona qarşı olan lütf və mehribanlığını və onunla müttəfiq olmaq istədiyini bildirdi. Göndərdiyi məktubunda belə yazmışdı: "Fətəli xan bizim nəinki təkcə düşmənimiz, hətta qanlımızdır. Sizə qarşı da olduqca yaramaz işlər görmüş, andını, peymanını pozmuşdur. Sənin oğlunu məkr və hiylə ilə aparıb məhbus etmişdir. İndi var qüvvə ilə bizə kömək etməli və bu işdə heç şeydən müzayiqə etməməlisən. Çünki intiqam alsaq və oğlunu xilas etsək, siz sevindiyiniz kimi biz də arzumuza çatmış olacağıq".

Pənah xan yalançı və hiyləgər düşməni aradan qaldırmaq üçün qarşısına çıxmış belə bir təsadüfü qənimət bildi, müntəzəm qoşunu və Qarabağın adlı-sanlı süvarilərilə Azərbaycan torpağında Kərim xanla görüşdü. Kərim xan ona qarşı böyük izzət və ehtiram göstərib, ənamlar bəxş etdikdən sonra, Fətəli xanı birlikdə dəf etmək üçün Urmiya vilayətinə tərəf yola düşdülər.

Fətəli xan da ixtiyarında olan vilayətlərin çoxlu qoşunu ilə onların qarşısına çıxdı. Hər iki qoşun müharibəyə başladı. Nəhayət, Fətəli xan məğlub olub Urmiya qalasına çəkildi. Bir neçə gündən sonra itaətdən başqa çarə görməyib, Kərim xanın isə ümidverici vədlərini eşidib onun yanına gəldi[1]. Kərim xan Urmiya qalasını ələ keçirib müstəqil oldu.

İranda hələ müstəqil padşah olmadığından Kərim xan özünə İran şahının vəkili adı və ləqəbi verib deyirdi: "Bir padşah aralığa çıxıb taxta oturmayınca mən padşahın vəkiliyəm". Ona görə də Kərim xanı vəkil adlandırdılar. O, Urmiyada dustaq olan İbrahimxəlil ağanı zindandan buraxdırıb öz yanına çağırdı, ona at, qılınc, xələt və Qarabağ xanlığı və hakimiyyəti fərmanını verib, hörmət və təmtəraqla Qarabağa yola saldı. Pənah xana qarşı olan məhəbbətinə görə ona lütf və mehribanlıq göstərib dedi: "Mənə qarşı göstərdiyin sədaqətin və köməyin əvəzini çıxmaq üçün bir neçə müddət mənim yanımda qalmağını xahiş edirəm". Onu özü ilə bərabər Şiraza apardı.

Mərhum İbrahimxəlil xan Qarabağa gəldi. Qarabağın və başqa vilayətlərin camaatı ona itaət etdi, o isə hökumət və xanlıq taxtına çıxıb kimsəyə itaət etmədən, müstəqil olaraq hökmranlıq etməyə başladı.

---

1 Bakıxanovun yazdığına görə bu hadisə 1176 (1763)-cı ildə baş vermişdir (bax: A.Bakıxanov. "Gülüstani-İrəm", Bakı, 1951, səh. 165).

Mərhum Pənah xan az bir müddət Kərim xanın paytaxtı olan Şirazda qaldıqdan sonra əcəli çatıb, Şirazda Allahın rəhmətinə getdi. Cənazəsini böyük hörmətlə Qarabağa gətirib, indi Ağdam adı ilə məşhur olan, özünün satın aldığı halal mülkündə dəfn etdilər. Allah ona rəhmət eləsin.

İşlərin gedişi və baş vermiş hadisələrdən məlumdur ki, mərhum Nadir şah öləndən sonra rəhmətlik Pənah xan on iki il davam edən hakimiyyəti dövründə həmişə fəth, zəfər, bəxt və dövlət sahibi olmuşdur. Azərbaycan vilayətinin çox hissəsi onun hökmü və itaəti altında idi.

Kərim xan Fətəli xanı özü ilə aparıb, İsfahanın yaxınlığında, qohumu müharibədə öldürüldüyü yerdə öldürdü. (Beləliklə də) ondan intiqamını aldı. Habelə mərhum Pənah xana yalandan and içdiyi, məkr və hiylə işlətdiyi üçün Allah onu cəzasına çatdırdı. Məkr, hiylə və yalan toxumundan peşmançılıq və zərərdən başqa bir şey bitməz. Allah məkri, hiyləni, yalandan and içməyi və əhdi pozmağı öz bəndələrinə qadağan etmişdir. Təcrübədə təsdiq olmuşdur ki, dosruna, xeyirxahına, böyüyünə yalan danışan, hiylə və xəyanət işlədən, Allahın əmrilə böyüklüyə çatmış böyük şəxsin mərhəmətini saymayıb, ona xor baxan adamın cəzası həmişə zərər və peşmançılıq olmuşdur. "Allah mükafat və cəza verəndir. (O), xeyir işə mükafat, şər işə (isə) cəza verər".

## BEŞİNCİ FƏSİL

## MƏRHUM İBRAHİM XANIN HAKİMİYYƏTİ VƏ O ZAMANIN QAYDALARI VƏ HADİSƏLƏRİ HAQQINDA

Mərhum İbrahim xan müsəlman tarixi ilə 1174-cü, xristian tarixi ilə 1756-cı ildən[1] 1221 (1806)-ci ilə qədər Qarabağ hökuməti taxtında oturmuş, İran və Rum padşahlarına itaət etmədən və boyun əymədən müstəqil hökmranlıq etmişdir. Onun hökmü və fərmanı

1 Hicri 1174-cü il 1760-61-ci ilə bərabərdir. Mirzə Adıgözəl bəy yazır ki, İbrahim xan Qarabaği hakimliyə 1173 (1759)-cü ildə təyin olunmuşdur.

Şirvan, Şəki, Gəncə, İrəvan, Naxçıvan, Xoy, Qaradağ, Təbriz, Ərdəbil vilayətləri, hətta Marağa, İraq və Azərbaycan sərhədi olan Qaplankuhda belə işlərdi. Vilayətlərin xanları mərhum İbrahim xanın hökmü və əmri ilə təyin edilər və ya vəzifədən götürülərdi[1]. O, Avar və Dağıstan valisi Ümmə xan Nüsal xan oğlunun möhtərəm bacısını alaraq onunla qohum olmuşdu. Zərurət zamanı İbrahim xan Dağıstan və ləzgi vilayətindən qoşun istəyərək, onu Ümmə xan və başqa sərkərdələrlə birlikdə Qarabağ vilayətinə gətirib öz övladı, sərkərdələri və Qarabağ qoşunu ilə lazım gələn yerlərə göndərər, istədiyi adamı tənbeh edər və itaəti altına alardı.

Bundan başqa, Şahsevən, Qaradağ, Xoy və Gəncə vilayətlərinin xanları ilə də qohum olmuşdu. Bunların hamısı ya güc, ya da qohumluq vasitəsilə onun itaətini ürəkdən qəbul etmişdilər. O, hətta Təbriz və Qaradağ vilayətlərinin bəzi mahallarını öz adlı-sanlı sərkərdələrinə bağışlamışdı ki, onların gəlirindən mənfəət götürsünlər. Padşah adı daşımadığına baxmayaraq, İbrahim xanın dövlət və calalı İran padşahlarının cah-calalından əskik deyildi. Adı çəkilən vilayətlərin xanlarının övladı həmişə Şuşa qalasında, mərhum İbrahim xanın yanında girov sifətilə yaşayırdılar.

Bu vəziyyət Şirazda girov halında saxlanılan Ağa Məhəmməd xan Məhəmmədhəsən xan oğlu Qacarın, Kərim xanın vəfatından sonra (o şəhərdən) qaçdığı günlərə qədər davam edirdi.

Səltənət iddiasında (olan Ağa Məhəmməd xan) bir neçə il çalışdıqdan sonra İraq və Farsı tutub, Tehran şəhərini paytaxt etdi. O, müsəlman tarixilə 1107 (1695-1696)-ci ildə[2] Azərbaycan vilayətinə gəlib, İrəvan və Talış vilayətindən başqa, Arazın cənub tərəfində olan bütün vilayətləri aldı.

Bu hadisələrdən əvvəl o, İbrahim xana xələt, qılınc, qızıl yəhər və əsbablı at göndərib, itaətə dəvət etmişdi. Aralarında zahiri hörmət və dildə itaət var idi. Elçilər gəlib-gedirdi. O cümlədən İbra-

1 Burada müəllif açıqdan-açığa mübaliğə edir. Ətraf vilayətlərin xanlarına böyük təsiri olduğuna baxmayaraq İbrahim xan, İran dövlətindən icazəsiz xanları təyin etmək və ya vəzifədən kənar etmək iqtidarına malik deyildi. Xüsusilə Təbriz, Xoy, Marağa və İrəvan xanları heç bir vaxt ondan asılı olmamışlar. Bu mübaliğə Mirzə Adıgözəl bəydə də müşahidə olunur. Ehtimal etmək olar ki, Mirzə Adıgözəl bəy əsərini yazdığı vaxt Mirzə Camalın kitabından istifadə etmişdir (b a x: bu kitabda səh. 57).

2 Bu tarix yanlışdır, 1207 (1792-1793)-ci il olmalıdır.

him xan girov adı ilə şirin dilli, bacarıqlı bir şəxs olan Mirzə Vəli Baharlı ilə birlikdə əmisi oğlu Əbdüssəməd bəyi onun yanına göndərmişdi. Şah da onlara olduqca hörmət edib, öz yanında saxlayırdı.

Bu arada Ağa Məhəmməd xan Kirmanda səltənət iddiasında olan düşməni, qoçaq və səxavətli Lütfəli xan Zəndə qalib gəlib, Kirman əhalisinin hamısını qırdı. İbrahim xanla Ağa Məhəmməd şahın arasını poza biləcək bəzi işlər üz verdi. Əbdüssəməd bəy, Mirzə Vəli Baharlı və neçə nəfər nökəri ilə Kirmandan qaçdı. Bunların ardınca atlılar göndərildi. Çaparlar gecə-gündüz yol gedərək, onlardan qabağa düşüb, Sərcəm kəndi əhalisinə xəbər verdilər. Atlı və piyadalar Qızıl Özən çayının kənarında yolun üstünü kəsib Əbdüssəməd bəylə vuruşdular. Əbdüssəməd bəy güllə ilə dizindən yaralandı. Onu yoldaşları ilə bərabər tutdular. Mirzə Vəli də tutuldu. Əbdüssəməd bəy həmin yaradan orada vəfat etdi. Başqa dustaqları Mirzə Vəli ilə birlikdə şahın yanına aparıb, Tehran şəhərində həbs etdilər.

Ağa Məhəmməd şah Şuşa qalası altında olanda mərhum İbrahim xanın elçiləri hərdənbir onun yanına gəlib-gedərdilər. Bir gün Ağa Məhəmməd şah İbrahim xanın sifarişlərindən qəzəblənib dustaqların edamı haqqında fərman verdi. Onun əmrilə Mirzə Vəlini Tehranda topun ağzına bağlayıb atdılar. On nəfərdən ibarət olan başqa dustaqları da öldürdülər. Onlardan heç birini sağ qoymadılar. Allah onlara rəhmət eləsin.

## ALTINCI FƏSİL

## (BƏZİ) HADİSƏLƏR VƏ AĞA MƏHƏMMƏD ŞAHIN ÖLÜMÜ HAQQINDA

İbrahim xanla Ağa Məhəmməd şahın münasibəti pozularaq aralarında inciklik əmələ gəldiyindən (şah) 1209 (1794-95)-cu ildə Tiflis, İrəvan, Qarabağ və Talış vilayətlərini qəsb etmək üçün böyük ordu və çoxlu əsgərlə Azərbaycana tərəf hərəkət etdi. Əvvəlcə, sərkərdələrinin ən görkəmlisi olan Əliqulu xan Şahsevəni başqa xanlarla birlikdə İrəvan qalasının üstünə göndərdi. Özü isə bütün İraq, Fars, Azərbaycan və Xorasan qoşunları ilə Şuşa qalasının üstünə gəlib, qalanın bir ağaclığında, Gövaxan düşərgəsində ordusunu yerləşdirdi.

Tiflis valisi şövkətli İrakli xan, İrəvan hakimi Məhəmməd xan və Talış hakimi Mir Mustafa xan, Ağa Məhəmməd şahın itaətini qəbul etməyəcəkləri və bir-birinə kömək edib, müttəfiq olacaqları haqqında İbrahim xanla and içmişdilər. (Buna görə İbrahim xan) Qarabağ ellərinin bir parasını Tiflisə, bir parasını isə Şirvan vilayətinə özü təyin etdiyi Mustafa xanın yanına göndərdi. Siyahı və dəftərdə adları qeyd olunmuş yerdə qalan elləri və qoşunu Qarabağ dağlarında və qala içərisində yerləşdirib, Qarabağ elləri və mahallarında çoxlu piyada və atlı topladı; qalanı qorumaq üçün lazım olan bütün vəsaiti, böyük və kiçik topları qurdurub, şahla müharibəyə hazırlaşdı.

Ağa Məhəmməd şah, otuz üç gün qala ətrafında qaldığına baxmayaraq, o qədər böyük qoşunla qalanın beş verstliyindən axan çaydan keçə bilmədi. Qarabağın atlı və piyada qoşunu, ellərin, kəndlərin sərkərdələri, Vərəndə, Dizaq və Xaçın mahallarının məlikləri meşədə, yollar və keçidlərdə Qızılbaş qoşununu tutub qarət edirdilər. Hər gün dəstə-dəstə at, qatır, dəvə və başqa tədarükatı, ordu üçün vilayətlərdən göndərilən taxıl karvanlarını qarət və əsir edərək, mərhum İbrahim xanın yanına gətirdilər. İş o yerə çatmışdı ki, o vaxtın hesabilə bir qatırı dörd manata, dəvəni altı, bir baş yaxşı atı isə on manata satırdılar. Düşmən Qarabağ qoşununun gecə basqınlarından qorxaraq, ordugahın ətrafında möhkəm bürclər tikmişdi. Bir gecə Vərəndə mahalının piyadaları böyük bir dəstə ilə gedərək, Ağa Məhəmməd şahın özünəməxsus tüfənglilərі tərəfindən mühafizə olunan böyük bir bürcü alıb, bir saatın içərisində bütün tüfənglilərі qırdılar və sağ qalan iki-üç nəfəri gün çıxan vaxtı mərhum İbrahim xanın yanına gətirdilər. İstər gecə, istərsə gündüz Qızılbaş qoşununu bir an belə rahat qoymurdular. Üç-dörd dəfə şah özü böyük qoşunla çayı keçmək və qalaya yaxınlaşmaq istədi. Bu tərəfdən cəld piyadalar, qoçaq süvarilər sərkərdələrlə birlikdə (şahın) qabağına çıxıb, qəhrəmancasına döyüşdülər və onu məğlub edərək geri qaytardılar.

Bu arada Gəncə hakimi Cavad xan vaxtilə mərhum İbrahim xandan üz çevirmiş və Gəncə vilayətinə gedib, Cavad xanın yanında gün keçirən Çiləbörd mahalının məliki Məlik Məcnunla birlikdə Ağa Məhəmməd şahın yanına gəldi. Ağa Məhəmməd şah bunların məsləhətilə min məğlubiyyət və pərişanlıqla qalanın yanından köçüb, Gürcüstanı istila etmək məqsədilə Tiflisə tərəf hərəkət etdi.

Mərhum İbrahim xan şahın hərəkətindən qabaq şövkətli Gürcüstan valisinə belə xəbər göndərdi: "Ağa Məhəmməd şah qalanı işğal etməkdə aciz qalmışdır, qoşununa və ordusunun minik heyvanına çoxlu ziyan dəymişdir. Bu məğlubiyyətini düzəltmək üçün Tiflisi almaq və Gürcüstanın kəndlərini qarət etmək fikrindədir. Onun fəsadının və istilasının qarşısını almaq tədarükündə olun".

Ağa Məhəmməd şah həqiqi mühasirə dövrü keçirmiş qoşununun və heyvanlarının istirahəti üçün ordusunu Ağdam ətrafında yerləşdirdi. Burada bir aydan artıq istirahət etdikdən sonra, Gürcüstan vilayətini və Tiflis şəhərini almaq üçün yola düşdü. Cavad xanla Məlik Məcnun hər yerdə qoşunun qabağında gedib şaha bələdçilik edirdilər. Tiflisə çatdıqdan sonra, qısa bir müddət ərzində şəhəri işğal edərək[1] yandırdılar. Şəhərin və yaxın kəndlərin əhalisini qarət və əsir etdikdən sonra Azərbaycana qayıtdılar. Hər yerdə Kür boyu ilə irəliləyərək Cavad kəndi yaxınlığında Arazdan keçdilər. Muğan düzündə qışlaq qurub, qışı orada başa verdilər.

Yaz vaxtı, İrəvan qalası və vilayəti hələ işğal olunmadığı bir halda, Fars ölkəsində yenə həyəcan, Kirman və sairədə iğtişaşlar üz verməkdə idi. (Buna görə şah) işləri nəzmə salmaq üçün Fars vilayətinə getdi.

Haman yaz fəslində, şah Farsda olduğu zaman, İbrahim xan Dağıstandan qoşun gətirtdirib Gəncəni mühasirə etdi. Tiflisin bərbad olmasına (Cavad xan) bais olduğu üçün İbrahim xan bu işə Gürcüstan valisini də cəlb etdi. Oğlu və bacısını İbrahim xanın yanına girov göndərdi. Bir daha İbrahim xanın itaətindən çıxmayacağına söz verdi. Məlik Məcnun isə vuruşma zamanı öldürüldü.

Ağa Məhəmməd şah hələ Fars və Xorasan torpağında olduğu zaman, böyük sərdar general-anşef qraf Valerian Zubov əzəmətli imperatriçə Yekaterinanın əmri və fərmanı üzrə saysız-hesabsız qoşunla Dərbəndə çatıb[2] qalanı aldı. Oradan Şamaxıya gəlib şəhərin yaxınlığında ordu qurdu.

Mərhum İbrahim xan oğlu Əbülfət xanı Qarabağın bir neçə bəyzadəsi ilə birlikdə töhfə, hədiyyələr və cins atlarla, tam bir razılıq və rəğbətlə, böyük sərdar Valerian Zubovun hüzuruna göndərib,

---

1 Ağa Məhəmməd şah Tiflis şəhərini 1795-ci il sentyabrın 12-də almışdır.

2 Qraf Zubovun qoşunu 1796-cı il may ayının 2-də Dərbəndə yaxınlaşdı.

yüksək Rusiya dövlətinə səmimi-qəlbdən itaət edəcəyini və sədaqətini bildirdi. Əzəmətli imperatriçənin adına səmimiyyət və sədaqətini andıran bir ərizə də yazdı.

Böyük sərdar Əbülfət xanı və Qarabağ bəyzadələrini lazımi hörmət və təzimlə qarşılayıb, İbrahim xanın ərizəsini xanın etimadlı adamı və öz eşikağası ilə Dərbənd və Qızlar yolu vasitəsilə əzəmətli imperatriçənin hüzuruna göndərdi. Bir knyaz vasitəsilə İbrahim xana qiymətli töhfə və hədiyyələr göndərib, onu əzəmətli padşahın əbədi mərhəmətinə ümidvar etdi.

İbrahim xanın oğlunu böyük sərdarın yanına göndərməsi xəbəri ətraf xanların qulağına çatdıqda Tahş xanı Mir Mustafa xan, şirvanlı Mustafa xan, Cavad xan, hətta İrəvan, Naxçıvan, Xoy və Qaradağ xanları mərhum İbrahim xanın yanına elçilər göndərib dedilər ki, biz İbrahim xanın məsləhətindən çıxmarıq. (O), Rusiya dövlətinə itaət etməyi məsləhət gördüyü üçün biz də mərhəmətli Rusiya padşahına səmimiyyətlə itaət etməyi qəbul edəcəyik. İbrahim xan xanlardan aldığı bütün məktubları təzədən böyük sərdar Zubovun hüzuruna göndərdi.

Gürcüstan valisinin Şirvan, Xoy, İrəvan və başqa xanlara nisbətən daha qədim ocaq, geniş torpaq və böyük dövlət sahibi olduğuna baxmayaraq, o, İbrahim xanın məsləhətindən kənara çıxmırdı. Çünki Avar və Dağıstan hakimi mərhum Ümmə xan və o yerlərin başqa əmirləri İbrahim xana yaxın və qohum olduqları üçün ona itaət edirdilər. Gürcüstan valisi ilə mərhum İbrahim xanın arası pozulduğu zaman Ümmə xan və başqa Dağıstan xanları İbrahim xanın göstərişi üzrə böyük qoşunla Gürcüstana gedib, çoxlu ziyanlar verirdilər. Məsələn, 1199 (1784-1785)-cu ildə İbrahim xanla valinin arası pozulduğu zaman, Avar hakimi Ümmə xan böyük qoşunla Gürcüstana gedib, Sıqnaq qalasını və Gümüşxananı zəbt etdi, çoxlu adam qırdı, əhalinin yerdə qalan əyal və uşaqlarını əsir edərək, bir çox ətraf kəndləri qarət elədi. Oradan Axısxa vilayətinə, Süleyman paşanın yanına gedərək qışı orada qaldı. Rum sultanından çoxlu xələt və ənam aldı. Yazda yenə Gürcüstandan Dağıstana qayıtdığı zaman keçid və sərhəd başında olan Vaxan qalasını mühasirə etdi. (Gürcü) knyazlarından knyaz Abaşidze öz əhli-əyalı ilə bu möhkəm qalada yaşayırdı. (Ümmə xan) qalanı zəbt edərək, camaatın çoxunu öldürdü. Qalanın yerdə qalan arvad-uşağını əsir, mal-dövlətlərini

isə qarət etdi. Knyaz Abaşidzenin bir qızını bir para şeylərlə töhfə və hədiyyə olaraq İbrahim xanın yanına göndərdi. İbrahim xan isə onun kəbinini özünə kəsdirdi. Knyaz Abaşidzenin o qızından bir oğlan və bir qız oldu. Knyaz Abaşidzenin başqa bir qızını Ümmə xan aldı. Bu cəhətdən valinin İbrahim xana ehtiyacı çox idi. Şirvan, Şəki, Gəncə, İrəvan, Xoy, Qaradağ, Naxçıvan, Talış və Təbriz xanları, habelə Şahsevən və Şəqaqi xanları mərhum İbrahim xana itaət edərək, onun sözündən çıxa bilmədikləri də buna bir səbəb idi. Tiflis valisi də ehtiyat edərək, yüksək Rusiya dövlətinə səmimiyyətlə itaət etməyə razılıq verdi, elçi və ərizə göndərdi.

Hamı yüksək (Rusiya) dövlətinə itaət etməyə hazırlaşdığı zaman, əzəmətli imperatriçə vəfat etdi[1]. Böyük sərdar Zubov Əbülfət xanı, Qarabağın bəyzadə və kətxudalarını böyük hörmət və çoxlu ənamla yola salıb, mərhum padşah Pavelin əmrinə görə geri qayıdacağını İbrahim xana xəbər verdi.

Bu xəbər həm qəm-qüssəyə, həm də Ağa Məhəmməd şahın ədavətinin artmasına səbəb oldu. Çünki o, mərhum İbrahim xanı tələfat vermədən, xoşluq və mülayimliklə özünə tabe etmək fikrində idi. Lakin İbrahim xanın müharibəsiz əbədi Rusiya dövlətinə itaət edib, səmimiyyət göstərməsi, islam və İran padşahından üz çevirməsi onu olduqca qəzəbləndirmişdi. (Buna görə) mərhum İbrahim xanı yox etmək qərarına gələrək, yaz fəslində böyük qoşunla Azərbaycana tərəf hərəkət etdi[2].

Qarabağ vilayətində üç il davam edən quraqlıq nəticəsində taxıl və başqa bitkilər məhsul vermədiyindən şiddətli qəhətlik baş vermişdi. Taxılın qiyməti o qədər qalxmışdı ki, hətta bir çetvert buğdanı o vaxtın pulu ilə 45 manata güclə almaq olurdu. İş çətinliyə düşdü. Ağa Məhəmməd şah Qızılbaş qoşunu ilə Araz çayı kənarına çatdı. Azuqənin qəhətliyindən və son neçə ilin əziyyətindən sonra Şuşa qalasında belə bir güclü padşahın qarşısında durmaq çətin idi. Əlacsız qalan (İbrahim xan) arvad-uşağı, qohumları, məruf bəylərin ailəsi və sədaqətli xidmətçiləri ilə birlikdə qaladan köçüb, Car və Tala tərəfə getdi ki, orada dayanıb Dağıstan, Gürcüstan və başqa

1 İmperatriçə II Yekaterina 1796-cı il noyabr ayının 6-da vəfat etmişdir.

2 Bu hadisə 1797-ci ildə baş vermişdir. B a x: N.Dubrovin ("История войн и владычества русских на Кавказе"), c. Ill, SPb, 1886, səh. 209.

vilayətlər kömək edərlərsə, tədarük görüb müharibəyə hazırlaşsın, əks təqdirdə oradan Dağıstana, öz qohumu Avar hakimi Ümmə xanın evinə gedərək Ağa Məhəmməd şahın əziyyətindən qorunsun.

O zaman mərhum xanın yanında olub, ondan ayrılmaq istəməyən xanlar arasında kürəkəni Nəsir xan, Əta xan Şahsevən, yenə kürəkəni olan Şəki vilayətinin hakimi Səlim xan, Şəki vilayəti və Şahsevən bəyləri və onların övladları da var idi.

Ağa Məhəmməd şah Araz qırağında İbrahim xanın qaladan çıxıb getdiyini eşitdikdə ardınca sərkərdələrlə birlikdə iki minə yaxın atlı göndərdi, Gəncə yolunda və ya Kür kənarında xəbərdar olub, ona çatmalarını əmr etdi. Göndərilən haman Şahsevən qoşunu Tərtər çay körpüsünün yaxınlığında mərhum İbrahim xanın köç və camaatına çataraq döyüşə başladı. Köç-külfətə və başqa adamlara bir zərər toxunmadı. Onlar köçün bir para şeylərini qarət edib geri qayıtdılar.

İbrahim xan Kür çayı və Şəki vilayətindən keçərək, Balakən və Car torpağına gəldi. Car və Tala kətxudaları və başçıları mərhum İbrahim xanı başqa xanlarla birlikdə tutub Dağıstana buraxmamaları haqqında Ağa Məhəmməd şahdan fərman aldıqlarına baxmayaraq Car, Balakən və İlisu əhalisi uzun müddət İbrahim xandan məhəbbət və ənam gördüklərindən və həmişə onun itaətində olub, əmrlərini icra etdiklərindən (xanın) qeydinə qaldılar. Ona lazım olan xeyirxahlıq, hörmət və qonaqpərəstlik göstərərək, onu özlərindən razı saldılar. Onu iyirmi gün Balakən torpağında saxladılar. Bu zaman Ağa Məhəmməd şahın Şuşa qalasında öldürülməsi xəbəri İbrahim xana çatdı.

Ağa Məhəmməd şahın öldürülməsinin təfsilatı belədir: İbrahim xan qaladan çıxıb Balakənə getdikdən sonra Ağa Məhəmməd şah heç bir maneəyə rast gəlmədən Şuşa qalasına girib bir həftə orada qaldı. Bir gecə xoşu gəlmədiyi işə görə Səfərəli bəy və Abbas bəy adlı iki nəfər yaxın xidmətçisinə acıqlanıb dedi: "Səhər açılan kimi hər ikinizə ağır cəza verəcəyəm". Onlar bilirdilər ki, şah heç vaxt öz dediyindən və buyurduğundan dönmür. Odur ki, canlarının qorxusundan səhər açılana qədər onu öldürməyi lazım bildilər. Sübh açılan zaman, şah yuxuda ikən şahın otağına girib iti xəncərlə onu öldürdülər. Qapıları bağladılar. Şahın cavahir bazubəndini, tacını və həmailini götürüb, Sadıq xan Şəqaqinin yanına getdilər və əhvalatı ona söylədilər.

Sadıq xan şahın qorxusundan onların sözünə inanmadı. Şaha heç bir inamı və xatircəmliyi olmadığından və həmişə canının qorxusunu çəkdiyindən bu əhvalatı da şahın hiyləsi təsəvvür edərək, onların sözünə inanmadı. Nəhayət, bir çox möhkəm andlardan sonra xatircəm oldu. Lakin yenə, böyük qorxu içərisində idi, əvvəlki qayda ilə Ağa Məhəmməd şahın yaşadığı İbrahim xanın böyük oğlu, rəhmətlik general-mayor Məhəmmədhəsən ağanın evinə girdi. Hər yerdə tam bir ədəblə irəliləyərək, şah yatan otağın pərdəsini qaldırdı. Baş əydi və yavaş-yavaş otağa girdi. Səfərli bəy nə qədər onu ürəkləndirirdisə də, o, yenə qorxurdu. Səfərli bəy qabağa düşərək, yorğanı şahın başından çəkdi və onun xəncərlə parçalanmış cəsədini ona göstərdi: Sadıq bəy tab gətirməyərək tez haman bazubəndi, tacı və həmaili götürüb öz mənzilinə gəldi və şayiə yaydı ki, şah ona Gəncə və Gürcüstana getməyi əmr etmişdir. Bütün adamlarını, Şəqaqi qoşununu və şahın qatillərindən biri olan Abbası özü ilə götürüb qaladan çıxdı. Səfərəli bəy qalada qaldı.

Sadıq bəyin getməsindən iki saat keçməmişdi ki, şahın öldürülməsi xəbəri qalanın içərisinə yayıldı. Qızılbaş xanları çaşmış və pərişan bir halda, toplaya bildikləri adamları ilə birlikdə dəstə-dəstə qaçmağa üz qoydular.

Şəhər əhalisi tökülüşüb, əllərinə keçən adamları soyundura-soyundura imarətə daxil oldular. İmarətin şeyləri - xalı-gəbəsi və şahın başqa qızıl, gümüş və cavahiratı qarət edildiyi zaman igidliyi və şücaətilə məşhur olan mərhum İbrahim xanın qardaşı oğlu Məhəmməd bəy xəbər tutaraq, bir neçə nəfər nökəri ilə imarətin qapısını kəsdi. Hər kəs əlinə düşəni aparmışdı. (O), yerdə qalan şeyləri camaatın əlindən aldı, cavahirdən və qızıldan (qayrılmış) alətləri, qızıl-gümüş qab-qacağı, xalı-gəbə, pul və başqa şeyləri tamamilə ələ keçirib, Məhəmmədhəsən ağanın evindən öz evinə apardı. Qalanın içərisində hökumət və divan işlərilə məşğul oldu. Ağa Məhəmməd şahın kəsilmiş başını öz məktubu ilə birlikdə qədim xidmətçilərindən[1] birinin vasitəsilə Balakənə mərhum İbrahim xanın yanına göndərdi. Şahın başı İbrahim xanın hüzuruna çatdıqda onun öldürülməsi hamıya yəqin oldu. Nəcabətin və ehtiramın tələbinə görə,

1 Mirzə Adıgözəl bəyin yazdığına görə, şahın kəsilmiş başını Balakənə qarabağlı Məhəmmədrəfi bəy aparmışdır (b a x: bu kitabda səh. 68).

şahın başını tam bir hörmətlə, qüsl və kəfən etdirib, lazımi dini mərasim qaydalarını bilən yaxşı mötəbər mollalarla Cara göndərərək, o yerin böyük adamlarının qəbiristanlığında dəfn etdirdi[1].

(Xan) bir para maneələrə görə Qarabağa gedə bilməyib, üç ay Balakəndə qaldı, hamı, xüsusilə Gürcüstan valisi, Gəncə hakimi Cavad xan və şirvanlı Mustafa xan töhfələr, hədiyyələr göndərib, onunla müttəfiq və bir olmaq arzusunda olduqlarını bildirirdilər. Çünki qüvvətli düşmən olan padşah artıq ölmüşdü. Bütün Azərbaycanın və başqa yerlərin xanları həmişə mərhum İbrahim xanın hökmü və itaəti altında olub, uzun müddət onun əzəmət və şövkətini gördüklərindən hər şeydən əvvəl istəyirdilər ki, onun mübarək xatırını özlərindən razı salsınlar, onunla möhkəm əlaqə saxlasınlar. Məhəmməd bəy isə mərhum İbrahim xan gələnə qədər Qarabağ vilayətində hökumət işlərilə məşğul idi.

Balakəndə bir ay qaldıqdan sonra Avar hakimi Ümmə xan və başqa Dağıstan sərkərdələri yeyinti və geyim şeylərindən ibarət böyük tədarük və çoxlu qoşunla mərhum İbrahim xanın yanına gəlib, belə bir böyük əmirin hörmətinə layiq qohumluq, mehribanlıq və qonaqpərəstlik mərasimini yerinə yetirdilər. Təkcə mərhum xana, onun adlı-sanlı oğullarına və Qarabağın bəylərinə deyil, hətta Şahsevən xanları və onların bəyzadələrinə də hörmət edib, xərc və azuqə verməkdə heç bir qüsur göstərmədilər.

Ümmə xanın gəldiyindən iki ay keçdikdən sonra, İbrahim xan Dağıstan qoşunu və sərkərdələri, habelə Şahsevən və Qarabağ camaatı ilə birlikdə Balakəndən Qarabağa tərəf hərəkət etdi. Qarabağ əhlinin onun əleyhinə çıxması, habelə cavanlıq qürurundan başqa, əlinə bu qədər dövlət və şahlıq vəsaiti düşən Məhəmməd bəyin şeytana uyub müxalifət göstərməsi və özündən başqasını tanımaq istəməməsinin qarşısını almaq üçün xan Qarabağa hərəkət etmədən əvvəl, o zaman Mehdiqulu ağa adlanan Mehdiqulu xanı Qarabağ bəylərinin bir neçə övladı ilə oraya göndərdi.

Məhəmməd bəy Mehdiqulu xanın bəyzadələrlə Qarabağa gəlişindən sonra səmimiyyətdən, düzlükdən və İbrahim xanın itaətindən çıxmayacağından danışırdısa da, ürəyində hakimiyyət həvəsinə

1 Mirzə Adıgözəl bəy yazır ki, İbrahim xan, şahın başını bir sovqat kimi Gürcüstan valisinə göndərdi (bax: bu kitabda səh. 68).

düşmüşdü. O, bir para dələduzu, xain və qorxaqları başına toplayıb, hökuməti öz əlinə almaq istəyirdi. Mehdiqulu xan zəruriyyətə görə onunla yumşaq rəftar edirdi, çünki pərdəni yırtmaqla bir iş görə bilməzdi. O, gah ətrafda, gah da qalanın içində gəzir, həqiqəti mərhum xana yazıb gözləyirdi. Bu xəbər mərhum İbrahim xana Kür qırağında çatdıqda övladlarının ən böyüyü mərhum Məhəmmədhəsən ağanı beş yüz nəfər ləzgi qoşunu və Qarabağ sərkərdələri ilə təcili olaraq yola saldı.

Mərhum xanın gəlmək xəbərini eşidən Məhəmməd bəy Qarabağ ellərini Araz kənarına köçürtmək və müxalifət etmək fikrinə düşdü. Mərhum Məhəmmədhəsən ağa, Məhəmməd bəyin qoşunu və tərəfdarlarının yığıncağı olan Kirs dağındakı qalanın üç verstliyinə çatdı. Qarabağ əhli, qoşunu və mərhum ağanı gördükdən sonra hamı dəstə-dəstə onun xidmətinə gəlib əlini öpdülər. (Məhəmməd bəyin) topladığı ellər, yerləşdirildikləri meşə və çöllərdə qalmışdılar. (Məhəmmədhəsən ağa) adam göndərib Məhəmməd bəyi öz yanına çağırdı. Əvvəlcə Məhəmməd bəy qorxuya düşdü, lakin sonra xatircəm olub Məhəmmədhəsən ağanın hüzuruna gəldi, mərhum Məhəmmədhəsən ağanın əlini öpüb xatircəmliklə onun yanında qaldı. (Məhəmmədhəsən ağa) Məhəmməd bəyin istiqlaliyyəti zamanında qarışıqlığa bais olan bir neçə cinayətkarı Məhəmməd bəyin gözü qabağında məsuliyyətə cəlb edib, cəzalandırmağı əmr etdi.

Qalanın içərisində olan Mehdiqulu xan mərhum ağanın gəldiyini və qoşunla qalanın yanından keçib getdiyini eşitdikdə, əmisi oğlu Məhəmməd bəyin adamlarını tutub həbs etdirdi. Məhəmmədhəsən ağa Qarabağ ellərini xatircəm edərək, bütün mahallara hökmlər yazdı, hamıya öz işi və kasıbçılığı ilə məşğul olmağı əmr etdi. Nəhayət, İbrahim xan qoşun əhli, yaxın adamları, Nəsir xan və Əta xan Şahsevənlə Qarabağa gəldi.

YEDDİNCİ FƏSİL

## AĞA MƏHƏMMƏD ŞAH ÖLDÜRÜLDÜKDƏN VƏ İBRAHİM XAN BALAKƏNDƏN QARABAĞA QAYITDIQDAN SONRA BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

Mərhum (İbrahim) xan Qarabağa gəlib hökumət taxtında oturduğu zaman vilayətin əhalisi qəhətlik və məşəqqət nəticəsində var-yoxdan çıxıb olduqca pərişan idilər. Ellərin çoxu Gürcüstan, Gəncə, İrəvan, Şirvan və hətta Rum vilayətlərinə dağılıb getmiş, mal-dövlətləri qarət olunmuşdu. Ətrafdakı xanlar üzdə itaətdən, dostluqdan dəm vururdularsa da, gizlində öz xeyirlərinə çalışırdılar. Belə xanlardan biri də şirvanlı Mustafa xan idi. İbrahim xan Balakəndə olan zaman Mustafa xan, İbrahim xanın kürəkəni Səlim xan Şəki hakimiyyətini ələ alıb, onun dövlətinə zərər yetirməsin deyə, Səlim xanın böyük qardaşını Şəkiyə hakim təyin etdi.

Məhəmməd bəy mərhum Məhəmmədhəsən ağa tərəfindən xatircəm edildikdən sonra başqa xanların övladı kimi mərhum Pənah xan sülaləsi arasında heç bir qorxu hiss etmədən yaşayırdı. Buna baxmayaraq, cavanlığı üzündən və dövlətinə məğrur olduğundan Kür qırağına gedib, şəkili Məhəmmədhəsən xanla dostluq etməyə başladı. Məhəmmədhəsən xan onu aldadıb dedi:

"Mən bir kor kişiyəm, Mustafa xanın hökmündən cana gəlmişəm. Gəl qızımı sənə verim, mənim yanımda qal; Şəki vilayətinin hakimiyyətini öz əlinə al".

Məhəmməd bəy bu sözlərə aldanıb öz adlı-sanlı qohumundan, möhtərəm əmisindən əl çəkərək Məhəmmədhəsən xanın yanına getdi. Məhəmmədhəsən xan isə onu gəlcək tutub həbs etdi; yanında olan bütün cavahiratına, puluna və başqa şeylərinə sahib oldu. Mustafa xan qədimdən Məhəmməd bəylə qanlı idi, çünki atasının əvəzinə onun atasını və qardaşını öldürmüşdü. Mustafa xan Məhəmmədhəsən xanın yanına adam göndərib Məhəmməd bəyi öz yanına gətirərək öldürdü.

Beləliklə, (Mustafa xan) mərhum İbrahim xanın qardaşı oğlunu öldürdüyündən qorxu çəkərək, yenidən Qarabağla düşmənçiliyə başladı. Digər tərəfdən Məhəmmədhəsən xan və Gəncə hakimi Cavad xan da Qarabağla düşmən oldular.

Bu zaman xəbər çatdı ki, Ağa Məhəmməd şah tərəfindən Şiraza və Fars vilayətinə hakim təyin edilmiş Sərdar Baba xan adlanan Fətəli şah, şahın qətli xəbərini eşitcək Tehrana gəlmiş və padşahın malına, xəzinəsinə sahib olub, şahlıq taxtında əyləşmişdir. Bu tərəfdən Şuşa qalasından qaçmış Sadıq xan Şəqaqi, Azərbaycanı başsız görüb, səltənət iddiasına düşmüşdü. O, başına çoxlu adam toplayıb Tehranı almaq və girov aparılan ailələrini geri qaytarmaq əzmilə İraqa tərəf hərəkət etdi. Lakin Fətəli şah, Sadıq xanın qarşısına çıxıb, onu məğlub edərək qaçırtdı. Sonra böyük hörmətlə mərhum İbrahim xanın yanına elçi göndərib, Ağa Məhəmməd şahın cəsədini tələb etdi və İbrahim xanın ona tabe olmasını arzu etdiyini bildirdi.

Qarabağ vilayətinin vəziyyəti olduqca çətin olduğundan, ətrafı isə düşmən və bədxahlar bürüdüyündən, İbrahim xan mülayimlik etməyi məsləhət bilərək, Ağa Məhəmməd şahın cənazəsini böyük ehtiramla Tehrana göndərdi.

Fətəli şah İbrahim xanın belə hərəkətini özü üçün xoşbəxtlik sanıb, onun adamların xələt və ənamla geri qaytardı. Ona xələt, qılınc göndərib, Qaradağın hökumətini bütün mədaxili ilə İbrahim xana bağışladı və onunla qohum olmaq istədiyini bildirib dedi: "Hər iki tərəfin xatircəmliyi üçün əziz və möhtərəm qızınız Ağabəyim ağam bizim hərəmxanaya layiq bilməlisiniz. O bizim hərəmxanamızın xanımı olmalıdır". (Xan) müşavirədən sonra bu işi məsləhət bildi.

O tərəfdən şah böyük tədarük görüb, yüksək xanları (İbrahim xanın) yanına göndərdi. Böyük hörmət və izzətlə Ağabəyim ağanın kəbinini kəsdirdi; onu qadınlarının möhtərəmi və hərəmbaşısı etdi. İbrahim xanın oğlu Əbülfət ağanı öz yanına apartdırıb, yüksək xanlar sırasında öz məclisində oturtdu. Onun xatirini həmişə əziz və möhtərəm tutardı. Hər il Fətəli şahın adından mərhum İbrahim xana və mərhum Məhəmmədhəsən xana xələt, qılınc, qızıl yəhər, əsbablı at və başqa bəxşişlər göndərilərdi. Bu vəziyyət yüksək Rusiya dövlətinin böyük imperatorunun sərdarı qoşunla Gürcüstan vilayətinə gələrək, müstəqil halda Tiflis şəhərində yerləşdiyi günə qədər davam edirdi.

Rusiya dövlətinin başçıları İrəvan, Gəncə, Şirvan və Qarabağ vilayətlərini zəbt etmək fikrində olmadıqları zamanda belə, mərhəmətli padşah mərhum Yekaterina vaxtından başlayaraq, qüdrətli Rusiya dövlətinin məhəbbəti İbrahim xanın ürəyində yerləşmiş və

ona qiyabi olaraq səmimiyyət və rəğbət bəslərdi. Bu səmimiyyət xüsusilə general-anşef Zubovun gəldiyi zaman daha da artdı. Ondan əvvəl belə İbrahim xan Gürcüstan valisi ilə dost olduğundan, bir-birinin mənafeyi və xeyrini gözlədiklərinə görə, xan valinin məsləhəti üzrə öz elçisini valinin elçisi ilə birlikdə Mazdok xəttində sərdar olan qraf Qudoviçin yanına göndərib, Rusiya dövlətinə qarşı olan itaət və səmimiyyətini bildirmişdi. İndi də (İbrahim xan) Tiflisə gəlmiş Rusiya dövləti sərdarının yanına elçi vasitəsilə məktub göndərib, özünün qədim səmimiyyətini təzələdi.

Sabiq Sərdar (Qudoviç) qayıtdıqdan sonra sərdarlıq vəzifəsinə general Kavalevski təyin olundu. (Xan) yenidən Kavalevskinin yanına elçi ilə hədiyyələr göndərib, öz dostluğunu bildirdi. Həqiqətdə də general Kavalevski elçiləri böyük hörmətlə qarşılayıb, xüsusi sovqat və töhfələr göndərərək mərhum İbrahim xanın haqqında olduqca mehribanlıq göstərdi.

Nəhayət, böyük sərdar knyaz Sisianov Gürcüstana gəldi[1]. Böyük knyaz qeyrətli və cəsur sərdar olduğundan başqa sərdarların əksinə olaraq, Car və Tala ləzgilərinin bir para hərəkətlərinə və Gəncə hakimi Cavad xanın intizamsızlığına dözə bilməyərək, Gürcüstan əhalisinin rahatlığını təmin etmək üçün Car və Tala ləzgilərini və Cavad xanı tənbeh etməyi lazım bildi.

O, xristian tarixilə 1803-cü ilin axırlarında gəlib, Gəncəyə neçə dəfə adam göndərib, Cavad xanı böyük imperatorun itaətinə və qalanı təhvil verməyə dəvət etdisə də[2] bir fayda vermədi. Haman il, ramazan ayının axırıncı gecəsi, orucluq bayramının axşamı hücum edərək qalanı aldı[3]. Cavad xan, oğlu Hüseynqulu ağa ilə ümumi qırğında öldürüldü, bütün əhli-əyalı əsir oldu. Şəhər əhalisinin bir parası qırıldı, yerdə qalanı isə nicat tapdı.

(Knyaz), mayor Lisaneviçi Gəncə qalasından mərhum İbrahim xanın yanına göndərib, onu mərhəmətli Rusiya padşahına itaət

---

1 Knyaz Sisianov Gürcüstana 1803-cü ilin fevral ayında gelmişdir (bax: AKAK, c. III, sənəd 1, səh. 4).

2 B a x: Knyaz Sisianovıın Cavad xana yazdığı 1803-cü il 29 noyabr və 9, 11, 26, 28, 29 dekabr tarıxli məktublar (AKAK, c. II, sənəd 1172, 1175-1179, səh. 588, 590-591).

3 Gəncə qalası 1804-cü il yanvar ayının 3-də səhər açılan zaman alınmışdır. B a x: Knyaz Sisianovun Qafqaz mülki qubernatoruna yazdığı 1804-cü il 8 yanvar tarixli, 5 nömrəli təliqə (AKAK, c. II, sənəd 1182, səh. 592).

etməyə dəvət etdi. Mərhum İbrahim xan cənab mayora xoş cavablar verərək, onu böyük ehtiramla və hörmətlə yazılmış məktublarla yola saldı.

1804-cü ilin bahar zamanı Fətəli şahdan qorxusu olan İrəvan hakimi Məhəmməd xan və Fətəli şahdan qaçaraq İrəvanda yaşayan Naxçıvan hakimi Kəlbəli xan sərdar Sisianovun yanına elçi göndərib kömək istədilər. (Onlar dedilər:) "Fətəli şah öz oğlu və vəliəhdi Abbas Mirzəni İrəvan üzərinə göndərmişdir. Əgər sərdar təşrif gətirib bizə kömək etsə, biz İrəvan qalasını sərdara verib, yüksək Rusiya dövlətinə tabe olmağı qəbul edərik".

Ona görə sərdar Sisianov İrəvana hərəkət etdi. Qızılbaş dövləti tərəfindən isə vəliəhd naibüssəltənə Qızılbaş qoşunu ilə gəlib çatdı. Arada vuruşma başlandı. Qızılbaşlar məğlub oldular[1].

Bu xəbər Fətəli şaha çatdıqda İrəvanın Rusiya dövləti əlinə keçməməsi üçün özü knyaz Sisianovun müharibəsinə gələrək, güclü qoşunla İrəvana girdi. Bir tərəfdən Fətəli şah, digər tərəfdən naibüssəltənənin qoşunu və başqa tərəfdən sərdarla bağladıqları əhdi pozub, qalanı ona təslim etməyən Məhəmməd xan və Bəlbəli xan Rusiya qoşununu dörd tərəfdən halqaya alıb, hətta Rusiya qoşununun azuqə yollarını da kəsdilər[2]. Bu qədər zəhmətə baxmayaraq, Rusiya qoşununa qalib gələ bilmədilər. Hər iki tərəfə çoxlu ziyan dəydi. Nəhayət, sərdar Sisianov Tiflisə qayıtmağı məsləhət bilib köçüb getdi. Fətəli şah da Azərbaycana və (oradan da) Tehrana getdi.

Şah, mərhum İbrahim xanla Rusiya sərdarı arasında dostluq əlaqəsinin olmasını və elçilərin gedib-gəlişini eşitdiyinə görə, İrəvandan qayıtdığı zaman Əbülfət xana beş min nəfərlik qoşun verib, atasına yardım və kömək göstərmək adı ilə Qarabağa, İbrahim xanın yanına göndərdi və tapşırdı ki, Məhəmmədhəsən ağanı bir neçə Qarabağ bəyzadələri ilə Fətəli şahın hüzuruna göndərsin. Əbülfət xan

---

1 Müharibə 1804-cü il iyun ayının 19 və 20-də, Üçkilsə (Eçmiədzin) yaxınlığında olmuşdur. Bu vuruşmada Sisianovun qoşunu Baba xan oğlunun sərkərdəliyi altında olan İran qoşunlarının hücumunu dəf etdi. B a x: Knyaz Sisianovun İrəvan hakimi Məhəmməd xana yazdığı 1804-cü il 22 iyun tarixli 316 nömrəli məktub (AKAK, c. II, sənəd 1231, səh. 615).

2 Bu hadisə 1804-cü il iyul ayının 2-də Rusiya qoşunları İrəvan qalasını mühasirə etdikdən sonra baş vermişdir (AKAK, c. II, sənəd 1168, səh. 810). Müqayisə et: Mirzə Adıgözəl bəy. "Qarabağnamə", bu kitabda səh. 104.

İbrahim xanın həyatının axırına qədər vəkil sifətilə Qarabağda qalsın və Əbülfət xandan icazəsiz və məsləhətsiz heç bir iş görülməsin.

Mərhum İbrahim xan Fətəli şahın belə təkliflərindən inciyib, Əbülfət xana ağır cavablar verərək, yazdı ki, Qarabağ torpağına girmədən geri qayıtsın. Əbülfət xan möhtərəm atasının sözünə baxmayıb, İbrahim xan və Məhəmmədhəsən ağa Dizaq mahalının Tuğ kəndində olduqlarından, Qızılbaş qoşununu götürüb, o tərəfdəki dağların qoçaq tüfənglilərini, özünün işgüzar nökərlərini və başqalarını toplayıb, tam bir sürət və böyük izdihamla mərhum İbrahim xanın və öz böyük qardaşı mərhum Məhəmmədhəsən ağanın hüzuruna gəldi. Haman gecə Mehdiqulu xan da gəlib çatdı.

Səhər Əbülfət xan böyük dəstə ilə Tuğ kəndinə hücum etdi. Mərhum xanın və oğlanlarının yanında olan qoçaq rüfənglilər və adlı-sanlı atlılar hücuma keçərək, Qızılbaş qoşununu məğlub edib, (düşmən) ordusunun bütün at və heyvanını qarət etdilər. (Düşməndən) çoxlu əsir düşən və ölən oldu. Əbülfət xan Arazın o tayına qaçdı.

Fətəli şah bu xəbəri eşitdikdə, İbrahim xanın Qızılbaş dövlətindən bütünlükdə əl çəkməməsi və Rusiya dövlətinə meyil göstərməməsi üçün yumşaq hərəkət edərək, iki-üç nəfər xanı elçi adı ilə İbrahim xanın yanına göndərdi, Əbülfət xanı isə danlayıb məzəmmət etdi. Kərim xan, Rəhim xan və Abdulla xandan ibarət olan bu elçiləri mülayim və şəfqətli sözlər, möhkəm təəhhüdlər və qəliz andlarla dolu fərmanilə İbrahim xanın yanına göndərib söz verdi ki, bütün Qarabağ mahalını, şah xəzinəsinə çatmalı olan mədaxili ilə birlikdə əbədi olaraq mərhum İbrahim xan nəslinə verəcəkdir; övladlarından iki nəfərini də Şuşa qalasına, İbrahim xanın yanına girov göndərəcəkdir. Müqabilində İbrahim xan Şuşa qalasının üç ağaclığında, Tiflis və Gəncə yolunun üstündə olan Əsgəranın hər iki qalasını (Qızılbaş) qoşununa təhvil verməlidir. Rus qoşununun qabağını kəsmək üçün hər iki qala möhkəmləndirilib, içərisində qoşun saxlanmalıdır. Habelə qalanın bir ağaclığında olan çay, Şuşa qalasının üç verstliyindəki səngərlə birlikdə Qızılbaş qoşununun ixtiyarına verilməlidir. Beləliklə, hər iki çay, keçidlər və qalanın yolları Qızılbaş qoşununun əlində olmalıdır. Rusiya dövlətinin qoşunu Şuşa qalasına gəlmək istədikdə onun qabağını almaq üçün buralarda möhkəm səngərlər qurulmalıdır. Bir nəfər sərdar iki-üç min atlı ilə Şahbulağında oturmalı, Tiflis və Yelizavetpol tərəflərinin

işindən xəbər tutmalı və oralarda qətl qarət etməlidir. Heç bir kimsə İbrahim xanın itaət və əmrindən boyun qaçırmamalıdır. Qızılbaş qoşununun bütün məxarici Fətəli şahın xəzinəsindən veriləcəkdir. Kimsə Qarabağ vilayətinin zərrə qədər şeyinə belə tamah gözü ilə baxmayacaqdır. Qoşuna lazım olan sursat və başqa şeylər pulla satın alınmalıdır. Bunlardan məqsəd odur ki, Allahın əlilə yaradılmış, Gürcüstanın və Şirvanın qapısı olan möhkəm Şuşa qalası Rusiya dövləti qoşununun əlinə keçməsin.

Mərhum İbrahim xanın qızı Ağabəyim ağa Fətəli şahın baş hərəmi, oğlu Əbülfət xan isə əmirəlümərа və hörmət sahibi olduqlarına baxmayaraq o, yüksək Rusiya dövlətini əbədi, böyük imperatorun ədalət və mərhəmətini daimi sanıb, imperatorun mərhəmətinin dəyişilməz olduğuna inamı var idi. (Buna görə də) İran dövlətinə və onun mərhəmətinə məhəl qoymayıb, yenidən Tiflis şəhərinə elçi göndərdi. Sərdar Sisianovla görüşmək və itaət şərtlərini qurtarmaq istədiyini bildirdi.

Sərdar knyaz Sisianov İbrahim xanın elçisini hörmət və ənamla geri qaytarıb xəbər vermişdi ki, görüş yazda vilayətin yaxınlığında olacaqdır.

Buna görə 1805-ci il may ayının 1-də mərhum İbrahim xan, oğlanları general-mayor Məhəmmədhəsən ağa, general-mayor Mehdiqulu ağa, polkovnik Xanlar ağa və Qarabağın başqa əyanı ilə birlikdə böyük sərdar knyaz Sisianovun yanına getdi[1]. (Knyaz) onlardan qabaq gəlib, Kürəkçay kənarında ordu qurmuşdu. İbrahim xan etimadlı adam göndərib, kürəkəni olan Şəki vilayətinin hakimi Səlim xanı da buraya gəlməyə təşviq etdi və onu Şəki vilayətinin əyam ilə böyük sərdarın hüzuruna apardı.

Kürəkçayın qırağında bir neçə gün bayram, şənlik və qonaqlıq oldu. Sonra traktat və əhdnamə yazıldı. İbrahim xan və Şəki hakimi Səlim xan ona möhür basdılar, böyük sərdar isə ona qol çəkdi[2]. Bir-

---

1 B a x: Knyaz Sisianovun knyaz Çartoriyskiyə yazdığı 1805-ci il 9 may tarixli 298 nömrəli məkrub (AKAK, c. II, sənəd 1435, səh. 702). Müqayisə et: Knyaz Sisianovun, general-mayor Portnyakinə göndərdiyi 1805-ci il 23 may tarixli 605 nömrəli təliqə (AKAK, c. II, sənəd 1438, səh. 707). B a x: bu kitabda səh. 82.

2 İbrahim xanın Rusiya təbəəliyinə keçməsi haqqındakı traktat 1805-ci il may ayının 14-də, Səlim xanın isə Rusiya ilə bağladığı traktat həmin il may ayının 21-də imzalanmışdır (AKAK, c. II, sənəd 1436, 1437, səh. 705).

birinə böyük hörmət və ehtiram göstərdikdən sonra geri qayıtdılar, şərtə görə Məhəmmədhəsən ağanın ikinci oğlu Tiflisdə girov qalmalı oldu. Mərhum İbrahim xanın xahişinə görə bir dəstə rus qoşunu topxana ilə həmişə Şuşa qalasında xanın yanında qalmalı idi. Haman yığıncaqda İbrahim xana və Səlim xana general-leytenantlıq, mərhum Məhəmmədhəsən ağaya və Mehdiqulu xana general-mayorluq, mərhum Xanlar ağaya isə polkovniklik rütbələri verilməsi haqqında sərdarın vasitəçiliyi ilə padşaha ərizə yazıldı. Dörd aydan sonra bu iltifat və daimi məvacibli dərəcələrin verilməsi haqqında fərman gəlib çatdı.

Kürəkçay yığıncağından qayıtdıqdan sonra mayor Lisaneviç sərdarın əmri ilə bir dəstə yeger və topxana ilə qalanın 10 verstliyində olan Xanbağına gəldi. Bu zaman Qızılbaş qoşununun Araz qırağına yaxınlaşması xəbəri gəlib çatdı. Arazın suyu qalxmışdı. Çayı körpüdən başqa heç yerdə keçmək olmazdı. Buna görə Məhəmmədhəsən ağa Qızılbaş qoşununun Qarabağ torpağına girə bilməməsi və vilayətdəki ellərin, kəndlərin əkin yerlərinin tələf olmaması üçün yeger dəstəsini və mayoru götürüb, Qarabağın adlı-sanlı atlıları ilə birlikdə körpüyə tərəf getdi. Lakin Qızılbaş (qoşunu) onları qabaqlayıb körpüdən keçmiş və Qarabağ torpağına girmişdi. Qızılbaşlar Cəbrayılh bağları yaxınlığında rus və Qarabağ əsgərlərinə rast gəldilər. Bərk vuruşma oldu. Gecə mərhum Məhəmmədhəsən ağa Şuşa qalasının mühafizəsini məsləhət bilib, qoşunla qalaya qayıtdı. Qızılbaş qoşunu qalanın dörd ağaclığında olan Ağoğlana girdi. Beş minə yaxın qoşun isə Əsgəran qalası ətrafına gəlib, iki tərəfdən qalanı almaq fikrində idilər.

Mayor bu əhvalatı sərdara yazmışdı. Bu aradan İranın naibüssəl-tənəsi Çanaxçı kəndinə gəlib Əsgəran qoşununun yolunu gözləyirdi.

Polkovnik Karyagin və podpolkovnik Kotlyarevski böyük sərdarın əmrinə görə qoşun və topxana ilə Şahbulağı qalasının yaxınlığına çatdılar. Naibüssəltənə Çanaxçıdan köçüb, polkovnik Karyaginin üstünə getdi. Bunlar vuruşa-vuruşa Əsgəranın yaxınlığına çatdılar. Qızılbaş qoşunu hər yeri, bütün yolları və Əsgəran qalasını tutub möhkəmləndirdiyinə görə qoşunun və topların hərəkəti çətinliyə düşdü. Buna görə bir dəstə rus qoşunu orada səngərə girib, on bir gün ərzində, gecə-gündüz bütün Qızılbaş qoşunu ilə vuruşdu. Bundan başqa, rus qoşununun səngəri sudan da uzaq idi.

On bir gündən sonra polkovnikin və Kotlyarevskinin yaralandığına və rus qoşununun yarısının davada tələf olduğuna və yaralandığına baxmayaraq, üç yüzə yaxın soldat bütün topları götürüb, Vanya yüzbaşının bələdçiliyi ilə Şahbulağına qayıtdılar. O müharibədə böyük xidmətlər göstərmiş Vanya yüzbaşı indi Məlik Vanyadır.

Rus qoşununun qalaya girə bilməməsi üçün Şahbulağında çoxlu Qızılbaş piyadası qoyulmuşdu. Buna baxmayaraq, (ruslar) həmin gecə hücum edərək qalanı Qızılbaşların əlindən aldılar. Bir nəfər Qızılbaş xanı neçə nəfər piyada ilə birlikdə öldürüldü. (Ruslar) üç gün orda qaldıqdan sonra yenə Məlik Vanyanın bələdçiliyilə Goncəyə getdilər.

Fətəli şah özü də bütün Qızılbaş qoşunu ilə Qarabağa gəlib, Şuşa qalasının altı ağaclığında ordu qurmuşdu. Naibüssəltənə Abbas Mirzə də polkovnik Karyagin Gəncəyə getdikdən sonra Şahbulağının yaxınlığında ordu qurmuşdu. Bu zaman böyük sərdar Sisianov naibüssəltənə və Fətəli şahı məğlub etmək üçün rus qoşunu ilə Qarabağ torpağına daxil oldu. Naibüssəltənə Gürcüstanı viran və qarət etmək niyyətilə öz ixtiyarında olan qoşunla Qarabağdan köçərək Tiflisə tərəf getdi. Fətəli şah Ağoğlanda qalmışdı.

Bu zaman Rəştdən Fətəli şaha xəbər çatdı ki, rus qoşunu Xəzər dənizi yolu ilə Talış və Rəşt vilayətinə çıxmışdır. Şah bu xəbərə və sərdar Sisianovun gəldiyinə görə köçüb Ərdəbilə tərəf getdi.

Sərdar Sisianov Ağoğlanın iki ağaclığında olan Xonaşenə qədər irəlilədi. Burada şahın köçüb getdiyini eşitdikdə Şuşa qalasına gəldi. Burada bir para işlərə baş çəkib, yuxarıda adı çəkilən şərt və təəhhüdlərlə İbrahim xanın yanına elçi sifətilə gəlmiş üç nəfər Qızılbaş xanını özü ilə götürərək, böyük hörmət və razılıqla Tiflisə getdi. Haman ilin qış fəslində (knyaz) böyük Rusiya dövlətinin qoşunu ilə Kürdən keçib, Şirvan, Bakı, Quba və Dərbəndi tutmaq üçün Şəkiyə tərəf hərəkət etdi.

Böyük Rusiya dövlətinə səmimiyyət bəsləyən İbrahim xan öz istəkli oğlu Mehdiqulu ağanı Qarabağ qoşunu və bir neçə bəyzadə ilə birlikdə padşah əsgərləri sırasında tapşırılan vəzifələri yerinə yetirmək üçün sərdarın hüzuruna göndərdi.

Böyük (Rusiya) dövləti itaəti altında olan Şəki hakimi Səlim xan sərdarı lazım olan tədarükat və layiqli peşkəşlərlə Şəki vilayəti sərhədindən ötürüb Şirvan vilayəti sərhədinə çatdırdı.

Öz dövlətinə, gücünə və ölkənin çətin yollarına qürrələnən Mustafa xan bir neçə gün sərdara qürurla cavablar yazaraq, itaətdən boyun qaçırdı. Lakin qüdrətli rus əsgərləri, Qarabağ və Şəki qoşunu qarşısında müqavimət göstərə bilməyəcəyini və Qarabağ qoşununun flirsət tapıb Şirvan kəndlərinə əl uzatdığını gördükdə o, Mehdiqulu xanla Səlim xanın göstərişi ilə itaət edəcəyinə yalandan söz verdi, İbrahim xan və Səlim xan kimi müqavilə və əhdnamə yazıb, üzdə Rusiya dövlətinin itaəti altına girdi[1].

Böyük sərdar Şirvandan keçib Bakı tərəfə hərəkət etdi. Bu zaman mərhum İbrahim xanın xəstə olan böyük oğlu general-mayor Məhəmmədhəsən ağa Allah rəhmətinə getdi. Bu kədər gətirən hadisədən Qarabağ vilayətini qəm və pərişanlıq basdı. Ürəkdə rus dövlətinə itaət etməyə razı olmayan bir para adamlar Məhəmmədhəsən ağanın vəfatından, Mehdiqulu ağanın vilayətdən uzaqlaşmasından, mərhum İbrahim xanın xəstəliyi, yaşının çoxluğu və qüvvəsinin azlığından istifadə edərək, müqavilə və əhdnamənin əksinə olan işlər görməyə başladılar. Buna görə böyük sərdar Mehdiqulu xanı Qarabağ qoşunu ilə birlikdə geri göndərməyi məsləhət bilərək, onu ehtiram, izzət, layiqli ənam və xoş xəbərlər ümidi ilə Qarabağa qaytardı. Mərhum general-mayor Məhəmmədhəsən ağaya xüsusi səmimiyyəti və məhəbbəti olduğundan hörmətli cənab polkovnik Cəfərqulu ağaya sevgi və ehtiramını andıran məktub yazıb, mərhum Məhəmmədhəsən ağanın vəfatından son dərəcə təəssüfləndiyini, ona məhəbbət bəsləyib, qeydinə qalmağa hazır olduğunu bildirdi.

General-mayor Mehdiqulu xan Qarabağ qoşunu və bəyzadələri ilə möhtərəm atasının hüzuruna gəlib, böyük sərdarın məhəbbətli və ümidverici sözlərini söylədi. Fəsadlıq törədən bəzi şəxslərin qarşısını almağa başlayıb, yüksək (rus) dövlətinin qanunlarının yerinə yetirilməsi uğrunda çalışırdı.

Bu zaman xəbər çatdı ki, Hüseynqulu xan və onun adamlarından alçaq və pis hərəkətin baş verə biləcəyini güman etməyən böyük sərdar, Bakı vilayətində iki nəfər bəyzadə ilə birlikdə (xanla) söhbət etməyə getmiş və bu zaman pusquda oturmuş İbrahim bəy və iki nəfər başqa adam onu və yoldaşlarını güllə ilə yaralayıb öldür-

---

1 Mustafa xanra Rusiya təbəəliyinə kcçməsi haqqında traktat 1805-ci il dckabr ayının 25-də imzalanmışdır. B a x: Knyaz Sisianovun çara göndərdiyi 1805-ci il 27 dekabr tarixli 51 nömrəli raport (AKAK, c. II. sonəd 1366, səh. 674).

müş və bununla da özlərinin padşahın əsgərlərinə müxalif və düşmən olduqlarını bildirmişlər.

Bu xəbərdən İbrahim xan, övladı və vilayət əhli kədərlənib pərişan oldular. Çünki bunlar hələ Rusiya dövlətinin qayda-qanunlarından xəbərdar deyildilər. Fikirləri İrana gedirdi. Çünki orada belə bir böyük sərdar vəfat etsə idi, qoşunun və vilayətin işlərində böyük pozğunluq əmələ gələrdi. Əksinə, düşmənlə müharibədə rus dövlətinin bir neçə sərdan və sərkərdəsi öldürülsə belə, ondan yüksək dövlətin möhkəm qanun-qaydalarına heç bir xələl dəyməz və ölkədə heç bir iğtişaş baş verməz.

Sərdar Sisianov vəfat etdikdən sonra general Nesvetayev Tiflis şəhərində qoşunu və vilayəti idarə etməyə məşğul oldu. Mərhum İbrahim xanın adamı (elçisi) məhəbbət və səmimiyyət andıran məktublarla generalın yanına getdi. Hər cəhətdən xatircəmlik əldə edildi.

Həmin il, yəni 1806-cı ilin yaz fəslində Qızılbaş qoşunu Qarabağ torpağına yenidən hücuma keçməyə başladı. Gizlincə adamlar göndərib, mərhum İbrahim xana yenidən vədə və ümidlər verməyə davam etdilər.

Elə qüdrətli düşmənin qabağını almaq üçün Qarabağda mayor Lisaneviç və yeger dəstəsindən başqa qoşun olmadığından və məhsul vaxtı gəlib çatdığından İbrahim xan, Qarabağ elləri və kəndlərinin ayaq altında dağılmaması üçün qızılbaşlarla xoşluqla rəftar etməyə başladı. O hər bir iş barəsində mayorla məsləhətləşirdi. Mayor isə yüksək Rus dövləti qoşununun tezliklə gəlib çatacağını İbrahim xana vəd edirdi.

Həqiqətdə isə (rus) qoşunu çox yubandı. Qızılbaşlar və onların qoşunu qalanın iki ağaclığına çatmışdı. Mərhum İbrahim xan evini və köçünü Xan bağından köçürüb, qalanın yaxınlığına gətirdi. Dələ-duzlardan bir neçəsi mayora nə isə demişdilər. Gecə mayor bir dəstə qoşunla İbrahim xanın yaşadığı mənzilə getdi. Hökmü dəyişilməz olan fələkin qəzasından mərhum İbrahim xan bir neçə nəfər əhli-əyalı və yaxın adamı ilə orada öldürüldü[1].

---

1 Müəllifin oğlu Rizaqulu bu hadisəni daha geniş təsvir edərək yazır ki, o gecə on yeddi adam, o cümlədən İbrahim xan, arvadı Tuba xanım, qızı Səltənət bəyim, on iki yaşlı oğlu Kəbirli Abbasqulu ağa, Hacı Hacan, Əli bəy, Mirzə Haqverdi, qərvəndli Hümmət bəy, sarıcalı Külməli bəyin oğulları Cavanşir və Həsən ağa, nökərlərdən qərvəndli Əlipənah, əfşarlı Cavanşir və Mirzə Nəqi, kəbirli Əcəməlinin oğlu Hacı Həsən iki oğlu ilə, iki nəfər şelli və iki başqa adam öldürülmüşdür (bax : Mirzə Rizaqulu Camal bəy oğlu, Azərbaycan SSR EA Əlyazmaları fondu, inv. № B-470/5224).

General-mayor Mehdiqulu xan və polkovnik Cəfərqulu ağa qalanın içində idilər. Onlardan yüksək (rus) dövlətinə bəslədikləri səmimiyyət qaydaların poza biləcək heç bir hərəkət baş vermədi. Əksinə, qorxuya düşmüş xalqı sakitləşdirməyə çalışır, heç bir işdə cənab mayorun ziddinə getmirdi. Taxıl və ərzağın qıtlığına bax-mayaraq, qoşun üçün azuqə tədarük etməyə çalışırdılar. Qızılbaş qoşunu naibüssəltənə Abbas Mirzə ilə Ağoğlanda yerləşmişdi.

Mərhum İbrahim xanın başına gələn kədərli hadisədən on beş gün keçməmiş general Nebalsin qoşun və topxana ilə Şahbulağında göründü. Mehdiqulu xan qoşunun gəldiyini eşitcək Qarabağın adlı-sanlı atlıları, xidmətçiləri və bir neçə bəyzadə ilə, Qızılbaş qoşununun ətrafı və yolları tutduğuna baxmayaraq, qaladan çıxıb general Nebalsinin xidmətinə gələrək, rus qoşununa qovuşdu. Qoşun, Əsgəran qalası yaxınlığında ordu qurdu. Polkovnik Cəfərqulu ağa, mayor və yeger dəstəsi ilə qalanı qorumaq üçün (Şuşa) qalasında qalmışdılar.

General Nebalsin, İranın naibüssəltənəsinin Qızılbaş qoşunu ilə hücuma keçəcəyini ehtimal edərək iki gün gözlədi. Lakin bir əsər görünmədi. Buna görə belə məsləhət bildilər ki, Qızılbaş qoşununa tərəf getsinlər. Əgər onlar vuruşmaq istəsələr vuruşsunlar. Əks təqdirdə üzərlərinə hücum edib, onları Qarabağ torpağından qovub çıxartsınlar.

Naibüssəltənə, rus qoşununun ona tərəf hərəkət etdiyini eşitdikdə bütün qoşunu ilə köçüb, müharibəyə gəldi. Xonaşen mənzilinin yaxınlığında iki qoşun üz-üzə gəldi. Müharibə odu alovlandı. Mehdiqulu xan, adamları və Qarabağ qoşunu ilə daim yol göstərir, kömək edir, döyüş zamanı isə Qızılbaş qoşununu məğlub etmək uğrunda bilavasitə çalışırdı.

İyul ayının 15-də Xonaşen mənzilində yeddi saat davam edən döyüşdən sonra generalın tədbiri, Katlyarevskinin mərdliyi və Mehdiqulu xanın köməyi ilə Qızılbaş qoşunu məğlub edildi. Qoşunun bir parası öldürüldü, bir parası əsir düşdü, (qalanları isə) Araza tərəf çatdı. Katlyarevski də yaralandı. Otuz nəfərə yaxın zabit və əsgər yaralandı və öldürüldü.

General qoşun götürüb (düşmənin) ardınca Qozlu çaya qədər getdi, lakin onlardan əsər tapmadı. Naibüssəltənə ağır yükünü atıb qaçaraq, iki günün ərzində Qızılbaş qoşunu ilə Arazın o tayına keçdi.

Əbülfət xan, Qarabağın başqa qaçqın xan və bəyləri bütün elləri və neçə para kəndi köçürüb, Naxçıvan və Ordubad tərəfə apa-

rırdılar. Qızılbaş qoşununun məğlub olması xəbəri gəlib çatdıqda, polkovnik Cəfərqulu ağa, cənab mayor Lisaneviç ilə birlikdə adamlarını və ellərin məşhur atlılarını götürüb, Qarabağ camaatını geri qaytarmaq və Qızılbaş qoşununu dağıtmaq üçün Zəngəzur mahalı yolu ilə hərəkət etdi.

Onlar var qüvvələri ilə gecə-gündüz dayanmadan getdilər. Əsgərlər üçün dağlarda yol getmək çətin olduğuna baxmayaraq, onlar da arxadan gəlib çatırdılar. Nəhayət, Qarabağ atlıları, polkovnik Cəfərqulu ağanın başçılığı ilə Qapan və Ordubad dağlarında Qızılbaş qoşununa çataraq döyüşə başladılar. Dar dərələrdə iki minə yaxın Qızılbaş süvari və piyadasını məğlub edərək, hamısını tutub soyundurdular, atlarını, şeylərini, paltarlarını aldılar. Əsgərlər arxadan gəlib çatdıqda bütün Qızılbaş qoşununun bir parasını əsir, qalanını isə qaçmış gördülər. Sürülüb aparılmaqda olan Qarabağ el və camaatını qalanın yaxınlığındakı dağlara qaytardılar.

O zaman naibüssəltənə Araz qırağı tərəflərində idi.

Bir tərəfdən general Nebalsinin Mehdiqulu xanla birlikdə naibüssəltənəni məğlub etmələri, digər tərəfdən də mayorla polkovnik Cəfərqulu ağanın belə şücaət göstərmələri Qarabağ camaatını sakitləşdirdi və padşah əsgərlərinin gücünü nümayiş etdirdi. Hər kəs öz yerində yerləşib, rahat və asudə yaşamağa başladı.

Haman ilin qış fəslində general-anşef qraf Qudoviç böyük imperator mərhum Aleksandr Pavloviç tərəfindən sərdarlıq vəzifəsinə təyin olunaraq Tiflisə gəldi. General-mayor Nesvetayev Mehdiqulu xanın məktub və yazılarını öz ərizəsilə imperatorun hüzuruna göndərdiyinə görə, sərdar onu öz hüzuruna, Tiflisə çağırtdırdı.

Mehdiqulu xan bütün kətxudalar və ellərin bəyləri ilə bərabər Tiflisə gələrək qrafla görüşdü. O biri günü böyük yığıncaq oldu. Qarabağ hakimliyi fərmanı və əhdnamədən qeyd edildiyi kimi, cavahirə tutulmuş qılınc və padşahlıq bayrağı vədəsi Mehdiqulu xana verildi. (Sərdar) onu müxtəlif mərhəmətlər göstərəcəyi müjdəsi və ümidi ilə Qarabağa yola saldı.

Mehdiqulu xanın hakimiyyəti göstərilən tarixdən başlayaraq, 1822-ci ilin oktyabr ayına qədər davam etmişdir. Bunun təfsilatı yüksək dövlətin kargüzarları tərəfindən dəftərdə qeyd edildiyinə görə sizə məlumdur və mənim ərz etməyimə ehtiyac yoxdur.

FƏSİL

## BU VİLAYƏTLƏRİN KƏRAMƏTLİ ƏLAHƏZRƏT İMPERATOR BƏNDƏLƏRİNİN HÖKMÜ VƏ MÜHAFİZƏSİ ALTINA KEÇƏN GÜNDƏN BAŞ VERMİŞ HADİSƏLƏR HAQQINDA

İran[1] dövlətinə düşmənçilik edilən zaman böyük zərərlər çəkilmələrinə baxmayaraq, İran dövlətinin kargüzarları ondan sonra da daimi olan Rusiya dövləti ilə bağladıqları əhdnaməni, dostluq və ittifaq şərtlərini 1826-cı ildə pozdular. Səfir sifətilə İrana getmiş nəcabətli knyaz Menşikovu geri qaytarıb, qəflətən, Rusiya dövlətinə aid olan vilayətlərə soxuldular. Həqiqətdə isə onlar səhv edirdilər. Onlar, padşahın əsgərləri qarşısında tab gətirə bilməyəcəklərini, rus qoşunu dəryasının dalğaları təlatümə gəldiyi zaman, çör-çöp kimi məhv olacaqların düşünməmişdilər.

Birinci mərhələdə, mərhum naibüssəltənə bütün qoşunu ilə Şuşa qalasının üstünə gəlib, ay yarıma qədər oranı mühasirə etdi. General Reuttun qoşunu az olduğuna, azuqəsi, barıtı, gülləsi və toplu olmadığına baxmayaraq, o (naibüssəltənə), Şuşa qalasının divarlarına yaxınlaşa bilmədi. Sərdar Əmir xanın, Şəmkirdə (Şamxorda) general knyaz Madatovun qoşunları tərəfindən məğlub edildiyini eşitdikdə əlacsız qalıb, oradan köçdü və möhtərəm knyaz, qraf Paskeviç-Yerivanskinin hökmü altında olan qoşunla müharibə etmək əzmilə Yelizavetpolun yaxınlığına qədər gəldi. Lakin bir saatdan artıq tab gətirməyib məğlub oldu. İki günün içərisində Arazı keçib Qaradağa getdi. Böyük sərdar Çərəkən mənzilinə qədər onun ardınca getdi, lakin bir nəfər belə Qızılbaş əsgəri tapmadı.

Padşahın müzəffər qoşununun gücü, həqiqətdə bütün xalqlar arasında şöhrət tapıb dillərdə söyləndiyinə baxmayaraq, böyük və kəramətli imperatorun əsgərlərinin gücü xüsusilə haman 31-ci ildə, yüksək knyaz, möhtərəm qraf Paskeviç-Yerivanskinin bu vilayətlərdə sərdarlıq və salarlıq etdiyi zamanda İran və Rum dövlətləri əhalisinə göstərildi. O, böyük Rus dövlətinə daxil olan vilayətlərin çaşqın və pərişan qalmış əhalisini aram etdi. Böyük imperatorun mərhəmət dəryasından ümidini üzmüş, ev-eşiklərindən əl çəkərək

1 Burada "İran" səhv yazılmışdır, "Rusiya" olmalıdır.

qaçqın və pərakəndə qalmış şəxslər və bu vilayətlərdə ocaq sahibi olan adamlar, günahları bağışlandığına görə öz vətənlərinə qayıtdılar. İmperatorun dərya qədər olan mərhəməti qarşısında onların günahını zərrə qədər xırda sanıb təqsirlərindən keçdi, mərhəmət və əfv ilə ümidvar edib, öz yerlərinə qaytardı. Allaha şükür, bütün onlar və başqaları öz mülklərinə sahib olaraq, rahatlıq və asayişlə ömür sürürlər. (Bu nemətə) şükürlər edib, böyük dövlətin çağırışını gözləyirlər ki, onun əsgərləri ilə birlikdə qulluq göstərib canlarından keçsinlər. Çünki padşahın müzəffər qoşunu ilə birlikdə İran, Rum və Dağıstan müharibəsində iştirak edən Qarabağ camaatı mənsəb və məvacib sahibi olmuş, heç biri bəhrəsiz qalmamışdır.

* * *

Müsəlman tarixi ilə 1205 (1790-179l)-ci ildən 1260 (1844)-cı ilə qədər xanlar xidmətində və Qarabağ vilayətində qulluq edib, kargüzar olmuşam və bir çox hadisə və müharibələrdə iştirak etmişəm. Ümidvaram ki, bu yazdıqlarım knyaz Namestnikin işıqlı nəzərinə çatacaq və onun mənə qarşı lütfü və mərhəməti artacaqdır. Ümidvaram ki, belə böyük əmir və yüksək canişin hər vaxt məni xoşhal etdiyi kimi, indi də mənə mərhəmət göstərər və mübarək xatirindən çıxarmaz. Həqiqətdə də o cənaba xeyirxah olub, xidmət etmək hər bir kəsə vacib və lazımdır. O, bütün səmimi dostlarına və xidmətçilərinə lütf etmişdir.

Xeyirxahlardan həmişə razı olan yeganə Allah onu daima xoş hal və xoştale etsin. Amin, ey kömək edən (Allah).

Yaxşı ad qoyub getmək,
Qızıl saray qoyub getməkdən yaxşıdır.

## SON SÖZ

Qarabağ vilayətinin torpağı, əyalətləri və mərhum Pənah xanın və İbrahim xanın hökmdarlığından bəhs edən bu bir neçə vərəqi kəramət və ehsan mənbəyi olan rəhmli, böyük əmir, yüksək imperatorun canişini qraf və knyaz Mixail Semyonoviç Voronsovun mübarək adına yazdığım üçün onun nəcabəti və əzəməti haqqında Şuşa qalasında dediyim bu qitəni də xeyir-dua olsun deyə buraya yazdım və sözümü bununla qurtardım.

Qitə

Lütfdə məruz olan adamın adına yazdım
Həm qrafdır, həm knyaz Voronsov,
Böyük xaqanın xidmətində
Bütün vaxtını sərf etmişdir.
Ümidlə qapısına gələn hər kəsi
Lütflə geri qaytarmışdır.
İlahi! Onun dövləti və bəxti artıq olsun.
O, dünyada həmişə şad və sevincək olsun.

Hadisələrin yazılışı 1294 (1875)-cü ildə qurtardı.[1]

FƏSİL

## XANLARIN HAKİMİYYƏTİ HAQQINDA

Mərhum Pənah xanın Qarabağ vilayətində hökmranlıq müddəti mərhum Nadir şahın qardaşı oğlu Adil şahdan xanlıq adı, hökumət fərmanı və hakimlik ləqəbi çatdıqdan sonra, on iki il davam etmişdir. Mərhum İbrahim xanın hökmranlığı isə qırx ildən artıq olmuşdur.

Mərhum Mehdiqulu xan böyük imperatorun fərmanı ilə Qarabağda on yeddi il neçə ay hakim olmuşdur.

FƏSİL

## MƏRHUM PƏNAH XANIN QARABAĞDA TİKDİRDİYİ BİNA VƏ İMARƏTLƏR

Birinci, Bayat qalasıdır ki, orada bişmiş kərpicdən hasar, bazar, hamam və imarətlər tikdirmişdir. İndi xarabadır, yalnız xırda-para qalıqları görünür.

İkinci, Şahbulağı qalasıdır. (Burada) bulaq başından daş və əhənglə məscid, hamam (tikilmiş), şəhər və bazar (salınmışdır).

Üçüncü, Şuşa qalasının sabiq divarı və indi qoşunun taxıl anbarı olan bina.

1 Bu tarix ehtimala görə əsərin köçürülmə tarixidir.

## MƏRHUM İBRAHİM XANDAN QALMIŞ BİNA VƏ İMARƏTLƏR

Birinci, müsəlman tarixi ilə 1182 (1768-1769)-ci ildə tikilmiş böyük camaat məscididir. Bu məscid köhnəldikdən sonra onu möhtərəm qızı rəhmətlik Gövhər ağa təmir edib, əvvəlkindən daha gözəl (şəklə salmışdır).

İkinci, Şuşa qalasının hasar divarıdır ki, müsəlman tarixi ilə 1198 (1783-1784)-ci ildə binası qoyulmuş və üç il ərzində tikilib qurtarmışdır. İndi dövlət məmurları divarlan yenidən tikdirmişlər və xanın tikdirdiyindən yalnız bəzi yerdə əsər görünür.

Üçüncü, Əsgəranın hər iki qalasıdır ki, müsəlman tarixilə 1203 (1788-1789)-cü ildə Şuşa qalasının üç ağaclığında Qarqarçayın keçdiyi iki dağın arasında tikilmişdir. Müharibə zamanı bu qalalarda azacıq piyada qoşun olsa, düşmən oradan keçib Şuşa qalasına gedə bilməz.

Dördüncü, Dağdaş arasında olan Xəzinə dərəsinin imarət və otaqlarıdır ki, mağaranın içərisində daş və əhənglə tikilmişdir. Oranın yalnız bircə yolu vardır.

Beşinci, (Şuşa) qalasının bir ağaclığında olan Xan bağının tikintiləri.

Altıncı, Ağdam bağının hasarı, mərhum Pənah xanla başqa övladlarının qəbirləri üstündə tikilmiş uca günbəzlər və o (yerin) arxları.

FƏSİL

## İBRAHİM XANIN NİZAM-İNTİZAMI VƏ HAKİMİYYƏTİ ZAMANINDA OLAN QAYDALAR HAQQINDA

Qarabağın bütün elləri adları dəftər və siyahıda yazılmış atlı qoşundan ibarət idi. Zərurət zamanında mahalların və kəndlərin piyada tüfəngliləri mahal məlikləri ilə birlikdə qoşun sıralarına hazır olurdular. Hərdənbir Dağıstandan ləzgi qoşunu gətirildikdə ləzgi qoşununun məvacibini ödəmək və ləzginin itmiş və ya ölmüş atının əvəzini vermək üçün ellərdən də tövcü pulu, sursat, taxıl, qoyun və mal alınardı. Adları nökər və qoşun dəftərində qeyd olunmayan ailələrin nökər və qoşun əhlindən, habelə adları dəftərdə qeyd olunmuş nökər və qoşun əhlindən heç bir şey alınmazdı. Onlar

məaf[1] idilər. Onların taxılı, atı və başqa ehtiyacı xanın öhdəsində idi. Qoşunun hər bir nökəri (nəfəri) bir evə təhkim olunmuşdu. O ev həmin nökər və atlının ehtiyacını təmin etməli idi.

FƏSİL

Hər il Novruz bayramı günündə mərhum xan, qoşunun bütün adlı-sanlı sərkərdələrinə və minbaşılarına xələt, ənam, at və qılınc bağışlayardı. Azərbaycan vilayətləri, mahallar, habelə məliklər hər kəs öz rütbəsinə görə peşkəş gətirərdi.

FƏSİL

Mərhum İbrahim xan, səfərdə olduğu və ya bir yerdə ordu qurduğu zaman, xidmətində olan minbaşıların, yüzbaşıların, Azərbaycan bəyləri, ağaları və xanlarının səhər, günorta, axşam xörəyi və atlarının arpası, habelə qoşun əhlinin bir parasının, əmələnin, mirzələrin, eşikağalarının, keşikçilərin və yasavulların bütün məxarici mərhum xanın xəzinəsindən verilərdi. Bir çox gecələr, minbaşılara və başqalarına buraxılan diri qoyunlardan başqa, qırx puda yaxın düyü və otuz qoyun sərf olunardı. Bu hesabla sərf olunan çörəyin, arpanın, yağın və şirniyyatın miqdarını təsəvvür etmək olar.

FƏSİL

## MƏRHUM İBRAHİM XANIN GƏLİRİ

(İbrahim xanın) gəliri mahalların və kəndlərin taxıl və ipəyindən alınan malcahatdan və əkin yerlərində xana məxsus olan kotanlardan (istifadə olunması üçün alınan vergidən) ibarət idi. Hətta yadımdadır, bir dəfə mərhum İbrahim xanın özünəməxsus olan cütləri və kotanları hesab edirdilər. Məlum oldu ki, xanın cüt və kotanı bütün Qarabağ əhlinin cüt və kotanı qədərdir; hətta onlardan iki cüt də artıqdır. Bütün bu qədər taxıl və mal-qara qoşuna, saraya, hərəmxanaya, nökərlərə, əmələlərə və qonaqlara sərf olunardı. Bunlar-

---

1 "Vergidən azad" deməkdir.

dan əlavə, (xanın) icarə, peşkəş, Qarabağ ixracatı və sikkəxanadan gəliri olurdu və (ona) Azərbaycan vilayətlərindən cinslə, pulla çoxlu peşkəş göndərirdilər.

FƏSİL

## MƏRHUM XANIN ƏXLAQI VƏ RƏFTARI

Mərhum İbrahim xan qərib sevən, qonaqpərəst, yetimlərə baxan, rəiyyətpərvər, qeyrətli, ürəkli, çörəkli, ehsan sahibi və ənam paylayan bir adam idi. Böyük seyidlərə və fağırlara çoxlu sədəqə və nəzir verərdi. Alimlərə, seyidlərə hörmət edərdi. Ətraf (mahalların) Azərbaycan, Şirvan və başqa vilayətlərin xanları, bəyzadələri ona pənah gətirib, kömək istədikləri zaman onlara hörmət edər və arzularına çatdırmaq uğrunda olduqca səy göstərər və onları arzularına çatdırardı. Gözəl qadınların məclis və söhbətinə çox meyli vardı.

F Ə S İ L

## XANIN İLXISI

Xanın yaxşı atları, heyvanı və çoxlu ilxısı var idi. Xanın ilxısı İran və Rum vilayətlərində belə böyük şöhrət tapmışdı. Mərhum xanın atlarının çoxu mərhum Nadir şahın atları və ilxısının cinsindən idi. Xan onları Azərbaycan vilayətlərindən, Şahsevən, Şəqaqi və Xorasan xanlarından alıb gətirmişdi. Təqribən üç-dörd min və bəlkə daha çox balalayan, madyanı, xüsusi cins ayğırları var idi. Xüsusi qoyun sürüləri, malı, camışı o qədər çox idi ki, saymaqla qurtarmazdı.

FƏSİL

## MƏRHUM İBRAHİM XANIN KARGÜZARLARI, QARDAŞLARI VƏ QARDAŞOĞLANLARI HAQQINDA

Xanın qardaşları, qardaş uşaqları, öz övladı və əmisi uşaqları məruf bəylər olub, mal-dövlət, nökər və calal sahibi idilər. Onların hər biri başqa vilayətlərin xanlarına bərabər idi. Əmisi oğlu Mirzə Əli bəy, bibisi oğlu Lütfəli bəy, qardaşı uşaqları - Fəzi bəy, Əbdüssə-

məd bəy, Kəlbəli bəy, Hümmətəli bəy və öz oğlanları o bəylərin sırasında idilər.

Mehrəli bəy və İbrahim xan, Pənah xanın uşaqlarıdırlar.

Cavanşir, Otuziki, Kəbirli, Dəmirçi Həsənli, Bərgüşad, Qaraçorlu, Hacı Samlı, Kolam və Qapan ellərinin bəyləri ilə Dizaq, Vərəndə, Çiləbörd, Talış və Xaçın mahallarının məlikləri də bir para vilayət xanları kimi dövlət, əzəmət, calal və bünövrə sahibi idilər. Özü tərbiyə edib, rəşadət, çalışqanlıq və səmimiyyətlərinə görə dövlət və rəiyyət sahibi etdiyi başqa bəylər də məşhurdurlar.

FƏSİL

## EVİNİN ƏMƏLƏ VƏ KARGÜZARLARI VƏ DÖVLƏT İŞİLƏ MƏŞĞUL OLAN ŞƏXSLƏRİ

Birincisi, Vaqif təxəllüslü mərhum Axund Molla Pənahdır ki, tədbirli və kamallı məşhur vəzir idi və İranda, Rumda olduqca şöhrət tapmışdır. Onun türkcə yazdığı aşiqanə şeirləri indi də dillərdə əzbərdir. Hörmət sahibi olan başqa kargüzarları, eşik ağaları, nazirləri və əmələləri də bacarıqlı, ağıllı və şirindilli adamlar idi. Ağa Məhəmməd şahın əhvalatından sonra, Qarabağda üz vermiş pərişanlıq və qarışıqlıq nəticəsində mərhum xanın bunlar kimi bir çox adamları, əmələ və kargüzarları tamamilə vəfat etdilər.

FƏSİL

## XANIN ADLI-SANLI ÖVLADI

Hələ mərhum İbrahim xan sağ ikən, bir anadan doğulmuş böyük oğlanları Cavad ağa və Məhəmmədhəsən ağa vəfat etdilər. Bunların anası cəbrayıllı bəylərindən birinin qızı idi. Mərhum xandan sonra, polkovnik Xanlar ağa və İranda olan Əbülfət xan vəfat etdilər. Sonra, polkovnik Məhəmmədqasım ağa, Fətəli ağa, Süleyman ağa, Hüseynqulu ağa və Səfiqulu ağa öldülər.

İndi Qarabağda sağ qalanlar: həmail və cavahir cıqqa sahibi general-mayor Mehdiqulu xan və Əhməd xandır ki, xan qızlarından doğulmuşlar. Şeyx Əli ağa isə kənizdən doğulmuşdur.

Mərhum İbrahim xanın sağ qalan qızlarından biri nəcib Gürcüstan tavatının qızından doğulmuş Gövhər ağadır, biri isə İzzət bəyimdir ki, Gürcüstan valisinin vəziri Mirzə Rəbinin qızından olmuşdur. Gürcüstan valisi İrakli mərhum İbrahim xanla daima dost və müttəfiq olmaq istəyirdi. Lakin din ixtilafı imkan vermədiyindən öz vəzirinin üç qızını mərhum xana və iki oğlu - Əbülfət xana və Məhəmmədqasım ağaya vermişdi ki, bu nikah vasitəsilə aralarında məhəbbət əlaqələri yaradılmış olsun.

FƏSİL

## MEHDİQULU XANIN VARİS VƏ VƏLİƏHD OLMASININ SƏBƏBİ

Mərhum İbrahim xan birinci dəfə Kürəkçay qırağında sərdar Sisianovla görüşdüyü zaman varislik və vəliəhdlik adı onun böyük oğlu mərhum Məhəmmədhəsən ağaya verilmişdi. O zaman Məhəmmədhəsən ağanın ikinci oğlu girov adı ilə Sisianovun yanına göndərildi. General-mayor Məhəmmədhəsən ağa mərhum İbrahim xanın sağlığında öldüyündən xanın yerdə qalan oğlanları içərisində ən böyüyü general-mayor Mehdiqulu ağa idi. Buna görə mərhum İbrahim xanın öz sağlığında varislik və vəliəhdlik kağızı, xanın və Qarabağın başqa əyanının möhürü ilə Mehdiqulu ağaya verildi, xan və varis adlandırıldı.

Bu səbəbə görə mayor Lisaneviç, mərhum İbrahim xan öldükdən sonra, general Nesvetayevin hüzuruna raport yazmış və ona əsasən 1807-ci ildə böyük imperator mərhum Aleksandr Pavloviçin fərmanı üzrə Mehdiqulu xana Qarabağın xanı adı, hakimiyyət bayrağı və cavahirə tutulmuş qılınc verildi.

Mərhum Mehdiqulu xanın hakimiyyəti dövründə baş vermiş hadisələr, böyük dövlətin kargüzarları tərəfindən dəftərlərdə yazıldığından sizə məlumdur. Odur ki, mənim burada yazmağıma ehtiyac qalmır.

SON

## ƏHMƏD BƏY CAVANŞİRİN TƏRCÜMEYİ-HALI

Əhməd bəy Cavanşir ölümündən bir az əvvəl öz tərcümeyi-halını yazmış və qızı Həmidə xanıma vermişdi. Lakin, təəssüf ki, bu əlyazmasını nə Mirzə Cəlil Məmmədquluzadənin (Molla Nəsrəddin)[1] şəxsi arxivindən, nə də Əhməd bəyin kağızları arasından tapmaq bizə müyəssər olmadı. Ehtimal ki, bu sənəd Həmidə xanım Tbilisiyə köçüb gedəndən sonra və ya 1905-1906-cı illərdə Qarabağda baş verən hadisələr zamanı məhv olmuşdur.

"Riyazül-aşiqeyn" kitabının müəllifi Məhəmmədağa Müctəhidzadə Qarabağ şairlərinin şeirlərini və qısa tərcümeyi-hallarını yazarkan Əhməd bəy haqqında çox az danışır və onun şeirlər məcmuəsindən ancaq bir beyt misal gətirir[2]. Halbuki Müctəhidzadə Əhməd bəy haqqında müfəssəl məlumat verə bilərdi, çünki o, həm müəlliflə, həm də onun savadlı qızı ilə şəxsən tanış idi.

Azərbaycan ədəbiyyatı nümunələrini toplayanlardan biri olan Firudin bəy Köçərli "Asari-Əhməd bəy Cavanşir" əsərinin müqəddiməsində[3] çapa hazırlamaqda olduğu "Azərbaycan türklərinin ədəbiyyatı" kitabında Əhməd bəyin həyatı və fəaliyyəti haqqında müfəssəl məlumat verəcəyini vəd etmiş, lakin bu dörd cildlik[4] tədqiqatında onun haqqında bir kəlmə də olsun danışmamışdı. Buna baxmayaraq, başqa müəlliflərə nisbətən Firudin bəy Köçərli Əhməd bəy haqqında az-çox dəyərli məlumat verə bilmişdir.

Əhməd bəy Cavanşir 1828-ci il martın 2-də keçmiş Şuşa qəzasının Kəbirli nahiyəsindəki Kəhrizli kəndində anadan olmuşdur. Qarabağ mahalının kameral siyahısından məlum olur ki, Əhməd bəyin atası Cəfərqulu bəyin xüsusi malikanəsi olan Kəhrizli[5] kəndi dövlətə məxsus bütün vergi və mükəlləfiyyətlərdən azad edilmişdi.

---

1 Əhməd bəy Cavanşirin qızı Həmidə xanım Tbilisidə Mirzə Cəlil Məmmədquluzadə ilə tanış olmuş və bir azdan sonra da ona ərə getmişdi. Həmidə xanım 1955-ci il fevralın 8-də Bakı şəhərində vəfat etmişdir.

2 O bağda ki bitirdi həmişə lalə və gül,
Səbəb nə oldu belə xar-zar oldu könül.

B a x: Məhəmmədağa Müctəhidzadə. "Riyazül-aşiqeyn", İstanbul, hicri 1328, səh. 248.

3 "Asari-Əhməd bəy Cavanşir". Tiflis, 1906, səh. 8.

4 F.Köçərli tərəfindən toplanmış Azərbaycan şairlərinin şeir məcmuələri və tərcümeyi-halları "Azərbaycan ədəbiyyatı tarixi materialları" başlığı altında dörd clddə, müəllifin ölümündən beş il sonra, 1925-ci ildə Azərb. SSR Xalq Maarif Komissarlığı tərəfindən nəşr edilmişdir.

5 "K ə h r i z l i - Məhəmməd bəyin oğlu Cəfərqulu bəyin xüsusi malikanəsidir. 9 tüstüdən ibarətdir. Vergi və mükəlləfiyyət vermir". B a x: Камеральное описание Карабахской провинции, составленное в 1823 г. Могилевским и полковником Ермоловым. Tiflis, 1866, səh. 40.

Mehrəli bəyin nəvəsi və Məhəmməd bəyin oğlu olan Cəfərqulu bəy Qarabağ xanədanına mənsub bütün imtiyaz və güzəştlərdən istifadə etmək hüququna malik idi. Əhməd bəyin ikinci babası Mehrəli bəy qarabağlı İbrahim xanın doğma qardaşı və həm də xanlığa sahib olmaqda onun qorxulu rəqibi idi.

Qarabağ xanlığı uğrunda feodal müharibələrinin təfsilatına keçməzdən əvvəl İbrahim xanın hansı şəraitdə hakimiyyət başına gəlməsi və onun qardaşı Mehrəli bəyin vətəndən dərbədər düşməsi haqqında qısa məlumat verək.

Pənah xan Qarabağdan İran hakimi Kərim xan Zəndin (1750-1779) yanına getməzdən əvvəl Qarabağın idarə olunmasını kiçik oğlu İbrahimxəlil ağaya tapşırır. Onunla birlikdə şahın tələbi üzrə Şirazda şahın iqamətgahında olarkən Mehrəli bəyin Qarabağda hakimiyyəti ələ keçirmək istəməsi haqqında bəzi xəbərlər alır. Mərkəzləşmiş dövlət yaratmağa çalışan Pənah xan ölümündən sonra xanlığın parçalanmasından ehtiyat edirdi. Buna görə də o, Qarabağ xanlığını idarə etmək üçün Kərim xan Zənddən, formal da olsa, bir fərman alır. İbrahimxəlil ağa Kərim xandan aldığı fərmanla[1] Şuşaya gəlmiş, lakin Mehrəli bəy tərəfindən yaxşı qarşılanmadığı üçün atasını gözləməyi qərara alır.

Pənah xan heç bir vəsiyyət etmədən 1759-cu ilin yayında Şiraz şəhərində qəflətən vəfat edir. Pənah xanın ölüm xəbərini eşidən hər iki qardaş Qarabağda hakimiyyət uğrunda qanlı müharibəyə hazırlaşır.

İbrahimxəlil ağa şahın fərmanına əsaslanaraq özünü Qarabağ xanlığının qanuni varisi hesab edirdi. Mehrəli bəy isə öz yaxın adamlarına arxalanaraq hakimiyyət başında qalmağı qət etmiş və qonşu xanlıqlarda özünə müttəfiq axtarmağa başlamışdı. Hər iki qardaş öz başına silahlı dəstələr toplayaraq bir-birinin tərəfdarlarını qırır, qonşu xanlıqlarla hərbi ittifaqlar bağlayır, öz məqsədlərinə çatmaq üçün daha güclü feodallarla qohumluq münasibəti yaradırdılar. Uzun və qanlı çarpışmalardan sonra İbrahimxəlil ağa Dağıstan hakimi Ümmə xandan güclü kömək alaraq qardaşını sıxışdırır və özünü Qarabağın xanı elan edir (İbrahimxəlil ağa sonralar Ümmə xanın qızı ilə evlənmişdir). Bu hadisə 1760-cı ildə olmuşdu. Bu vaxtdan etibarən İbrahimxəlil ağanın adı rəsmi sənədlərdə "xan" (İbrahim xan) və "Qarabağın hakimi"[2] kimi çəkilir. Mehrəli bəy isə Qarabağı tərk etməyə və İbrahim xana düşmən müttəfiqlər axtarmağa məcbur olur. Ölkənin hakimiyyət uğrunda bir-biri ilə uzun-uzadı qanlı müharibələr aparan müstəqil və yarımmüstəqil xırda feodal xanlıqlara parçalandığı bir dövrdə belə bir müttəfiqi tapmaq çətin deyildi.

Azərbaycan torpaqlarını birləşdirməyə çalışan qubalı Fətəli xan (1736-1786) Qarabağlı İbrahim xanı özünün ən qorxulu düşməni hesab edirdi. Öz məqsədinə çalışan Mehrəli bəy üç dəfə Qarabağ xanlığının mərkəzi olan Şuşaya

---

1 А.Бакиханов. Гюлистан-Ирам, Baki, 1926, səh. 130.

2 П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г., II hissə, SPb, 1869, səh. 430.

hücum edib Ağdama qədər gələn, lakin heç bir nəticə əldə edə bilməyərək geri qayıdan Fətəli xanla yaxınlaşmışdı. Mehrəli bəy qubalı Fətəli xanın bütün hərbi səfərlərində fəal iştirak etmişdi. Buna görə də Fətəli xanın düşmənləri, eyni zamanda Mehrəli bəyin də düşmənləri hesab olunurdu.

Hələ 1767-ci ildə Şamaxı xanlığının hakimləri Məhəmməd Səid xan və Ağası xan qardaşları qubah Fətəli xan tərəfindən Şamaxıdan qovulmuşdular. Bundan bir qədər sonra onlar Şamaxını geri qaytarmaq məqsədi ilə keçmiş düşmənləri olan şəkili Məhəmmədhəsən xanla ittifaq bağlayırlar. Lakin Fətəli xan onları ikinci dəfə məğlub edir. Məhəmmədhüseyn xan Nuxada qalır, Ağası xan isə Kür sahilində Katavən kəndində gizlənir.

Bu hadisədən sonra Məhəmməd Səid xanın oğlanları qarabağlı İbrahim xana pənah gətirdilər. Lakin feodal ara müharibələri bununla qurtarmadı.

1779-cu ildə Çələbi xanın oğlu Əbdülqədir xan qəflətən Nuxanı işğal edərək Məhəmmədhüseyn xanı öldürdü. Onun oğlu Məhəmmədhəsən xan isə İbrahim xanın yanında gizlənməyə məcbur oldu.

1784-cü ildə Fətəli xanla Əbdülqədir xanın Qarabağ xanlığı üzərinə hərbi səfəri ilə müharibə yenidən qızışdı. Bu zaman İbrahim xanın azad etdiyi Məhəmmədbəsən Nuxanı işğal edərək, Əbdülqədir xanı və onun yeddi oğlunu öldürdü. Məhəmmədhəsən xan, Ağası xan və Məhəmməd Səid xan öz aralarında ittifaq bağlayaraq Fətəli xana qarşı çıxdılar. 1785-ci ildə Fətəli xanın onlarla apardığı müharibənin qızğın vaxtında Mehrəli bəy Fətəli xanın xüsusi tapşırığını yerinə yetirmək üçün Bakıdan qayıdarkən yolda şamaxılı Ağası xanın oğlu Əhməd bəy tərəfindən öldürüldü.

Mehrəli bəyin ölümündən sonra müharibəni onun oğlu Məhəmməd bəy davam etdirdi. Bu vaxtlar, yəni 1785-ci ildə, təqribən 23 yaşında olan Məhəmməd bəy haqqında narrativ mənbələr demək olar ki, heç bir məlumat vermir. O öz uşaqlığını İbrahim xana düşmən münasibət bəsləyən yaxın qohumlarının yanında keçirmişdir. İbrahim xanın düşmənləri Məhəmməd bəyin şəxsində öz mənafelərini əks etdirən bir hakimi görürdülər. Buna görə də onlar Məhəmməd bəydən bərk yapışmışdılar. Lakin o vaxtlar İbrahim xanı hakimiyyətdən salmaq və onu Məhəmməd bəylə əvəz etmək çox da asan deyildi; buna görə də müxalifət əlverişli şərait gözləyirdi.

Dəhşətli 1797-ci il yaxınlaşırdı. Ağa Məhəmməd şahın dəstələri Qarabağa soxulmuşdu. Aclıq və qıtlıq bütün ölkəni bürümüşdü. Talan olunmuş kəndlilər kütləvi surətdə öz yurdlarını tərk edirdilər. İbrahim xan öz yaxın adamları ilə Car-Balakənə qaçmışdı. Heç bir müqavimətə rast gəlməyən Ağa Məhəmməd şah Şuşaya daxil oldu. Lakin o, 8 gün sonra öldürüldü.

Bəzi müəlliflər göstərirlər ki, Ağa Məhəmməd şah Şuşanı alandan sonra Məhəmməd bəyi, İbrahim xanın qəddar düşməni olduğu üçün, Qarabağa hakim təyin etmişdi. Mötəbər mənbələr bu ehtimalı təsdiq etmir. P.Q.Butkov göstərir ki, şah Qacar "Azərbaycan xanlarının gizli məsləhəti ilə öldürül-

müşdür"[1]. Ola bilsin ki, bu sui-qəsdin iştirakçılarından biri də, Əhməd bəy Cavanşirin dediyi kimi, Məhəmməd bəy olmuşdur. Bu ehtimal həqiqətə daha çox yaxındır. Belə ki, Məhəmməd bəy xarici işğalçılara qarşı mübarizəyə qalxmış və hətta şahın kəsilmiş başını əmisi İbrahim xana göndərmişdi. İşğalçılar qovulduqdan sonra isə o, İbrahim xanın Şuşada olmamasından istifadə edib, hakimiyyəti ələ keçirmiş və özünü Qarabağın hakimi elan etmişdi. Məhəmməd bəy hakimiyyəti öz əlində saxlamaq üçün əmisinin tərəfdarlarını məhv etməyə başladı. Azərbaycanın görkəmli şairi və dövlət xadimi Molla Pənah Vaqif və onun oğlu da bu niyyətin qurbanı oldu.

Məhəmməd bəy hakimiyyət başında çox qala bilmədi. İbrahim xan Şuşaya qayıtdıqdan sonra o, Məhəmmədhəsən xana pənah apararaq Şəki xanlığına getdi. Şəki xanı Məhəmməd bəyi aldadaraq həbs etdi və Şirvan xanı Mustafa xan Məhəmməd bəydən atasının və qardaşının intiqamını almaq arzusunda idi. 1797-ci ilin sonunda Məhəmməd bəy Şamaxı yaxınlığında Mustafa xan tərəfindən öldürüldü.

Məhəmməd bəyin oğlu Cəfərqulu bəy Qarabağ xanlığı tarixində heç bir rol oynamamışdır. O, özünün xüsusi kəndi olan Kəhrizlidə oturaraq, başqa bəylər kimi, öz malikanəsini idarə edirdi. Cəfərqulu bəy öz əmisi Əsəd bəyin Zəhra xanım adlı qızı ilə evlənmiş və bu izdivacdan 1828-ci il martın 2-də Əhməd bəy anadan olmuşdur.

Əhməd bəy ilk təhsilini Kəhrizli kəndində almış və burada ancaq ana dilini öyrənmişdi. Məlum olduğu üzrə, Azərbaycanın Rusiya ilə birləşdirilməsindən sonrakı ilk dövrlərdə maarif sistemində heç bir dəyişiklik olmamışdı. Şəhərlərdə mədrəsə, kəndlərdə isə mollaxanalar qalmaqda davam edirdi. Əhməd bəy 15 yaşına qədər mollaxanada oxumuşdur.

Bu dövrdə çar hökuməti Azərbaycanda və bütün Zaqafqaziyada bir sıra islahatlar keçirməyə məcbur oldu. Ölkədə siyasi pərakəndəliyə son qoymaqda müəyyən rol oynamış olan komendant üsul-idarəsi artıq öz dövrünü keçirmişdi.

XIX əsrin 40-cı illərində verilən inzibati və məhkəmə islahatları, komendantlıq sisteminin ləğv olunması və nəhayət, Rusiyada hökm sürən qanun-qaydaların Azərbaycanda tətbiqi yerli feodalların əksəriyyəti arasında narazılığa səbəb oldu. Bu narazı bəylər və ağalar öz şexsi mənafeləri üçün hətta ölkədə genişlənməkdə olan kəndli hərəkatından da istifadə etməyə cəhd edirdilər. Çarizmin yerlərdə ictimai dayağı sarsılmağa başlamışdı. Halbuki bu dövrdə ayrı-ayrı xalq çıxışlarını boğmaq üçün çar hökumətinə etibarlı ictimai istinad lazım idi. Ona görə də hökumət yerli feodallara qarşı öz münasibətini dəyişdirməli oldu. Yerlərdə ictimai istinad yaratmaq üçün yerli bəylərdən və

---

1 П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г., II hissə. SPb, 1869, Il hisss, səh. 430.

ağalardan etibarlı adamların seçilməsi və istənilən tədbirlərin onların köməyi ilə həyata keçirilməsi qərara alındı. Bütün bu tədbirlər hakim siniflər üçün qabaqcıl rus mədəniyyəti ilə tanış olmağa əlverişli şərait yaratdı. Ehtimal ki, Əhməd bəyin ailəsi də vəziyyəti nəzərə almış və onu rus dilini öyrənmək üçün rus məktəbinə düzəltməyə məsləhət görmüşdü.

1843-cü ildə qarabağlı Mehdiqulu xanın xahişinə görə, çar I Nikolay Əhməd bəyi Peterburqa tələb edir və onu dövlət hesabma Pavlov kadet korpusuna qəbul edir. O vaxtlar Pavlov məktəbinə yalnız dvoryan uşaqlarını qəbul edirdilər. İzdihamlı Peterburq mühitinə düşən Əhməd bəy Cavanşir rus dilini öyrənməyə ciddi səy göstərir və məktublarından göründüyü kimi, bu dili mükəmməl surətdə öyrənə bilir.

1848-ci ildə Əhməd bəy Pavlov korpusunu bitirib Konstantin Nikolayeviç adına Qusar alayına təyin olunur və 1854-cü ilə qədər hərbi xidmətdə qalır.

1853-cü ildə Krım müharibəsi başlandı. Məlum olduğu kimi, Azərbaycanın geniş xalq kütlələrinin hüsn-rəğbəti Rusiyanın tərəfində idi. Qasım bəy Zakirin oğlu Nəcəfqulu bəy və qardaşı oğlu İskəndər bəy könüllü olaraq cəbhəyə getmişdilər. Qafqaz cəbhəsində rus soldatları ilə çiyin-çiyinə 2000 nəfərə qədər azərbaycanlı döyüşürdü. Əhməd bəyin olduğu Qusar alayı Sevastopol altında vuruşurdu. Döyüş meydanında göstərdiyi igidliyə və qoçaqlığa görə Əhməd bəy ordenlə təltif edilmiş və ona ştabrotmistr rütbəsi verilmişdi. Lakin, Əhməd bəyə orduda uzun müddət xidmət etmək nəsib olmadı, çünki o, hələ 1850-ci ildə Əli bəy Sultanovla[1] iştirak etdiyi dueldə qolundan yaralanmış olduğu üçün 1854-cü ildə tamamilə hərbi qulluqdan getməyə məcbur oldu.

1854-cü ildə Əhməd bəy öz doğma kəndi olan Kəhrizliyə gələrək burada təsərrüfat işləri ilə məşğul olmağa başlayır. Rus ordusundan istefaya çıxmış və Peterburq təhsili almış zabit köhnə kənddə yeni qaydalar yaratmaq istəyirdi. Buna görə də o, xalq arasında "urus Əhməd bəy" ləqəbini almışdı.

XIX əsrin 60-cı illərinin sonunda Əhməd bəy Vərəndə mahalının murovu vəzifəsinə təyin edilir; bu zaman o, həm də taxıl yerlərini sulamaq üçün Arazdan su çıxartmaq işi ilə məşğul olurdu. Uzun əziyyətdən sonra Əhməd bəy 8 verst uzunluğunda bir arx qazdırır və onu Mil düzündəki qədim Gavur arxı ilə birləşdirir. Azərbaycanı Rusiya sənayesinin xammal mənbəyinə çevirməyə çalışan çar hökuməti heç bir vəsait sərf etmədən yerlərdə suvarma işlərini

---

1 Əli bəy İbrahim Sultan oğlu Qarabağın köhnə bəy nəslindəndir. Rus ordusu zabiti olaraq bir çox döyüşlərdə iştirak etmiş və kornet rütbəsində hərbi xidməti bitirib öz ata mülkü olan Zəngəzur qəzasındakı Bextiyarlı kəndinə qayıtmışdır. Onun haqqında b a x: 1870-ci il aprelin 23-də Şuşa bəylik komissiyasına verilən ərizə " "О признании рода их в бекском достоинстве, под фамилией Султанов" Azərbaycan SSR Mərkəzi Dövlət Tarix Arxivi, fond 69, iş 59.

yaxşılaşdırmağa və beləliklə də, çoxlu xammal əldə etməyə çalışırdı. Ona görə də Qafqaz canişinliyi idarəsi hələ XIX əsrin 60-cı illərinin axırlarında Mil düzündəki suvarma işlərini qaydaya salmaq üçün bir neçə dəfə xüsusi komissiyalar göndərmişdi. Lakin tərkibində hətta hollandiyalı suvarma mütəxəssisləri də olan bu komissiyalar heç bir qəti tədbir görə bilmədilər. Çünki bu layihələrin həyata keçirilməsi "küllü miqdarda xərc tələb edirdi"[1]. Qarabağın yerli bəyləri də Gavur arxını "...arx və arxın suvardığı bütün torpaqların 99 il ancaq onların istifadəsində"[2] qalması şərti ilə bərpa etmək istəyirdilər. Lakin onların da cəhdi heç bir nəticə vermədi. Nəhayət, 1866-cı ildə Əhməd bəy, Zərgar, Dilağarda, Yağhvənd və Şahsevən camaatının köməyi ilə, cüzi bir məbləğdə və hökumətlə heç bir formal əlaqə yaratmadan həmin arxı qazdırmağa başladı və Arazdan çıxarılan suyu məşhur Gavur arxı ilə birləşdirmək kimi çətin bir məsələni həll etdi[3].

Sonrakı məktublaşmadan aydın olur ki, hökumət Əhməd bəyin təcrübə və təşəbbüsünü nəzərə alaraq, göstərilən kanalı yenidən bərpa etmək üçün daha bir təşəbbüs göstərdi və bu məqsədlə 1879-cu ildə xüsusi bir komissiya Əhməd bəyin iştirakı ilə Mil düzünü yoxladı. Komissiya Əhməd bəyin və mühəndis Bexmanın fikri ilə razılaşaraq Gavur arxını bərpa etməyi qərara aldı. Bu məqsədlə 1881-ci ildə plan layihəsi hazırlandı. Lakin bu layihə kağız üzərində qaldı.

Suvarma məsələsi ətrafında gedən məktublaşmalar göstərir ki, Əhməd bəy su təsərrüfatı sahəsində böyük təcrübəyə malik idi. Əhməd bəyin öz mülkündə qazdırdığı kəhrizlər də suvarma sahəsində çalışan bir çox tədqiqatçıların nəzər-diqqətini cəlb etmişdi.

1883-cü ildə Əhməd bəyin qonağı olmuş mühəndis Veys fon-Veyssenqof yazır ki, "Qarabağ mülkədan Əhməd bəy Cavanşir uzun illər boyu apardığı müşahidələrin nəticələri və qazandığı təcrübə ilə məni tanış edərək, qazdırdığı kəhrizlərlə ətraflı surətdə tanış olmağa mənə imkan yaratdı"[4].

XIX əsrin 70-ci illərində Əhməd bəy hakim sinif nümayəndələrindən kimin həqiqətən bəy silkinə mənsub olduğunu müəyyən etmək məqsədilə yaradılmış Şuşa bəy komissiyasının tərkibinə daxil olur. Bu komissiyanın fəaliyyəti haqqında ətraflı surətdə danışmadan, qeyd etmək lazımdır ki, bəy və ağaların əksəriyyəti vergi və mükəlləfiyyətlərdən azad olmaq üçün saxta sənəd-

---

1 В.Безменов. О канаве "Гоур-архе" и результатах попытки возобновления ее местными средствами. "Kavkaz" qəzeti, 1871-ci il, № 21.

2 Yenə oarada.

3 Yenə orada.

4 Вейс фон-Вейссенгоф. Сведения о состоянии орошения на Кавказе по 1883 г., Tiffis, 1883, seh. 63.

lər (xan fərmanları, təliqələr və s.) düzəldərək özlərinin bəy silkinə mənsub olduqlarını sübut etməyə çalışırdılar. Lakin Əhməd bəy bu saxtakarlığa qarşı müqavimət göstərirdi ki, bu da komissiya üzvlərinin narazılığına səbəb olurdu. Ona görə də F.Köçərlinin göstərdiyi kimi, Əhməd bəyin düşmənləri onu həbs etdirib, bir neçə vaxt həbsxanada saxlatdırdılar[1].

Əhməd bəy ömrünün son günlərini Kəhrizli kəndində keçirərək tarix və ədəbiyyata aid kitabları mütaliə edir, müxtəlif əsərlər yazır və tərcümə ilə məşğul olurdu.

Əhməd bəy 1903-cü il yanvarın 9-da, 75 yaşında ikən vəfat etmiş və öz vəsiyyətinə görə Kəhrizli kəndində dəfn edilmişdir.

* * *

Öz peşəsi ilə Əhməd bəy nə tarixçi, nə də ədəbiyyatçı idi. O, Peterburqdakı Pavlov korpusunda təhsil alaraq rus ordusu zabiti kimi imperiyanın müxtəlif şəhərlərini gəzərək qabaqcıl rus mədəniyyəti ilə yaxınlaşmışdı. Şübhə yoxdur ki, o, Peterburqda olarkən orada yaşayan məşhur şair və yazıçılarla da tanış olmuşdu.

Əhməd bəy Puşkini, Lermontovu, Jukovskini sevir, rus şairlərinin əsərlərini tərcümə edir, tarixi əsərlər və hətta şeirlər yazırdı. Kəhrizli kəndində onun zəngin bir kitabxanası da var idi[2]. Əhməd bəy Puşkinin "Balıqçı və balıq nağılı"nı, Lermontovun "Mtsıri", "Bəhs", "Üç xurma ağacı", "Terekin sovqatı", "Hacı Abrek", Jukovskinin "Yay axşamı", "Yatmış şahzadə qız" və s. əsərlərini Azərbaycan dilinə tərcümə etmişdir[3]. Bunlardan başqa, Əhməd bəy "Kavkaz" və "Новое обозрения" qəzetlərinə müxtəlif mövzularda məqalələr də yazırdı. Əhməd bəy həmçinin uşaqlar üçün nəşr olunmuş mənzum bir əsərin də müəllifidir. O öləndən sonra həmin əsər "Asari-Əhməd bəy Cavanşir" adlandırılmışdır. Həmidə xanım yazır ki, o, (Əhməd bəy - Ş.Ə.) ölümqabağı həmin əsərin uşaqlar üçün nəşr edilməsini məndən xahiş etmişdi. Senzura həmin kitabın nəşrinə icazə vermişdi. Lakin atamın pulu olmadığından əsəri çap edə bilməmişdi. Mənə "Qeyrət" mətbəəsi sahibi Mirzə Cəlil Məmmədquluzadəyə müraciət etməyi məsləhət gördülər. Mən əlyazmasını Mirzə Cəlilə verərək çap etməsini təklif etdim. O, əsəri oxuyub bəyəndikdən sonra nəşrinə başladı[4]. Tbilisidə "Qeyrət" mətbəəsində çap olunan bu əsərin cildində Həmidə

1 Ф.Кочарли. Литература азербайджанских татар. Tiflis, 1903, səh. 7.

2 Həmidə xanımın xatirələri. Azərb. SSR EA Respublika Əlyazmalar Fondu, inv. 174, dəftər 5, vərəq 41.

3 Ф.Кочарли. Литература азербайджанских татар. Tiflis, 1903, səh. 30, 53.

4 Həmidə xanımın xatirələri. Dəftər 1, vərəq 2, 4; dəftər 2, vərəq 16.

xanımın xahişi ilə "Bu kitabın satılmasından əldə edilən gəlir mərhum Əhməd bəyin adına olan müsəlman qız məktəblərinə məxsusdur" sözləri yazılmışdı.

"Asari-Əhməd bəy Cavanşir" şeriyyəti etibarı ilə müəllifi bir şair kimi xarakterizə etmir. Şeir qaydalarına riayət edilməyərək yazılmış bu əsərdə toplanan "Sevdiməli", "Ay və gün", "Güc məndədir, güc məndə", "Qazı namaz üstədir" və başqa bu kimi doqquz mənzum hekayədə nəsihətamiz sözlərlə elatın həyat və məişəti təsvir edilir.

Əhməd bəyin başqa bir görkəmli əsəri - 4 cilddən ibarət olan və bizə gəlib çatmayan "Türk zərb-misallar məcmuəsi"dir. Bu məcmuənin məzmunu haqqında Həmidə xanım yazır: "...əvvəlcə Azərbaycan zərb-misala oxşar olan rus misalı (Dalın əsərindən) yazılmışdı. Əsər çapa hazır idi"[1].

Əhməd bəyin bütün əsərlərindən bizim üçün ən mühüm olanı 1883-cü ildə Şuşada yazılmış "Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair" adlı əsərdir. Bu əsər ilk dəfə 1884-cü ildə Tiflisdə[2], sonra isə 1901-ci ildə Şuşada nəşr olunmuşdur. Bu dövrdə yaşamış Azərbaycan tarixçilərinin (Mirzə Yusif Nersesov, Rzaqulu bəy Mirzə Camal oğlu, Mir Mehdi Xəzani, Həsənağa xan Qaradaği, Həsən Əfəndi Əlqədəri və başqaları) əsərləri bir qayda olaraq kompelyativ xarakter daşımaqla yerli xronika şəklində yazılırdı. Əhməd bəyin əsəri də, demək olar ki, o dövrün xronistlərindən fərqlənmir. Müəllif özü etiraf edir ki, bu oçerkin yazılmasında onun istifadə etdiyi əsas mənbələr Mirzə Camalın, Mirzə Adıgözəlin və Axund Mir Mehdinin yazıları, habelə müxtəlif tayfa və qəbilələr haqqında rəvayətlər olmuşdur. Kitabın axırında müəllif "Закафгазье от 1803 по 1806 г." adlı əsərin müəllifi olan N.Dubrovinin də adını çəkir.

Əhməd bəyin özündən əvvəlki müəlliflərdən üstünlüyü bundan ibarətdir ki, o, zəngin kitabxanaya malik olduğundan rus tarixçilərinin əsərlərindən istifadə edə bilmişdi. Cəsarətlə demək olar ki, rus xalqının mütərəqqi, demokratik fikirləri Əhməd bəyin dünyagörüşünə müsbət təsir göstərmişdi.

Haqqında danışılan əsəri yazarkən Əhməd bəyin 55 yaşı var idi. Bu dövr 1870-ci il kəndli islahatından sonra Azərbaycan kəndində kapitalist və əmtəə-pul münasibətlərinin inkişafı, muzdlu əməyin tədricən kənd təsərrüfatının bütün sahələrinə daxil olması, feodal torpaq mülkiyyətinin dağılması dövrü idi. Kənd həyatında baş verən bütün bu dəyişikliklər Əhməd bəyə və onun əsərinə müəyyən təsir göstərməyə bilməzdi. Ona görə də "Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair" əsərinə diqqətlə və eyni zamanda tənqidi surətdə yanaşmaq lazımdır.

---

1 Həmidə xanımın xatirələri. Dəftər 6, vərəq 52.

2 "Kavkaz" qəzeti, 1884-cü il, № 139.

Əhməd bəy Nadir şahın fəaliyyətinə mənfi münasibət bəsləyirdi. O, ölkənin siyasi vəziyyətini düzgün xarakterizə edərək yazır ki, Nadir şahın öldürülməsindən sonra ölkə bir-birinə düşmən olan bir çox xanlıqlara parçalanmışdı. Əhməd bəy Pənah xanı idealizə edərək, onun fəaliyyətinə müsbət münasibət bəsləyir; onu igid və qoçaq bir dövlət xadimi hesab edərək, hətta Çingiz xan nəsli ilə müqayisə edir. Bununla belə, o, səhv edərək yazır ki, Adil şah rəsmi fərmanla Pənah xanı Qarabağ xanlığına hakim təyin etmişdi. Lakin Zənd sülaləsinin tarixnəvisi Məhəmməd Sadıq yazır ki, "Pənah xan hətta nominal halda belə İran dövlətinin onun üzərinə hakimiyyətini qəbul etməmişdi"[1].

Müəllif öz ikinci babası Mehrəli bəyə dərin məhəbbət hissi ilə yanaşır. Onun fikrincə, Mehrəli bəy əlində şah fərmanı olduğu üçün mütləq hakimiyyət başında qalmalı idi. Əhməd bəyin babası Mehrəli bəyə bu cür birtərəfli yanaşması ondan irəli gəlir ki, vaxtilə xan nəslindən olan müəllif, hakimiyyətin İbrahim xanın əlinə keçməsi ilə əlaqədar olaraq, bəy zümrəsinə düşür və İbrahim xanın vərəsələrinin istifadə etdiyi güzəştlərdən məhrum olmuşdur. Ona görə də o, Məhəmməd bəyi Koroğluya bənzər "əfsanəvi" bir qəhrəman kimi tərifləyir və belə bir nəticəyə gəlir ki, İbrahim xan özünün yüksəlməsi ilə ancaq Məhəmməd bəyin qəhrəmanlığına minnətdardır. Əhməd bəy sözünə davam edərək yazır ki, "xalqı hədsiz tələbləri ilə taqətdən salan İbrahim xan öz dövrünü keçirmişdi və məmləkəti idarə etmək üçün daha zirək bir hakim lazım idi". Əhməd bəyin fikrincə, belə bir hakim onun babası Məhəmməd bəy olmalı idi.

Əhməd bəy üçün müsbət adamlardan biri də hər addımda Məhəmməd bəyin müdafiəçisi olub, sonralar Rusiyaya meyil göstərən qrupa rəhbərlik edən xanın oğlu Məhəmmədhəsən ağadır. Qeyd etmək lazımdır ki, İbrahim xanın sarayında iki düşmən qrupun olması haqqında bizə Əhməd bəydən başqa heç kəs məlumat vermir. Müəllif bu iki qrup arasındakı ziddiyyətdən danışarkən Rusiyaya meyil edənlərin İran tərəfdarlarına qalib gəldiyini sevinclə qeyd edir.

Əhməd bəyin əsərində Ağa Məhəmməd şahın Qarabağa hücumunun təsvirinə böyük yer verilir. Müəllif İran şahının şəxsiyyətinə nifrətlə yanaşır və işğalçıların talançı hücumlarını böyük qəzəb hissi ilə təsvir edir. O yazır ki, hücumlar nəticəsində əhali dözülməz aclıq çəkmiş, ölkə xarabazarlığa çevrilmişdi. Elə buradaca Əhməd bəy tələsik qeyd edir ki, şah Qacarın öldürülməsində təkcə Məhəmməd bəy böyük xidmət göstərmişdir.

Əhməd bəy Qarabağın tarixini 1805-ci ilə qədər, yəni İbrahim xanın Kürəkçay sahilində Sisianovla görüşünə qədər davam etdirmişdir. Məlum olduğu üzrə, həmin yerdə Qarabağ xanı rus imperatorunun sadiq təbəəsi olacağına and içmişdi. Bununla da müəllif Qarabağ haqqındakı təsvirini bitirir.

1 Məhəmməd Sadıq Nami. Tarixi ğitiquşa, Tehran, hicri 1317, səh. 105. 176

"Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair" adlı bu əsər faktların çoxluğu və onların izahı etibarı ilə Qarabağ tarixini öyrənmək üçün bir vəsait kimi qəbul edilə bilər.

Lakin qeyd etmək lazımdır ki, bütün yerli xronistlərə xas olan nöqsanlara baxmayaraq, Əhməd bəyin bu qiymətli əsərinin dəyərini azaltmaq düzgün olmazdı. Əgər o dövrdə Azərbaycan tarixinin kifayət qədər öyrənilməməsini və tarixi biliklərin zəif inkişaf etmiş olduğunu nəzərə alsaq, Əhməd bəyin 1747-ci ildən 1805-ci ilə qədər Qarabağın siyasi tarixini təsvir edən belə bir əsəri yazmaqla göstərdiyi təşəbbüsün əhəmiyyəti aydın olar.

Azərbaycan Elmlər Akademiyasının Tarix İnstitutu, Əhməd bəy Cavanşirin "Qarabağ xanlığının 1747-1805-ci illərdə siyasi vəziyyətinə dair" adlı əsərinin rus dilində çapdan çıxmasından yarım əsrdən artıq bir müddət keçdiyini nəzərə alıb, həmin əsəri geniş oxucu kütlələrinə təqdim edir.

Ə.B.Şükürzadə

## QARABAĞ XANLIĞININ 1747-1805-Cİ İLLƏRDƏ SİYASİ VƏZİYYƏTİNƏ DAİR

### I

Tarixi sənədlər və bunlara müvafiq olan xalq rəvayətləri[1] göstərir ki, istər Zaqafqaziya və istərsə də İran əsərlər boyu xalqların bir yerdən başqa yerə köçürülməsi və arasıkəsilməyən toqquşmalar nəticəsində, bu yerlərin mütləq hakimi olan Nadir şahın öldürülməsindən sonra, bir-birinə düşmən olan bir çox müstəqil xanlıqlara parçalandı. Bu zaman sahibsiz qalmış taxt-tacı ələ keçirmək iddiasında olan bir çox adamlar meydana çıxmışdı. Lakin əksəriyyət onların heç birinə tərəfdar olmamış və nəticədə hər bir xan bütün qüvvəsi ilə zəif qonşuları özünə tabe etməyə və sonra da İranın şan-şövkətli taxt-tacını ələ keçirməyə çalışırdı.

Dövlət və hökmranlıq uğrunda gedən bu mübarizə Nadir şahın vəfatından başlayaraq keçən əsrin axırlarına qədər (1) davam etmiş və nəhayət, rus hökumətinin Zaqafqaziyanın siyasi işlərinə qarışmasına səbəb olmuşdur. Oxucunun sonradan görəcəyi kimi, Qarabağın indiki xanədanından olanların keçmiş babaları bu mübarizədə əhəmiyyətli rol oynamışlar.

Keçən əsrin 40-cı illərində Nadir şah türkləri Zaqafqaziyadan qovaraq bu ölkəni özünə tabe etdi. Lakin o, Dağıstanı fəth edə bilmədi. Nadir şahın üsul-idarəsindən narazı olan Zaqafqaziyanın köçəri qəbilələrinin nüfuzlu adamları onlara rəğbət bəsləyən ləzgilərə pənah gətirir və onlarla birlikdə ölkədə qarışıqlıq törədirdilər. Buna görə də Nadir Qarabağın köçəri tayfalarını elli-obalı Xorasan valiliyinin Sərəxs mahalına köçürdü. Şərqin qədim adətinə görə, hər bir nüfuzlu ailə şahın yanında xidmət üçün silah daşımağa qadir olan bir adam verməli idi. Bu qay-

1 Bu oçerk bizim tərəfimizdən, Mirzə Camalın (2) Mirzə Adıgözəlin (3) və axund Mir Mehdinin (4) yazıları, habelə şahidlərin danışıqları, müxtəlif tayfa və qəbilələrin rəvayətləri əsasında tərtib edilmişdir. Öz babalarının rəvayətlərini atasından, Təbrizin keçmiş hakimi Əsədullabəydən öyrənib, bizə məlumat verən 80 yaşlı Nəcəfqulu bəyə öz minnətdarlığımızı bildiririk.

daya müvafiq olaraq, Qarabağın köçəri tayfalarından sancahlı pənahəli bəy Cavanşir adlı birisi Nadirin yanında xidmət edirdi. Rəvayətə görə, günlərin birində Nadirin nədənsə ona acığı tutur. Nadir Pənahəlinin qardaşı Behbudəli bəydən bədgüman olduğundan onu edam etmişdi. Odur ki, Pənahəli qardaşının başına gələn əhvalatın öz başına da gəlməsindən qorxaraq, özünün şaha xidmət edən altı nəfər qohumu ilə birlikdə onun düşərgəsindən qaçmışdı. Onları hər yerdə axtardılarsa da tapa bilmədilər; yalnız iki ay sonra onların Qarabağa gedib çıxmalarından xəbər tutdular. Hər tərəfə göndərilən adamlar onları uzun müddət təqib etdilər. Lakin qaçanları tutmaq əvəzinə onlar öz səhlənkarlıqları üzündən onların fəaliyyət dairəsini daha da genişləndirmiş oldular. Belə ki, Pənahəli artıq onlarca atlıdan ibarət dəstəsi ilə Car-Balakən vilayətinə, ləzgilərin yanına getmiş və onlarla birlikdə böyük dəstələr düzəldərək basqınlar etməyə başlamışdı. Pənahəli onu tutmaq üçün gələnlərlə, habelə Dağıstan tərəfdən olan basqınlardan ölkəni qoruyanlarla mübarizədəki müvəffəqiyyətlərdən ruhlanaraq, gələcəkdə özü üçün daha əlverişli şərait yaranacağı təqdirdə əhalinin rəğbətini qazanmaq məqsədi ilə xalqa zülm edənlərə qarşı amansız olmaqla, ali partizan dəstələri başçılarına nisbətən daha çox insanpərvərlik göstərirdi. Bu vəziyyət üç ilə qədər davam etdi. Nəhayət, 1747-ci ildə Nadir şahın öz qohumları tərəfindən öldürülməsi xəbəri hər tərəfə yayıldıqda, Pənahəli özünün 200-ə qədər qoçaq atlısı ilə birlikdə Qarabağa gəldi və özünü müstəqil xan elan etdi. Onun ilk nəzərdə cəsarətli görünən bu təşəbbüsü Şərqdə bu cür hallarda çox mötəbər sayılan aşağıdakı rəvayətlərə əsaslanırdı. O, Hülakü xanın[1] nəvələrindən biri olan Arqun şahın nəslindəndir (5). Onun əcdadı olub, Araz çayının sahilində, Bəhmənli kəndinin yaxınlığında Alaqarğa

1 Çingiz xanın nəvəsi Hülakü xan 1251-ci ildə İrana soxulub İsmayıllılar təriqətini məhv etmiş, Bağdadı tutaraq talan etmiş və beləliklə də, xilafət hökmranlığına son qoymuşdu. Sonra o, Qərbi Asiyaya yürüş edərək Suriyanı istila etmişdi. Onun nəsli indiki İranda, Gürcüstanda və qismən Kiçik Asiyada hökmran idi. Tequdar (düzü: Nequdar və ya Əhməd) o zamankı İranın və Kiçik Asiyanın bir hissəsinin hökmdarı, Hülakülər sülaləsinin üçüncü sultanı olmuş, xristianları təqib etmişdir. Bundan xoşlanmayan monqollar öz həmvətənləri Əhmədə nifrət bəsləmişdilər. Gürcüstan və Ermənistan hakimləri ona itaət etməkdən imtina etmişdilər. Əhməd öz qardaşını öldürmüş, lakin onun digər qardaşı Arqun Xorasanda iğtişaş törədib, onun qoşununu əzmiş və özünü də öldürərək yerini tutmuşdu.

oymağında yaşayan Məhəmməd xan adlı birisi ceyran dərisindən qayrılmış perqament üzərində yazılan bir qəbaləyə əsasən Kürəkçay, Kür, Araz, Əlincəçay və Göyçə gölü arasındakı 200 verstə qədər uzunluğu və bu qədər də eni olan bütün Qarabağ torpaqlarını satın almış və uzun müddət bu yerdən müstəqil surətdə istifadə edərək, hələ öz sağlığında oranı üç oğlu arasında bölüşdürmüşdü. Qarabağı ələ keçirmək iddiasında olan Nuxa xanı Hacı Çələbi bu xəbəri eşidən kimi dərhal öz qoşunlarını həmin yalançı hökmdarın əleyhinə qaldırmış və ilk döyüşdə onları məğlub etmişdi. Lakin bu müvəffəqiyyətsizlik təhlükəli bir işə əl atan Pənahəlini əsla məyus etmədi. O tezliklə qasidlərini Sərəxsə, öz tayfalarının dalınca göndərmiş və ümid etmişdi ki, belə qarışıq bir zamanda heç kəs onların hamısının əsirlikdən vətənə qayıtmalarına mane olmayacaqdır, özü isə onların gəlməsini gözləyərək, sağ qalan igidləri ilə birlikdə özünün köhnə dostu, indiki Zəngəzur qəzasının sakini kürd Qara Murtuzabəyin yanına getmişdi.

Sonrakı ilin yazında Pənahəli sağ-salamat gəlib çıxmış olan öz qohum-əqrəbasından və kürdlərdən ibarət böyük bir dəstə düzəldib Hacı Çələbinin üzərinə yürüş etdi. O, Hacı Çələbinin dəstələri ilə ilk döyüşdə Boyat[1] qalasını tutdu və tezliklə nuxalıları tamamilə sıxışdırıb Kürün o tayına atdı. Lakin böyük qüvvə ilə özünü yetirən Hacı Çələbi onu öz dəstəsi ilə birlikdə Boyat qalasında mühasirəyə aldı. Əgər kiçikdən böyüyə qədər bütün qohumları köməyə gəlməsəydi, yəqin ki, Pənahəli bu bəladan camnı qurtara bilməyəcəkdi. Pənahəli köməyə gələn qüvvələrin yardımı ilə qalanın divarları yaxınlığında baş vermiş bir qanlı döyüşdə Hacı Çələbini tamamilə əzdi. Məğlubiyyətdən sonra Kürün o tayına çəkilmiş Hacı Çələbi məyusluqla demişdi: "Pənahəli özünü xan elan etmişdi, mən isə öz məğlubiyyətimlə onun xanlığını təsdiq etdim" (6).

Uzaqgörən Hacı Çələbi heç də səhv etməmişdi. Bu qalibiyyətdən sonra Pənah xanın igidliyi haqqında dillərə düşən dastan, o zaman Qarabağda yaşayan bütün müsəlman tayfalarını müharibəsiz olaraq onun təbəəliyinə tabe etdirdi. Bu hərc-mərclik dövründə bir növ müstəqilləşən erməni xəmsə məliklərindən (5 nəfər əyalət rəisindən) biri - öz əmisi malik Seyni (7) xaincəsinə öldürdüyünə

1 Bu qalanın uçuqları hazırda Şuşa qəzasının Kəbirli nahiyəsindədir.

görə, başqa məliklərin nifrətini qazanmış olan Məlik Şahnəzər öz Vərəndə əyaləti ilə birlikdə könüllü surətdə Pənah xanın təbəəliyini qəbul etdi. Qalan dörd məlikdən Xaçın məliki Ulubab (Həsən Cəlalovların xələfi) Ballıca oymağı yanında müqavimət göstərdikdən sonra oğlanları ilə birlikdə qılıncdan keçirildi. Qonşu vilayətlərdən toplanmış xəzinə pullarını saxlayan Tuğ və ya Dızaq məliki Yeqan öz oğulları və qohumları ilə birlikdə kəskin müqavimət göstərdikdən sonra, onların bir hissəsi isə islam dinini qəbul etmişdi. Türklərə qarşı Nadir şahın müharibəsində öz igidliyinə görə Sultan[1] rütbəsi almış Çiləbörd məliki Allahqulu - Sultan (8) əvvəlcə onun təbəəliyini qəbul etmiş, lakin sonralar xəyanətdə ittiham edilərək Pənah xanın əmri ilə öldürülmüşdü. Onun qardaşı Məlik Hətəm Talışın beşinci məliki Məlik Üsubla (9) ittifaq bağlayıb, uzun müddət öz obalarını Pənah xan dəstələrinin hücumlarından müdafiə etmiş, lakin Mardakert kəndində uğradıqları məğlubiyyətdən sonra Tərtər çayının yuxarılarında yerləşən alınmaz Cırmıx (10) qalasına çəkilmişdilər. Bir ilə qədər qalada qaldıqdan sonra, nəhayət, öz ailələri ilə birlikdə qürbət ellərdə nicat axtarmalı olmuşdular. Lakin onlar bununla öz siyasi fəaliyyətlərini bitirmədilər. Belə ki, sonralar onların həm özləri və həm də övladları (birincinin oğlu Məlik Məcnun) daim Qarabağa hücumlar edirdilər. Bu dövrdə və bundan bir qədər sonra Gürcüstandan və digər qonşu xanlıqlardan Pusyan, Qaraqarlı, Cinli, Dəmirçi Həsənli, Qızd Hacılı, Səfi-Kürd, Boy-Əhmədli, Saatlı, Kəngərli köçəri tayfaları və bir çox başqaları Qarabağa, Pənah xanın yanına köçüb gəldilər.

İndi də Zaqafqaziyanın vəziyyətinə bilavasitə təsir göstərmiş olan İrandakı hadisələrə nəzər yetirək. Nadir şah öldürüldükdən sonra İran taxtına onun qardaşı oğlu Adil şah çıxdı. İşğal edilmiş yerlər onun tərəfdarları arasında bölüşdürülərkən, o zaman Zaqafqaziyanı da əhatə edən Azərbaycan valiliyi sərdar Əmiraslan xanın (11) payına düşmüşdü. Pənah xan isə məliklərə rəğbət bəsləyən və ona həsəd aparan öz qonşuluğundakı xanların fitnələrindən qorxuya düşüb, xaricdən kömək və ya himayə axtarrnağa məcbur oldu. Buna görə də o, sərdar Əmiraslan xanın yanına elçi göndərib şaha öz itaətini bildirdi. Yenicə Təbrizə gəlmiş olan və belə iğtişaşlı məmləkətdə

1 İran və Zaqafqaziyada sultan "yüzbaşı" deməkdir.

müttəfiq tapmaqda çətinlik çəkən sərdar üçün bu, göydəndüşmə bir şey oldu. Bundan bir az sonra sərdar çoxlu qoşunla Boyata gəldi. Buradan o, Pənah xanla birlikdə Şamaxı, Nuxa və Gəncə xanlıqlarını Adil şahın təbəəliyinə tabe etdi. Pənah xanın hökumətə göstərdiyi bu xidmət müqabilində sərdarın xahişi ilə Adil şah tərəfindən verilmiş fərmana əsasən Qarabağ xanlığı xüsusi bir malikanə kimi ona verildi. Lakin Adil şahın şahlığı və onun valisinin hökmranlığı çox sürmədi; birincini Nadir şahın nəvəsi Şahrux Mirzə, ikincini isə qaradağlı Kazım xan öldürdü. Taxt-taca sahib olmaq istəyən yeni rəqib də uzun müddət şahlıq edə bilmədi.

Bu qarışıqlıq zamanı özünü şah elan edənlərin sayı-hesabı yox idi. Əzizxan adlı bir özbək (12) çoxlu qoşunla Türkistandan İrana soxulub heç bir müqavimətə rast gəlmədən onu eninə və uzununa keçərək Təbrizi tutdu. Burada o, əhali üzərinə ağır vergilər qoyaraq heç bir şeylə hesablaşmadan, eyş-işrət içində yaşayırdı. Bu zaman Məhəmmədhəsən xan Qacarın başçılığı ilə şiə xanları ona qarşı bir ittifaq düzəldirlər. Tərkibində Pənah xanın öz oğlu Mehrəli xanın başçılığı altında göndərdiyi 3 min süvari olan 18 min nəfərlik ordu Məhəmmədhəsən xan Qacarın başçılığı altında özbəkləri əzib darmadağın etdi.

Pənah xanın başçılığı ilə başqa bir ittifaq gəncəli Şahverdi xan, naxçıvanlı Heydərqulu xan və qaradağlı Kazım xan arasında bağlanmışdı. Bu ittifaq çoxlu qoşunla Şahverdi xanla Heydərqulu xanın torpaqlarına soxulmuş və hətta Araz çayının sahillərinə qədər gəlmiş gürcü çarı II İrakliyə (13) qarşı çevrilmişdi. Bu mübarizədə müttəfiqlər nuxalı Hacı Çələbiyə müraciət edib, ondan kömək istəməyə məcbur oldular. Hacı Çələbi isə qazanc üçün olduqca əlverişli olan bu şəraitdə həmin dövrün rəhbərlərindən gözlənildiyindən daha artıq bir qeyrət göstərdi. Rəvayətə görə, o müşavirə çağıraraq Kürdən o taya keçmək qərarının müşavirədə qəbul olunmasını təklif etdi. Beləliklə, nuxahlar Gəncə (Yelizavetpol) qalası yaxınlığında Kürü keçərək müttəfiqlərlə birlikdə İraklinin qoşunlarını darmadağın etdilər və onları Tiflisə qədər qovdular. 1752-ci ilə yaxın Pənah xan öz iqamətgahını Boyat qalasından Şahbulağa köçürdü. Lakin iqlimi isti olduğundan, habelə həmin yerin xanlığın inzibati mərkəzi olması, strateji cəhətdən əlverişli olmaması üzündən, o burada həmişəlik qalmağı münasib görmədi. Qonşu xanların bac və əmanət tələb etmələri və əks təqdirdə onu ölümlə hədələmələri

Pənah xanı öz mövqeyini möhkəmləndirməyə və yalnız bundan sonra döyüş meydanında taleyini sınamağa vadar etdi. Bu mülahizələri nəzərə alaraq, o, 1754-cü ildə (14) indiki Şuşa şəhərinin yerində öz iqamətgahını qurdu və oranı öz adı ilə, yəni Pənahabad[1] adlandırdı. Həmin bu ad ilə Şuşada 15 qəpik qiymətində olan gümüş pul da kəsməyə başladılar. Pənah xan öz təbii şəraitinə görə üç tərəfdən alınmaz olan yeni iqamətgahını təzəcə möhkəmlətdiyi, adlı-sanlı bəylərin və müxtəlif yerlərdən gəlmiş sənətkarların özləri üçün yenicə daldalanacaq düzəltdikləri bir zamanda Şuşaya belə bir pis xəbər gəlib çatdı ki, Məhəmmədhəsən xan Qacar Şuşa üzərinə hücuma keçmişdir. Pənah xan çoxlu qoşun toplayaraq müharibə meydanında düşmənlə üz-üzə gəlməkdən çəkinmədi. Şuşanın 30 verstliyində, Xatın arxı adlanan yerdə başlanan qanlı vuruşmada iranlılar məğlub oldular. Bu vuruşmada Pənah xan düşmənin iki ağır topunu[2] qənimət aldı, döyüşdə Ərdəbil qalasını tutaraq, Dərgahqulu bəyi oraya hakim təyin etdi.

Həmin ilin qışında Pənah xanın seçmə alayları evlərinə buraxılan zaman Nadir şahın ən təcrübəli sərkərdələrindən olan rumlu Fətəli xan adlı birisi 30 min nəfərlik qoşunla qəflətən Şuşa yaxınlığında göründü. Fətəli xan qalanı qəflətən tutmaq üçün öz seçmə qoşunları ilə Qarqar çayı tərəfdən hücuma keçmişdi. Rəvayətə görə, bu tərəfdən qala üzərində elə bir sükut hökm sürürdü ki, hücum edənlər dərələrdə və divarların arxasında gizlənmiş seçmə dəstələri görmədən sərt qayalara dırmaşaraq, atəş açmadan qalanı tutmaq ümidində idilər. Lakin qala divarlarının yaxınlığında onların gurultulu hay-küyü eşidildikdə, mühasirəyə alınanlar gizləndikləri yerlərdən çıxıb çağırılmamış qonaqların üzərinə cumdular və onlarla əlbəyaxa vuruşmaya girdilər. Uzun yol gələrək yorulmuş və qəfildən edilən hücumdan qorxuya düşmüş düşmənlər dəstə-dəstə düzülüb döyüşə girdilər, lakin davam gətirməyib geri çəkildilər, onların bir qismi qırıldı, bir qismi isə güc-bəla qaçıb canını qurtara bildi. Bu müvəffəqiyyətsizlik inadkar rumlunu öz işğalçılıq niyyətindən əl çəkməyə məcbur edə bilmədi. O, Pənah xandan narazı olan erməniləri və qonşu xanları öz ətrafına toplayaraq, Şuşanın

1 Lakin sonralar bu şəhər qonşuluqdakı kəndin adı ilə Şuşa qalası adlandırıldı.

2 1826-cı ildə ruslar həmin toplardan Abbas Mirzənin qoşunlarını atəşə tutmuşdular.

verstliyində olan Xocalı kəndində möhkəmləndi. Beləliklə, müharibə partizan müharibəsi xarakteri aldı. Qara Murtuz bəy və Pənah xanın başqa silahdaşları bu yerlərə bələd olmayan rumluları müvəffəqiyyətlə tələyə salaraq qırırdılar. Bu zaman Fətəli xan bir hiylə işlətdi: o, əsirləri dəyişdirmək və öz qızını Pənah xanın oğlu İbrahim xana ərə vermək bəhanəsi ilə İbrahim xanı qonaq çağırdı və Pənah xanı öz vassalı elan edib, ələ keçirdiyi əmanətlə (girovla) birlikdə geri qayıtdı. O zaman İranda Fətəli xandan başqa, bir də Kərim xan Zənd məşhur idi. O hakimiyyət arzusunda olmaqdan başqa, həm də döyüşdə onun qardaşını öldürən Fətəli xana qan ədavəti bəsləyirdi. Pənah xan bu ədavətdən istifadə edib, onun yanına qasidlər göndərdi. Onlar öz birgə hərəkətləri barəsində razılığa gəlib, hər iki tərəfdən Fətəli xanın üzərinə hücuma keçdilər və onu məğlub edib, özünü əsir aldılar və İbrahim xanı da sağ-salamat geri qaytardılar. Ümumi düşmən üzərində əldə edilmiş birgə qələbədən sonra qaliblərdən yalnız biri üstün olmalı idi. Şübhəsiz ki, bu birincilik, artıq demək olar ki, bütün İranı özünə tabe etmiş olan Kərim xan Zəndin əlinə keçdi. Bundan istifadə edən və Pənah xan kimi məşhur və cəsarətli bir başçının öz gələcək hərəkətlərində ona mane olacağından qorxan Kərim xan təcrübəli bir məsləhətçi adı ilə həm onu, həm də onun oğlunu Şiraza, öz yanına apardı; Qarabağ xanlığını idarə etməyi isə fərmanla onun ikinci oğlu Mehrəli xana tapşırdı (15) (1172-ci il hicri)[1].

## II

Mehrəli xan Qarabağ xanlığının idarəsini ələ aldıqdan sonra atasının vəsiyyətinə əsasən xanlığın daxili işləri ilə məşğul olur; Şuşanın möhkəmləndirilməsini başa çatdırır və o zamanlar köçəri tayfaların qışladığı Şuşa ətrafındakı yerlərə basqın edən quldur dəstələrinin yolunu kəsmək üçün Əsgəran və Ağoğlan qalalarını tikdirir.

---

1 Ali senat tərəfindən təsdiq edilmiş bu fərman Mehrəli xanın varislərini Qarabağ xan ailəsinin üzvləri hesab edən bir sənəd olmaq etibarı ilə varisləndirir. Rəvayətə uyğun olsun deyə, burada izah edək ki, atalarının vəfatından sonra taxt-tac üstündə Mehrəli xanla qardaşı İbrahim xan arasında baş verən ixtilaf nəticəsində İbrahim xanın üstün gəlməsi ilə əlaqədar olaraq, Mehrəli xanın vəfatından sonra onu xan adlandırmaq qadağan edilmişdir. Buna görə də xalq içində o, Mehrəli bəy adı ilə məşhurdur.

Hicri 1174-cü ildə İbrahim xan Şuşaya qayıtdı, bundan iki ay sonra isə Şirazdan mərhum Pənah xanın cənazəsi gətirildi (16). Xanlığı idarə etmək hüququ üstündə qardaşlar arasında ixtilaf baş verdi. İbrahim böyük qardaş olduğuna görə idarə hüququnu öz əlinə almaq iddiasında idi; Mehrəli isə öz hüququnu Kərim xan tərəfindən onun adına verilmiş fərmanla əsaslandırırdı. Bu vəziyyət uzun müddət davam etdi. İbrahim avarlı Umayxanın bacısı ilə evləndikdən sonra öz tərəfdarlarının sayını artırdı və qardaşını sıxışdırmağa başladı. Mehrəli bəy Kərim xanın köməyinə pənah gətirdi. Kərim xanın, Mehrəlinin xeyrinə olaraq ərdəbilli Hidayət xanın adına göndərdiyi sərəncam yerinə yetirilməmiş qaldı. Bundan bir qədər sonra Kərim xan vəfat etdi (1779) və İran monarxiyası yenə də müstəqil xanlıqlara parçalandı. Bu müvəffəqiyyətsizlik Mehrəlini o zaman öz torpaqlarını birləşdirməyə səy edən və Zaqafqaziyanın ən qüdrətli hökmdarlarından olan qubalı Fətəli xana qoşulmağa məcbur etdi. Çoxlu süvari ilə Qarabağın aran hissəsini ələ keçirən Mehrəli bəy Fətəli xanı gözləyirdi; Fətəli xan isə Gəncəni tutduqdan sonra İbrahim xanı tamamilə yıxmaq üçün Şuşaya gəlməli idi. Bu zaman Mehrəli bəy Fətəli xan tərəfindən öz oğlanları ilə birlikdə Şamaxıdan qovulmuş və vətəndən uzaq düşüb sərgərdan həyat keçirən şirvanlı Ağası xan tərəfindən (hicri 1198) xaincəsinə öldürüldü (17).

Beləliklə, İbrahim xan müstəqil xan olaraq, Kərim xanın, Mehrəlinin, eləcə də Gəncəni ələ keçirdikdən sonra qəflətən vəfat etmiş Fətəli xanın ölümü nəticəsində yaranan fürsətdən istifadə etdi. Bu məqsədlə İbrahim xan əksərən ləzgilərdən ibarət çoxlu qoşun düzəldib Gəncə, Şamaxı, Nuxa xanlıqlarını və Rəşti özünə tabe etdi. İrəvan və Naxçıvan tərəfindən sərhədləri genişləndirdi. Təbrizi döyüşsüz tutdu və bacısı oğlu Əsədulla bəyi oraya hakim təyin etdi. Sonra o, Azərbaycanla İranın sərhədlərindəki Qaflan Guh dağında 600 nəfər süvaridən ibarət bir gözətçi dəstəsi qoydu və beləliklə də bu taydakı bütün tayfaları özünə tabe etdi. Bu dövrdə İbrahim xanın qüdrəti o qədər yüksəlmişdi ki, onun vassallarından bir çoxu ata-baba yolu ilə gedib, ona şahlıq təklif edirdilər. Lakin bu vaxtlar az qala bütün İranı istila etmiş Məhəmmədhəsən xanın oğlu Ağa Məhəmməd xan Qacarın qalibiyyətli yürüşlərindən təşvişə düşmüş İbrahim xanın gözünə şahlıq görünmürdü; çünki onun qarşısında vuruşmaq, ya da müəyyən şərtlərlə Qacara tabe olmaq dururdu.

İbrahim xan dürüst məlumat topladıqdan sonra Ağa Məhəmməd xanın ilk təklifini rədd etməyə cəsarət etməyərək, öz qohumu Əbusəməd bəyi onun yanına əmanət göndərdi. Lakin bir neçə ildən sonra Əbusəməd bəy öldürüldü və Ağa Məhəmməd xan onun əvəzində başqasını tələb etdi. Bunun cavabında İbrahim xan ona bildirdi ki, onun bir nəfər əmanəti bütün əshabələri ilə birlikdə öldürüldüyünə görə, belə bir şərəfli işi kimə təklif edəcəyini bilmir. İbrahim xan, eyni zamanda, gürcü çan İraklinin rusları köməyə çağırdığından xəbər turub; öz tərəfindən Məlik Yusifin və Məlik Cümşüdün müşayiəti ilə saatlılı Mirzə Məhəmməd Qulunu Rusiyaya elçi göndərib, rus təbəəliyini qəbul etdiyini bildirdi və tezliklə kömək göndərilməsini xahiş etdi. Elçilər xoş xəbərlə qayıtdılar. Ağa Məhəmməd xan bundan xəbər tutdu və 1795-ci ildə saysız-hesabsız qoşunla Şuşa şəhərinə yaxınlaşdı. Rusiyadan kömək gözləyən İbrahim xan 15000-dən[1] artıq seçmə igid toplayıb, şəhər və onun ətrafını möhkəmləndirərək, qızğın müqavimətə hazırlaşdı. Ağa Məhəmməd xan şəhəri iki tərəfdən mühasirəyə alıb, iri toplardan şəhərə daş və mərmi yağdırırdı. Özünə son dərəcə güvənən Ağa Məhəmməd xan İbrahim xana aşağıdakı məzmunda həqarətli bir beyt yazıb göndərdi:

Zi məncəniqi-fələk səngi-fitnə mibarəd.
To əbləhanə girifti miyani-Şişə qərar. (18)

Yəni:

Göydən yağış kimi daş yağır.
Ay axmaq, axı "Şuşa"[2] bunlara davam gətirməz. (19)

İbrahim xan da ona beytlə cavab verdi:

Gər nigahdan-mən anəst ki, mən midanəm.
Şişəra dər bəğəli-səng nigah midarəd. (10)

Yəni:

Doğrudur, tanrı məni Şişədə əyləndirmişdir,
Lakin o, bu şişəni daş içərisinə almışdır. (21)

---

1 Burada heç bir mübaliğə yoxdur; o zaman Şuşada əhali indikindən müqayisə edilməyəcək dərəcədə çox idi və bundan əlavə, daimi olaraq muzd ilə 3000 nəfərə qədər ləzgi hazır saxlanılırdı. Əmin-amanlıq vaxtı yaxşı məvacib alan bu ləzgilərə müharibə vaxtı işğal edilən yerlərdə soyğunçuluq etmək hüququ verilmişdi.

2 Fars dilində şişə "Şuşa" deməkdir. Bu sözdə cinas vardır.

Biri-birinə belə həcvlər göndərən tərəflər daha çox qızışdılar. Həmin il yazın başlanğıcından yayın əvvəlinədək iranlılar hücum etməyə cürət etməyib, Şərqdə olan ümumi taktika üzrə şəhər qarnizonunu acından öldürmək üçün hər vasitə ilə şəhərin ətrafla əlaqəsini kəsməyə çalışırdılar. Lakin bu plan baş tutmadı; belə ki, şəhər hər tərəfdən keçilməz dağlarla əhatə olunmuşdu; onlar bu yerləri ancaq talan edə bildilər; kəndləri yandırır, mal-qaranı sürüb aparır, əhalini əsir edir, qadın və uşaqlara divan tuturdular. Lakin məlumdur ki, qarabağlılar da onlara borclu qalmırdılar. Müasirlərin dediyinə görə, bu müharibədə Ağa Məhəmməd xan müvəffəqiyyətsiz hücumlardan birində tutulan əsirlərə qarşı dəhşətli bir divan tutdu: o, 100 nəfərə qədər əl-qolu bağlı əsiri xırmanda dərz kimi düzüb, nalları tərsinə mıxlanmış və ucları qatlanmamış atları bu bədbəxtlərin üstündən o vaxta qədər sürməyi əmr etdi ki, onlar bir-birinə qarışıb xurd-xəşil olsunlar.

Belə bir qəddarlığa qarşı intiqam əlaməti olaraq, ertəsi gecə cinayətkarın lap qulağının dibində iki İran dəstəsi darmadağın edildi. Bunların birini, xanın qardaşı oğlu Məhəmməd bəy, digərini isə tuğlu Məlik Abbas əzdi; 100 nəfərə qədər iranlının burun-qulaqları səliqə ilə Şuşa meydanına düzülmüşdü...

Beləliklə, mühasirə davam edirdi. İran qoşunu üçün heç bir yerdən ərzaq gətirilmirdi, ordunun qoşqu heyvanları taqətdən düşmüş, süvarilər atsız qalmışdı. Ağa Məhəmməd xan yüksək bir dağın üstündə durub qəzəbindən İbrahim xana küçə söyüşləri yağdırırdı; İbrahim xan da borclu qalmayıb, ona ağzma gələni deyir və onu "Axta-xan"[1] adlandırırdı. Nəhayət, 100 min nəfərlik ordu ilə Şuşanın mühasirəsini davam etdirmək İran hökmdarına mümkün olmadı; o, mühasirədən əl çəkib (22) Qarabağın düzənliklərinə çəkildi və burada gözətçi korpusu qoyub, qalan qoşunla Gürcüstan üzərinə yeridi.

Ağa Məhəmməd xan bir döyüşdən sonra Tiflisi ələ keçirir (23) və 20000 nəfərə (24) qədər əhalini əsir aparır. Dəhşətli sərkərdə qışlamaq üçün Gürcüstandan Muğana qayıdır ki, yazda nəyin bahasına olursa olsun Şuşanı zəbt etsin.

Sonrakı ilin yazında Şuşada xəbər tuturlar ki, Kərim xanın qardaşı Lütfəli xan Zənd Farsistanda qiyam qaldırdığı üçün Ağa

---

1 Yəni Xədim xan, xalq içərisində Ağa Məhəmməd xan bu adla məşhurdur, çünki Nadirin qardaşı oğlu Adil şah onu axtalamışdı.

Məhəmməd xan öz qoşunları ilə birlikdə İranın içərilərinə çəkilmişdir və yazda müzəffər rus qoşunları Qızıl ayağın[1] başçılığı ilə (25) Xəzər sahili ilə köməyə gələcəkdir.

Bu xəbərlərin həqiqiliyinə şübhə etməyən xan, sarayında rus qoşunlarını qarşılamaq üçün böyük hazırlıq görülürdü. Xanın oğlu Əbülfət Qarabağ zadəganlarının, habelə bəzi vassal xanlıqların adlı-sanlı adamlarından təşkil edilmiş dəbdəbəli bir dəstənin müşayiəti ilə rus sərkərdəsini qarşılamaq və onunla danışıqlar aparmaq üçün Muğana - iki ay əvvəl Ağa Məhəmməd xanın durduğu yerə yola düşdülər. Düşərgədə xan oğlunu böyük bir ehtiramla qarşıladılar, gətirdiyi hədiyyələri qəbul edib, əvəzində ona qiymətli bəxşişlər verdilər; burada ona, ordunu İran sərhədlərinə qədər yeritmək üçün bir süvari dəstəsi tələb etmək təklifi edilmişdi. Səfərə belə bir hazırlıq zamanı Rusiyadan sərəncam alındı ki, imperator II Yekaterinanın vəfatı (26) ilə əlaqədar olaraq, ordu Rusiyaya geri çağırılır. Xan oğlu və onun əshabələri bu pis xəbərdən son dərəcə məyus olub geri qayıtdılar.

O dövrdə bu yerlərin əhalisi dözülməz vəziyyətdə yaşayırdı. Uzaq ölkələrdən, alınmaz kahalardan, keçilməz meşələrdən yenicə qayıtmış qaçqın əhali öz gəlişindən peşman idi; burada əsla taxıl əkilmədiyi üçün ərzaq çatışmırdı, mal-qara qırılmışdı, adamlar cəmdək, ağac kökü və pahd qozası yeyirdilər[2]. Yüzlərlə adam acından və vəba xəstəliyindən qırılırdı, bacaran başını götürüb hara gəldi qaçırdı.

## III

1797-ci ilin yazında Şuşada Ağa Məhəmməd xanın yenidən saysız-hesabsız qoşunla şəhərə yaxınlaşması haqqında mənhus bir xəbər alındı. Aclıq və vəba xəstəliyi üzündən daha şəhərdə davam gətirmək mümkün olmadığına, Rusiyadan yaxın zamanlarda kömək gözlənilmədiyinə, Türkiyə sultanının yanına göndərilən elçilərin

1 Xalq içərisində qraf Valerian Zubov belə adlanırdı, çünki, səhv etmiriksə, onun bir ayağı yox idi və bunun yerinə qızıl suyuna çəkilmiş ağac ayaq taxılmışdı.

2 O zaman biz, qəbirlərdən təzə meyitlərin çıxarılması, yemək üçün əsirlər tutmaq məqsədi ilə hücumlar edilməsi və nəhayət, bir uşağın sakit edüməsi xatirinə başqa birisinin öldürülməsi haqqında xalq içərisində çoxlu rəvayətlər eşitmişdik.

isə yalnız aparılan hədiyyələr müqabilində yeni hədiyyələr gətirib, heç bir kömək ümidi vermədiklərinə görə, İbrahim xan Şuşanı tərk edərək, öz ailəsi ilə birlikdə Car-Balakən vilayətinə getdi.

Ağa Məhəmməd xan, bu bakirə qalaya (Şərqdə bütün alınmaz qalalar belə adlandırılırdı) - Şuşaya döyüşsüz daxil oldu. Qəzəbli xana elə gəlirdi ki, bunlar hamısı yuxudur: lakin o özünə gəldikdən sonra şadlığının həddi yox idi[1]. Cəmdək yeyən bir vəhşi öz ovunu parçalamazdan əvvəl, sığallayıb onunla oynadığı kimi, Ağa Məhəmməd xan da birisinə qiymətli xələtlər bağışlayır, başqasına xan rütbəsi verirdi. Lakin eyni zamanda zindanlar məhbuslarla doldurulurdu və görünür ki, şuşalılar bu qanlı faciədən yaxalarını qurtara bilməyəcəkdilər. Ağa Məhəmməd xanın Şuşaya daxil olmasının yeddinci günü daha bir nəfər mötəbər məhbusu onun yanına gətirdilər: bu İbrahim xanın keçmiş yaxın adamı Molla Pənah idi. Bu günün cəlladı dəfələrlə qəzəblənib özündən çıxdıqdan sonra, onları nə qədər kədərli bir faciə gözləyirdi.

Ağa Məhəmməd xanın yanında baş sərkərdə olan Sadıq xan Şəqaqi də onun ordusunu lərzəyə salan qohumu Məhəmməd bəyin bu vaxtadək xanın hüzuruna gəlməməsi üzündən deyəsən, xanın gözündən düşmüşdü. Buna görə də onu yanına çağırıb deyir:

- Mən öz qisasımı kimdən almalıyam, Sadıq xan, səndən almalı deyiləmmi? Mənzilində qaldığın Məhəmməd bəyin bacılarına bildir ki, əgər axşama qədər onların qardaşı mənim hüzuruma gəlməsə, onda ərləri və ya qohumları məndən gizləndiyi üçün həbsə alınmış bütün qadınlarla birlikdə onları da öz sərbazlarımın ixtiyarına verəcəyəm...

Ağa Məhəmməd xanın axşam qəbulu. Qəzəbli hökmdarın ayağının tozunu yalamağa layiq olanların hamısı, həmçinin yeni həbsə

---

1 Rəvayətə görə, Ağa Məhəmməd xan şəhərə yaxınlaşarkən, əhali Şuşakənd tərəfə, onu qarşılamağa çıxaraq, o zaman belə hallarda məcburi olan bir mahnını oxuyaraq, axırına bu nəqəratı əlavə etmişdi:

Gəlmişik, gətirmişik bir əjdaha,
Qovmuşuq, itirmişik bir tülkünü.

Bu mahnını biri oxuyur, nəqəratı isə hamı əl çala-çala və oyunçular oynaya-oynaya təkrar edirdilər. Bu hal Ağa Məhəmməd xana o qədər xoş gəlmişdi ki, özü atdan düşüb camaata qoşulmuşdu (bəzi rəvayətlərə görə, hətta oynamağa başlamışdı). Lakin güman etmək lazımdır ki, nəqəratın birinci misrasını Ağa Məhəmməd xanın əshabələri, ikinci misrasını isə şəhər əhli oxuyurmuş.

alınanlardan bir neçə nəfəri sarayda divar boyu cərgəyə düzülmüşdülər. Onların hamısı əyinlərində çuxa, başlarını aşağı dikərək, böyük pəncərəni örtən səra-pərdənin arxasından İran hökmdarmın görünəcəyini və onun vəziri Mirzə Şəfinin işarəsini ürək çırpıntısı ilə gözləyirdilər ki, üzü üstə yerə sərilsinlər.

Nəhayət, saray əhlinə məxsus bir xilaskarlıqla baş əyən Mirzə Şəfi dəvə kimi dizlərini bükübyerə çökür və torpağı öpərək hər gözünü üç dəfə torpağa sürtür. Hamı onunla bir zamanda bu hərəkəti təkrar edir. Bu zanıan sərapərdənin arxasından cır bir səs eşidilir:

- Xoş gəlmişsiniz!.. Sadıq xan buradadırmı?

- Bəli, təsəddüqün olum! - deyə o cavab verir.

- Görünür, sən mənim qəzəbimə keçmək istəyirsən! Məgər bu gün səhər sənə dediklərim yadında deyilmi?..

- Yadımdadır, əlahəzrət! İndicə buraya gələndə mənə xəbər verdilər ki, Məhəmməd bəy öz nökərləri ilə birlikdə yuxarı qapıdan şəhərə daxil olubdur.

-Yanıma gətirin! - deyə eyni cır səs pərdənin arxasından bağırdı.

Carçılar öz hökmdarlarının əmrini eşidib dərhal Məhəmməd bəyin imarətinə qədər biri-birindən bir qədər aralı düzülərək, onu o vaxta qədər ucadan çağırmağa başladılar ki, axırda Məhəmməd bəy gəlib müstəbidin qabağında dayandı. Ağa Məhəmməd xan artıq öz roluna girməyə başlamışdı. Artıq iki həftədən çox idi ki, o, yürüşdə və Şuşada, demək olar ki, heç kəsə cəza verməmişdi. Ona görə də, çoxlu müqəssir toplanmışdı. Yeni gətirilən məhbuslar haqqında Ağa Məhəmməd xana məlumat verildikdə, o, səra-pərdəni açmağı əmr etdi və itaətkarlıqla torpağa sərilənlərin qarşısında öz qırışıq və qeyzdən dəhşətə gəlmiş üzünü göstərib bağırdı:

- Onlardan beşi çarmıxa keçirilsin, altıncı, Əli Məhəmməd ağa isə İbrahim xan tərəfindən Türkiyə sultanının yanına elçiliyə getdiyinə görə, onun seyid nəslindən olması nəzərə alınaraq boğulsun.

Öz peşələrini çox gözəl bilən bir neçə cəllad bu hökmə əsasən onu boğmağa başladılar. O isə qorxu bilməyən bir şəhid kimi özünü onların ixtiyarına verib müstəbidə lənətlər yağdırırdı; başqalarının isə əl-qolunu bağlayıb çarmıxların başına keçirir və dəhşətli mənzərəni tezliklə bitirmək üçün baltanın ardı ilə çarmıxları altdan yuxarı vururdular. Bu vəhşiliyin bədbəxt qurbanları ah-zar edirdilər; onların fəryadı, müstəbidin amansız hərəkət və söyüşləri burada olanları dəhşətə və həyəcana gətirirdi!.. Cəlladlar isə çarmıxlara keçirilib

can verən qurbanların çapaladıqlarını gördükdə qana bulaşmamaq üçün ehtiyatla çarmıxları balta ilə vururdular. Baş cəllad öz həmkarlarından bir qədər aralanıb müstəbidə dedi ki, əlahəzrət, əmr etməzmisiniz ki, yeddinci cinayətkarı pələnglərə ataq, çünki daha çarmıx yoxdur və heyvanlar da bu gün heç bir şey yeməmişlər.

- Bəli! - deyə o cavab verdi, - lakin əvvəlcə onun başı bunlarınkı kimi bədənindən üzülməlidir, çünki mən sabah cinayətkarların kəllələrindən bu vaxtadək görünməmiş yüksəklikdə bir minarə qurdurmaq fikrindəyəm ("kəllədən minarə qoyduracağam").

Bu zaman imarətin qapısından təqribən qırx yaşında, boyu bir sajen, gərdənli, nisbətən uzun qollu, şıq bəzənmiş, lakin sadə geyimli, sarışın saqqah qıralmış bir kişi saraya daxil oldu və cəsarətli addımlarla birbaşa Ağa Məhəmməd xana yaxınlaşıb baş əydi, lakin yerə əyilmədi, sanki elə belə də olmalı idi.

Qorxuya düşən saray adamları kinayə ilə bir-birinə baxdılar. Sadıq xan Şəqaqi isə yerə sərilib Ağa Məhəmməd xana belə ərz etdi:

- Əlahəzrət! Bu, Məhəmməd bəy Cavanşiridir.[1]

- Bəli! Əsil qəhrəman qəssəb[2] Məhəmməddir!.. Mənim bütün ordumda bu boy-buxunda bir əsgər yoxdur. Doğrudan da onun gözləri gözəl deyildirmi? - deyə Məhəmməd xan Mirzə Şəfiyə müraciətlə öz sözünü bitirdi.

- Bəli! Elədir, qurbanın olum. Çox gözəldir, - deyə Mirzə Şəfi cavab verdi və başa düşdü ki, xan bu işarə ilə bu bədbəxtin də gözlərini çıxarmaq istəyir.

- Əlahəzrət!.. Yaxşı igidin adını eşit, özünü görmə...[3] - deyə Məhəmməd bəy cavab verdi.

- Yox, mən zarafat etmirəm. Ağamın ərvahma and olsun ki, mən bu boy-buxunda, lakin boyda səndən bir qədər alçaq olan ancaq Lütfəli xan Zəndi tamyırdım. Yeri gəlmişkən, biz hələlik sabah da danışa bilərik, artıq axşamdır. Sadıq xan! Məhəmməd bəyi sənə tapşırıram, - deyə xan mızıldandı. Sonra hamıya müraciətlə qısaca "mürəxxəs!" deyib, özü də yataq otağına çəkildi.

---

1 Bu tarixi şəxsiyyət haqqında bizim məmləkətin hər yerində çoxlu əfsanə, mahnı və rəvayətlər eşitmək olar. Xalq onu o qədər sevir ki, başqalarının igidliklərini də onun adına çıxır, buna görə də, biz onun haqqında sonradan ətraflı məlumat verəcəyik.

2 Bizlərdə "qəssəb" bütün başkəsən qəhrəmanlara verilən addır.

3 Azərbaycan zərb-məsəlidir.

Xan oğlu Məhəmmədhəsən ağanın o zaman Ağa Məhəmməd xanın iqamətgahı olmuş, indi isə az qala dağılmış imarətindən dörddə bir verst aralı Məhəmməd bəyin atası Mehrəli xanın da indi az qala dağılmış olan bir imarəti var idi. Sadıq xanla Məhəmməd bəy yanaşı və dinməzcə oraya gedirdilər. Onların kədərli, lakin məğrur simalarında ruhi əzab izləri aydın görünürdü. Lakin onlar bunu adamlardan gizlətməyə çalışırdılar. Onlar biri-birilə və yaxın adamları ilə söhbət edərkən təsəlli verə biləcək heç bir şey düşünə bilmirdilər. Gecə yarısına qədər belə keçdi. Bu zaman onlara bildirdilər ki, Ağa Məhəmməd xanın saray adamlarından bir nəfər Sadıq xanı görmək istəyir. Müsahiblər daha çox həyəcana düşdülər. Ağa Məhəmməd xanın pişxidməti Səfərəli bəy içəri daxil oldu.

- Əlahəzrətdən mənə nə kimi yeni xəbər gətirmisən, - deyə Sadıq xan onu salamladı.

- Mən gizli bir tapşırıqla gəlmişəm; əmr edin, Məhəmməd bəydən başqa hamı otaqdan çıxsın, - deyə o cavab verdi.

Hamı çıxdıqdan sonra, gələn adam ətrafa göz gəzdirib, söhbətə başladı:

- Sadıq xan, bu gün hökmdarımızın qızğın qəzəbinin nəticələrindən hali olmamış deyilsiniz və onun kimi nəzərdə tutduğunu da, yəqin ki, yaxşı bilirsiniz. Məhəmməd bəy, siz isə öz bacılarınızı ələ verməməklə, tutaq ki, çox alicənab hərəkət etdiniz. Lakin, əlbəttə, müstəbidin ən yaxşı qoşunlarını dəfələrlə qırdığınız üçün sizi nə gözlədiyini bilirsiniz. Şübhəsiz, siz onunla söhbət zamanı öz xeyrinizə olmayan bəzi şeyləri də başa düşməmiş deyilsiniz.

- Səfərəli bəy! - deyə Sadıq xan qorxu və inamsızlıqla ona etiraz etdi; əqliniz başınızdadırmı?! Nə üçün belə mənasız sözlər danışırsınız?

- Bəli, Sadıq xan, əqlim başımdadır. Buna görə də mən cəsarət edib bu həqiqəti sizə söyləyirəm ki, sabah mənim də taleyim sizinki kimi olacaqdır.

- Buyurun, aydın deyin görək nə olmuşdur və şah sizi mənim yanıma nə üçün göndərmişdir?

- Məni sizin yanınıza şah göndərməmişdir. Həm də buna görə gəlmişəm ki, siz gedən kimi o, and içdi ki, sabah kəllələrdən iki minarə qurduracaqdır; bunların birinin üstündə mənim kəlləmlə Məhəmməd bəyin kəlləsi, digərində isə Abbas bəyin kəlləsi ilə sizinki görünəcəkdir. Onun öz atasının qəbrinə and içdikdən sonra nə qədər rəhmsiz olduğunu isə, yəqin ki, siz məndən də yaxşı bilirsiniz.

- Bunların hamısı ola bilər, - deyə Sadıq xan bir qədər yumşalıb etiraz etdi, - o nəyə görə sizə belə qəzəblənə bilərdi?

- Sizə nəyə görə qəzəblənibsə, mənə də ona görə qəzəblənib. Məgər siz bizim müstəbidi tanımırsınız ki, o, qəzəbini böyük bir qəddarlıqla həmişə öz tabelərinin üzərinə tökür. Sizdən uzaqlaşmağa başladığınız gündən, o həmişə lütfkarlıq göstərirdi. Deyəsən, siz özünüz də bizdən tamamilə uzaqlaşmışsınız. Lakin o həmişə özünə qarşı sui-qəsd hazırlanmasından və guya bizim də onda iştirak etməmizdən şübhələnir. Mən onun Mirzə Şəfi ilə danışıqlarından bunu duymuşam. O mənim və Abbas bəyin əvvəllərdə sizə olan sədaqətimizi bildiyinə və sizin barənizdə bədgüman olduğuna görə, bu dəfə də məhz ona görə bizə irad tutur ki, biz sarayda olduğumuz halda dərhal onun çağırışına cavab verməmişik.

- And olsun qadir Allaha ki, - deyə Məhəmməd bəy ürəkdən söhbətə girişdi, - Səfərəli düz deyir, çünki o, kələk işlətmək istəsə idi, bu dil ilə danışa bilməzdi. Biz öz barəmizdə və yüzlərlə bədbəxt qurbanların barəsində vaxtında düşünməliyik.

- Mən də inanıram, - deyə Sadıq xan cavab verdi, - lakin biz nə edə bilərik?!

- Sadıq xan, bu sizin işiniz deyildir, - deyə Səfərəli onun sözünü kəsdi. - Hamımızın xilas olması üçün biz Abbas bəylə birlikdə lazım olan hər şeyi edərik. Bu, keçmişlərə bənzəməz; o zaman bizim üçün təhlükə yox idi və belə bir münasib fürsət də ələ düşməzdi. Siz ancaq bizə söz verin ki, rəhm edib bizi onun tərəfdarlarının əlinə verməyəcəksiniz. Mən sizin yanınıza məhz bunun üçün gəlmişəm.

- Söz veririk, - deyə Məhəmməd bəy ürəkdən cavab verdi. - Mən öz nökərlərimlə birlikdə dünyanı bu cəlladdan xilas etmək xatirinə canımdan belə keçməyə hazıram. Siz ancaq bizə yol göstərin. Əgər bu gün o mənim barəmdə xoşagəlməz bir söz desə idi, mən heç bir şeyə baxmadan, çuxamın altında gizlətdiyim xəncərlə onun üstünə atılardım.

- Yox, yox! Biz bununla ancaq vaxtsız həyəcan törədə bilərik. Mən öyünmədən sizə demişəm və indi də deyirəm ki, ancaq sizin vədinizi eşitmək istəyirdim. Qalan şeylər barəsində heç narahat olmayın! - deyə Səfərəli cavab verdi və tələsik çıxıb getdi.

Ağa Məhəmməd xanın pişxidməti öz hökmdarının yataq otağına qayıdana qədər Şuşanın mənzərəsinə bir nəzər salaq, onu tarixi və topoqrafik cəhətlərdən təsvir etməyə çalışaq.

Dumanlı havada şəhərin hər hansı bir yerindən şimala, şimal-şərqə və şimal-qərbə nəzər salan adam belə gözəl bir mənzərədən valeh olar: burula-burula qalxan dumanlar və qara buludlar gah Qarabağ dağlarının qara zirvələrini və ağaran Qafqaz dağlarını dövr eyləyərək onların başına dolanır və onlara toxunub dağılır, gah da bir anlığa onların qabağını örtür. Bu gözəl mənzərə Krım yarımadasına gəmidən tamaşa etmiş olan bir müşahidəçiyə onun gördüyü mənzərəni xatırladır. Fırtmalı gündə daim köpüklənib coşan ağ ləpələr sanki gəmini öz ağuşunda sıxıb əzmək istəyirmiş kimi, gah üfüqü görməyə imkan vermir, gah da gəmini göylərə qaldırır və Ayıdağ, Çatırdağ və Krım yarımadasının başqa zirvələri göz önündə canlanır. Şimal-şərq tərəfdəki qayalı dağlar öz kənar çıxıntı və bürcləri ilə taclı başını qürurla yüksəldən əfsanəvi nəhəngləri xatırladır.

Cənub-şərq tərəfdən Şuşanı hər iki tərəfdən hündürlüyü 200 sajendən çox və eni 100 sajenə qədər olan sıldırım qayalı dərə əhatə edir. Ağa Məhəmməd xan ... Şuşanı tutmaq fikrində olduğu bu dərənin üstündə gözəl bir bürc[1] var idi. Bu bürc şəhərin o biri tərəfində olan qaya üzərində, ətrafında bir cığır belə olmayan yuva kimi görünür. Qayanın eninə dağılmış olan hissəsi vaxtilə bu qalaya yol olduğunu sübut etsə də, bizim şuşalılar iddia edirlər ki, onu devlər[2] və pərilər tikmiş və burada saysız-hesabsız xəzinə gizlədilmişdir. Buna görə də həmin dərə Xəzinə qayası adlanır. Həmin bürcdən aşağıda sanki qayaya yapışmış bir qəsr vardır; oradakı kahadan soyuq bir bulaq axır. Bu qəsr vaxtilə ən qorxulu zamanlarda əhalinin etibarlı sığınacaq yeri olmuşdur. Dərənin o biri tərəfində, çayın lap üstündə tövlə xarabalıqları görünür; yuxarıda, qəsrin qarşısında isə hasara alınmış və indiyədək içərisinə ayaq dəyməmiş bir kaha vardır ki, bu da Şahnəzər kahası adı ilə məşhurdur. Zənn edildiyinə görə, bu kaha qaya boyu, şəhərin altından keçən yeraltı yol vasitəsi ilə o biri tayda, yuxarı qapının aşağısında başqa bir ucsuz-bucaqsız kaha ilə birləşir.

Bəlkə də devlər və pərilər Şuşanın altından bu oyuğu ona görə açmışdır ki, öz aşnalarına təhlükə üz verəcəyi təqdirdə bu oyuqdan

---

1 Həmin bürcü bu yaxınlarda macəra və dəfinə axtaranlardan Kərbəlayı Məhəmməd adlı birisi dağıtmışdır; bizim sualımıza cavab olaraq o həmin bürcdən yastı və uzun mis pullar, insan sümükləri və s. tapdığını demişdir.

2 Dev - insanla şeytan arasında, pəri isə insanla mələk arasında fövqəltəbii bir xəyali varlıqdır.

bir ip keçirib, qaya üstündəki bütün şəhəri öz üzərlərinə yıxsınlar və nəhəng qanadlarını çalıb, bu qiymətli göylərə qalxsınlar. Yaxud əksinə, bu qəniməti qaldırıb, sonra insanların günahları üzündən Sodam (27) və Homarra (28) kimi fəzadan yerə atsınlar...

Cənub tərəfdən, Kirs dağından Şuşaya bir nəzər saldıqda ətəklərində bu şəhərin yerləşdiyi alınmaz qaya ilə şəhərin yarımdairəvi görünüşü duman arasından, içərisində maye qaynadıldığına görə buxarlanan nəhəng bir mis qazanı xatırladır... Əbəs deyildir ki, Ağa Məhəmməd xan İbrahim xanla söyüşərkən ona belə demişdi: Filan-filan şüdə! Sən qazanın içində əyləşib, onun dəstəsini əlində tutmusan və elə xəyal edirsən ki, guya mənimlə çəkişirsən?! Mərhəba sənə! Hünərin varsa, çıx meydana!..

Oxucu, indi də baxaq görək, qəzəbli müstəbidin pişxidməti qazanda nə qaynatmışdır. Səfərəli tələsik Abbas bəyin yanına qayıdıb onunla pıçıldaşdıqdan sonra hər ikisi Ağa Məhəmməd xanın yataq otağının qapısında gizlənirlər. Onlar qapı dalından onun qarışıq və dəhşətli sözlərini eşidirlər. Abbas bəy öz yoldaşının qulağına pıçıldayıb deyir ki, o, yuxuda sayıqlayır. Sən gedəndən sonra mən bir neçə dəfə bu sözləri eşitmişəm.

Nəhayət, qatillər Allahı və bütün müqəddəsləri köməyə çağırıb sıyırma qılıncla Ağa Məhəmməd xanın yataq otağına soxulur və zəif gecə çırağı işığında onun üzərinə atılırlar. Ağa Məhəmməd xan çətinliklə: - Məlunlar!.. Nə edirsiniz!.. Siz İranı viran eləyirsiniz!.. - deyə tələsik öz toppuzunu qatillərə tərəf atır. Lakin artıq gec idi; qatillər onu sinəsindən vurub, başını kəsirlər (29). Onlar diqqətlə ətrafı dinləyirlər... Hər tərəf sükut içərisindədir... Tələsik onun almaz bilərziklərini (Kuhi-nur[1] və Dəriyayi-nur[2]) qolundan açıb, qəsdin nəticəsini gözləyərək yata bilməyən həmfikirlərinin yanına qayıdırlar. Sadıq xanla Məhəmməd bəy qorxu və həyəcan içərisində idilər. Gah pəncərədən dəhşətli hadisənin baş verməli olduğu saray tərəfə qulaq asır, gah da müxtəlif bəhanələrlə həyətə çıxıb öz inanılmış adamlarından xəbər tuturdular.

Qapı döyülür...

- Kimdir?

---

1 Kuhi-nur - nur dağı

2 Dəryayi-nur - nur dənizi

- Bizik. Bizik!.. Açın!..

Budur, Ağa Məhəmməd xanın qatilləri qana boyanmış halda, qətlin sübutu olaraq gətirdikləri qiymətli şeylərlə içəri daxil olub deyirlər:

- İndi rahat ola bilərsiniz!..

- Biz qəti bir iş görməyə cəsarət etməzdən əvvəl, - deyə Sadıq xan sözə başlayır, - məlunun ölümünü yəqin etməliyik.

- Olar, - deyə Səfərəli söhbətə qarışır və dərhal onlar tələsik çıxıb gedirlər.

...Sadıq xan öz inamsızlığı üzündən itaətlə qəddini bükərək şahın yataq otağının qapısını bir qədər aralayıb, ehtiyatla içəri daxil olur. Səfərəli də cəld otağa girib, Ağa Məhəmməd xanın başını ayağı ilə itələyərək döşəməyə atır və yorğanı qaldırıb hələ soyumamış yaraları onlara göstərir... Səhər hər ikisi çıxıb gedir.

Carçılar, Ağa Məhəmməd xanın adından bütün şəhərdə Şəqaqi qoşununu çağırıb deyirlər ki, bir mühüm hadisə üzündən şah onları İrana göndərir. Sadıq xan isə bu zaman təklikdə Məhəmməd bəyə deyir:

- Əgər sübh açılanda bu faciəli xəbər hər tərəfə yayılarsa, mən burada Ağa Məhəmməd xanın adamları ilə üz-üzə gələ bilmərəm və vaxtında da paytaxta gedib çata bilmərəm; halbuki indi bütün əyalətlərin əmanətinin toplanmış olduğu paytaxtı tutmaq son dərəcə vacibdir. Buna görə də mən hamıdan əvvəl Tehranda bütün hakimiyyəti ələ keçirməliyəm, siz isə öz igidləriniz və dəhşət doğuran adınızla bu dağınıq qoşunun öhdəsindən çox asanlıqla gələ bilərsiniz.

Sadıq xanla Məhəmməd bəy belə ayrıldılar. Sadıq xan İran taxtına sahib olmaq üçün tələsik Tehrana yola düşdü; Məhəmməd bəy isə müxtəlif bəhanələrlə öz tərəfdarlarını başına toplayıb səhərin açılmasını gözləyirdi.

## IV

Gecə Məhəmməd bəy lazımi sərəncamlar verdi. Öz tərəfdarlarını dəstələrə bölüb, bəzilərinə İran qoşunlarının sərkərdələrini həbsə almağı, başqalarına məhbusları azad etməyi, üçüncülərə ümumi əməliyyat baş tutmadığı təqdirdə ən yaxşı mövqeləri ələ keçirməyi

tapşırdı. Özü isə əsas qüvvələrlə Ağa Məhəmməd xanın qərargahına getməyi qərara aldı. Səhər açılan kimi qəflətən yaxalanıb qorxu və dəhşət içərisində qalan iranlılar hər yerdə əzilib sıxışdırıldılar. Məhəmməd bəy inadlı bir vuruşmadan sonra Ağa Məhəmməd xanın qərargahını ələ keçirib, oradan külli miqdarda sərvət tapdı. Sonra Məhəmməd bəy xəzinəni və şahın bütün sərvətini öz imarətinə gətirib, ertəsi gün iranlıları Araza qədər təqib etdi.

Fəlakət o zaman azadlığa buraxılmış və canlı təəssürat altında olub, öz gələcəyi üçün kədərlənən Molla Pənahın dostu Vidadi təxəllüslü Molla Vəliyə yazdığı bir məktubda çox gözəl təsvir edilmişdir. Bizim hələ indi də məşhur olan xalq şairlərindən biri üçün xarakterik olan bu şeri bütünlüklə veririk:

Ey Vidadi, gərdişi-dövrani-kəcrəftarə bax!
Ruzigarə qıl tamaşa, karə bax, kirdarə bax!

Əhli-zülmü necə bərbad eylədi bir ləhzədə,
Hökmü adil padişahi-qadirü qəhharə bax!

Sübh söndü şəb ki, xəlqə qiblə idi bir çıraq,
Gecəki iqbalı gör, gündüzdəki idbarə bax!

Taci-zərdən ta ki, ayrıldı dimaği-pürqürur,
Payimal oldu təpiklərdə[1] səri-sərdarə bax!

Mən fəqirə əmr qılmışdı siyasət etməyə,
Saxlayan məzlumu zalimdən o dəm qəffarə bax!

Qurtaran əndişədən ahəngəri-biçarəni,
Şah üçün ol midbəri-təbdil olan mismarə bax!

İbrət et Ağa Məhəmməd xandan, ey kəmtər gəda,
Ta həyatın var ikən nə şahə, nə xunxarə bax!

Baş götür bu əhli-dünyadan ayaq tutduqca qaç,
Nə qıza, nə oğula, nə dusta, nə yarə bax!

Vaqifa, göz yum, cahanın baxma xubü ziştinə,
Üz çevir əli-əbayə, Əhmədi-Muxtarə bax!

---

1 Rəvayətə və canlı şahidlərin dediyinə görə, Ağa Məhəmməd xanın başsız bədənini və kəsilmiş başını şəhərin küçələrində gəzdirdilər. Döyüşlərdə həlak olmuş əsgərlərin hiddətə gəlmiş dul arvadları və yetim uşaqları nəşi və başı ayaq altına salıb təpikləyirdilər.

Məhəmməd bəy Qarabağ xanlığını idarə etməyə başladığı zaman hansı tədbirin daha əlverişli olması barəsində tərəddüd edirdi. Bir tərəfdən Sadıq xan çoxlu qoşun toplayaraq son zamanlarda Qarabağdan ayrılmış olan qonşu xanlıqları özünə tabe etməyi ona məsləhət görür və öz fəaliyyətində müvəffəqiyyət qazana bilsə, onu Azərbaycan valisi təyin edəcəyinə söz verirdi. Digər tərəfdən, gəncəli Cavad xan onunla qohum olmağı təklif edərək, İbrahim xanı bütün ailəsi ilə birlikdə qırmaq üçün çoxlu hədiyyə göndərməsini xahiş edirdi, çünki tbrahim xanın olduğu Car-Balakən vilayətinin kətxudaları onun qardaşı Talıbxan bəyi və başqalarını öldürmüş və onun xahişini həvəslə yerinə yetirməyə hazırdılar. Bundan əlavə, Şuşanın bir çox adlı-sanlı bəyləri və sakinləri, o zamankı adətə görə, İbrahim xanın Qarabağda qalan oğullarını bütün mötəbər adamların əli ilə öldürməyi ona təklif edirdilər ki, hamı istər-istəməz onun xeyrinə hərəkət etsin. Həm də onlar bunu əsas tuturdular ki, xalqı hədsiz tələbləri ilə taqətdən salan İbrahim xan öz dövrünü keçirmişdir, yollar ayrıcında olan bir məmləkəti idarə etmək üçün daha bacarıqlı bir hakim lazım idi.

Sadıq xanın Ağa Məhəmməd xanın qardaşı oğlu Fətəli xanla döyüşdə məğlub olması və Fətəli xanın İran taxt-tacına sahib olması xəbəri alındıqdan sonra Məhəmməd bəy bu təklifiərə cavab olaraq elan etdi ki, gec-tez güclü qonşu dövlətlərdən birinə tabe olması lazım gələn bu məmləkətdə xanlıq etibarsız olduğundan, o heç bir zaman özünün 70 yaşlı əmisini və əmisi oğlanlarını öldürməyə və ya ölkədən qovmağa razı olmaz, çünki bütün dünyanın hökmranlığını belə ona versələr, bu rüsvayçılığı yumaq olmaz. O, eyni zamanda öz əmisinin yanına hədiyyə və sursatla birlikdə elçilər göndərib, ona heç bir şayiəyə inanmamağı və öz xanlığına qayıtmağı təklif etdi. Lakin Məhəmməd bəyin həsədini çəkən saray adamlarının təsiri altında olan xan bunların heç birinə inanmırdı və Fətəli şahın vədini almadan Qarabağa qayıtmağa qorxurdu. Payızda şahın belə bir əmri alındı ki, İbrahim xan öz xanlığına qayıtsın, Ağa Məhəmməd xanın nəşini və onun ölümündə müqəssir olan Məhəmməd bəyi və pişxidmət Səfərəlini[1] onun yanına göndərsin. Bu zaman İbrahim xan əvvəlcə Məhəmməd bəyin yeznəsi olan oğlu Mehdiqulu

1 O biri qatil Abbas bəy Sadıq xanla birlikdə getmişdi.

xanı Qarabağa göndərdi ki, Məhəmməd bəyi və yerli əhalini onu qarşılamağa hazırlaşdırsın, özü isə muzdla tutulmuş böyük bir ləzgi dəstəsi ilə yola düşdü.

Öz əmisindən əsla bədgüman olmayan Məhəmməd bəy əvvəlcə xanın böyük oğlu Məhəmmədhəsən ağa ilə görüşüb, xanı qarşılamağa getdi və onu şəhərə qədər müşayiət etdi, ertəsi gün isə ona şahın xəzinəsindən qiymətli hədiyyələr göndərdi.

Eyni zamanda, xanın yanında onun böyük oğlanları və saray bəyləri məşvərətə toplaşıb, məmləkətin gələcək ehtiyacları haqqında belə bir qərar qəbul etdilər:

- Allaha şükür, biz bu qədər sərgərdan gəlib çatdıq, - deyə xanın böyük oğlu Məhəmmədhəsən ağa sözə başladı. - Xoşbəxtlikdən Məhəmməd bəyin bəd niyyətləri haqqındakı bütün şayiələr boşa çıxdı; indi biz qəddar düşmənimiz olan Ağa Məhəmməd xanı öldürdüyünə, bizim sərgərdanlığımıza son qoyduğuna görə Məhəmməd bəyə borcluyuq. Odur ki, biz onun dəfələrlə öz yaxın adamları vasitəsi ilə məndən etdiyi xahişi nəzərə alaraq, onunla yeni qohumluq əlaqəsi yaratmalı və igid sərkərdə olduğuna görə onu öz əlimizdə saxlamalıyıq.

- Əksinə, - deyə xanın qohumu Mirzəli bəy etiraz etdi, - əgər onun köhnə dostu və qohumu Şəqaqi xan İran taxtına əyləşsə idi, onun niyyəti ləzgiləri ələ almaq, bizim hamımızı qırmaq, yaxud biz buraya qayıdarkən yolumuzu kəsmək idi. Bundan əlavə, Fətəli şah hər necə olsa, onun ələ verilməsini tələb etdiyi halda siz nə edə bilərsiniz?

- O, heç də ləzgiləri ələ almaq fikrində olmamışdır. Bu, Cavad xanın fitnəsi idi; o buna razı olmamışdı, - deyə Məhəmmədhəsən ağa etiraz etdi. - Bunların hamısını mən Cavad xanın saray adamlarından biri olan öz qohumumdan öyrənib bilmişəm. Sadıq xanın işi baş tutduğu təqdirdə ... onu bu barədə ittiham etmək üçün əsas yoxdur, çünki heç kəsə özünün sələmətliyi və yüksəlməsi haqqında düşünməyi qadağan etmək olmaz. İkincisi də, Sadıq xan heç zaman o dərəcədə təkəbbürlü olmamışdır ki, öz böyük qohumlarına ehtiram göstərməsin; biz onunla əl-ələ verib, bütün Zaqafqaziya ölkəsini özümüzə tabe edə bilərik.

- Bunların hamısı ehtimaldır, - deyə xan özü sözə başladı. - Lakin əslində qaçarkən öldürülən Əbdülsəməd bəyin əvəzində başqa bir nəfərin əmanət göndərilməsi üstündə və ruslara ümid bağladığı-

mıza görə, biz imkan verdik ki, camaatımızı qırsınlar, yurdumuzu yandırıb külə döndərsinlər. Əgər biz Məhəmməd bəyi və onun yanında olan Ağa Məhəmməd xanın qatilini ələ verməsək, kimə arxalana bilərik, kimdən kömək gözləyə bilərik.

- Belə bir münasib fürsət var ikən Məhəmməd bəyi başdan etməyin bizim gələcəyimiz üçün böyük siyasi əhəmiyyəti vardır, - deyə həmin Mirzəli bəy təsdiq etdi. - Onun atası daima sizinlə mübarizə edirdi; özü isə anasının sizə ərə getməsinə razı olmayıb onu öldürdü. Həmçinin sizə ən sədaqətli olan saray adamı Molla Pənahı da öldürdü; indi isə ölkəni beş ay idarə etdikdən sonra bu qədər təkəbbürlü və sərvətli olduğu halda, onun gələcəkdə dinc oturacağına kim zamin ola bilər?

- Onun atasının mübarizə aparmasının səbəbləri var idi, - deyə yenə Məhəmmədhəsən ağa etiraz etməyə başladı. - Cavanlığında hiddətlənərək öz anasını öldürmüşsə də, atasının qatilini öldürməklə onun az qala bütün ailəsini qırmaqla və bir çox başqa igidlikləri ilə bunun əvəzini çıxmışdır. O, Ağa Məhəmməd xanın öldürülməsinə kömək etmiş, Qacar qoşunlarını ölkədən qovmuşdur. Bunların isə bizim üçün böyük əhəmiyyəti vardır[1].

- Elə bəla da burasındadır ki, onun son igidlikləri indi başımıza əngəl olubdur, - deyə xan onun sözünü kəsdi. - Əvvəllərdə dediyim kimi, iki şeydən biri olmalıdır: ya onu ələ verməliyəm, ya da öz irsi xanlığımdan əl çəkməliyəm.

---

1 Yuxarıda izah edildiyi kimi, Məhəmməd bəy öz anasını öldürdükdən sonra uzun müddət vətənindən didərgin düşmüşdü; yalnız atasını öldürənlərdən intiqam aldıqdan sonra öz qohumları ilə barışa bilmişdir. Onun necə həyat sürməsi haqqındakı rəvayətlərdən asanlıqla görmək olar ki, Məhəmməd bəy basqınlardan və öz vətəninin sərhədlərini qorumaqdan çox az hallarda boş vaxt tapırdı. Bu işlərdən asudə olduğu zamanlar isə musiqi çaldırıb iki toppuzla idman edir və cıdıra çıxırdı. Tariximizin həmin cəngavərlik dövründə atəşsaçan silah hələ indiki qədər təkmilləşdirilməmişdi; buna görə də Məhəmməd bəy və onun nökərləri çövşən geyərdilər. O zamanlar qol gücü və igidlik hər şeydən üstün idi. Buna görə də o həmin üstünlükləri olanlara qarşı səxavətli və mehriban idi. Odur ki, ətraf yerlərdən bütün seçmə adamlar dəstə-dəstə onun yanına axışırdılar. Gürcüstandan başlamış ta İranın daxili əyalətlərinə qədər, Xəzər dənizindən başlamış Türkiyə imperiyasının sərhədinə qədər geniş bir sahədə çoxlu tanışları oduğuna görə, Məhəmməd bəy həmişə öz igidləri ilə bu yerləri gəzib çox zaman bütün bir əyalətdən bac-xərac alır və bu yerin əhalisini itaətə gətirir, bəzən də özünü xan elan edən birini öz tərəfdarları ilə birlikdə təqib edirdi. Vaxtilə az qala bütün Zaqafqaziyada və Azərbaycan valiliyində hökmdar olması üçün İbrahim xan onun igidliyinə borclu idi. ->

- Xan, siz kimi ələ verirsiniz? Məgər onun atasının qürbətdə öldürülməsi vicdanımıza ağır yük deyildirmi? Mənim fikrimcə, əgər yenidən qacarlarla üz-üzə gələrkən öz qüvvələrimizə, habelə deyildiyinə görə, külli miqdarda Gürcüstana gedən rusların köməyinə bel bağlaya bilməriksə, Məhəmməd bəyə qarşı yaranmış təhlükəni ona bildirmək daha yaxşıdır ki, o, vaxtında çıxıb bir yana gedə bilsin.

- Bunların hamısı doğrudur, - deyə xanın qohumu Feyzi bəy cavab verdi. - Lakin unutmayın ki, su meymunun boğazına çıxanda balasını ayağının altına qoyar.[1]

---

—> Deyilənləri təsdiq etmək üçün onun igidliklərindən daha bir misal gətirək: İbrahim xan qaradağlı Mustafa xanın Qarabağ üzərinə hücum etməsindən xəbər tutub, Naxçıvanın mühasirəsindən əl çəkir və geri çəkilməyə hazırlaşır. Lakin Kalbalı xan onun köməyinə gələn müttəfiqlərdən xoylu Cəfərqulu xan, balbaşlı Məhəmməd Şərif Sultan və başqaları ilə birlikdə qarabağlılar üzərinə süvariləri geri çəkilməyə məcbur edir, piyada qoşunu əzir və düşərgəyə soxulurlar. Məhəmməd bəy az miqdarda nökərlərlə onların qarşısına çıxır və düşmənlərin hücumunu dayandırır, təkbətək vuruşmada Məhəmməd Şərif Sultanı öldürür və axşama qədər vuruşmanı davam etdirib, ara-sıra müvəffəqiyyət qazanaraq, nəhayət, onları geri çəkilməyə məcbur edir. Gecə İbrahim xan da geri çəkilir. Məhəmməd bəy isə bir neçə nəfər nökərdən ibarət kiçik bir dəstə ilə 100 verstdən çox at çapıb, ertəsi gün axşamçağı Araz çayı sahilində hücumdan qayıdan qaradağlıların yolunu kəsir, onların bütün talayıb gətirdikləri qəniməti, əsirləri, Mustafa xanın öz xüsusi yüklərini əllərindən alır və təkbətək vuruşmada başçılarından biri olan Səfərqulu bəyi öldürür, onun ardınca meydanda qardaşı Məhəmməd Vəli Sultanı yaralayıb əsir tutur. Müasiri olan üçoğlanlı Əlibəy müəllifə söyləmişdir ki, ertəsi gün Məhəmməd bəy Sultandan: Tüfəngin belə yaxşı tuşlandığı halda bəs nə üçün atmadı" - deyə soruşduqda, Sultan cavab vermişdi ki, onunla üz-üzə gəldikdə güllə atmasa da, öləcəyini yəqin etdiyi üçün tüfəng tamamilə yadından çıxmışdı.

Ağa Məhəmməd xanın birinci hücumu zamanı Araz çayının yuxanlarında ona qarşı Məhəmməd bəyin başçılığı ilə 3000 nəfərlik süvari dəstə çıxarılmışdı. Məhəmməd bəy xəbər tutur ki, Ağa Məhəmməd xan Araz çayının aşağılarından keçib, Hindarx kəndinin yaxınlığındakı düzənlikdə düşərgə salmışdır, xanın ərzaq daşıyan arabaçıları isə Kəhrizli kəndinə hücum edib yandırmışlar və s. O dəstədən 300 nəfər yaxşı qaçan atı olan süvari intiqam almağa gedir. Axşamüstü onlar yəhərlərinə bir şələ ot bağlayaraq özlərini ərzaq arabaçısı kimi göstərdikləri üçün heç kəs onları tanımır. Dəstə düşərgəyə çatıb otu bir tərəfə atır və heyrət içərisində qalan düşmənə hücum edir. Onlar uzun müddət müvəffəqiyyətlə vuruşur və yalnız iranlılar böyük dəstələr halında birləşdikdən sonra geri çəkilməyə başlayırlar. Doyran kəndi yaxınlığında Məhəmməd bəyin atı çuxura düşür, atı güc-bəla ilə çuxurdan çıxardır. Qaş qaralanda onlar Ərki düzündə töləyə salınmış düşmən üzərinə atılaraq onları tamamilə qırırlar.

1 Azərbaycan zərb-məsəlidir. Bizim adətlərlə tanış olan kəsə məlumdur ki, hüquqşünaslar üçün qanun maddələrinin nə qədər əhəmiyyəti varsa, zərb-məsəllərin də bizim üçün o qədər əhəmiyyəti vardır.

- Bəli, bəli, Feyzi bəy düz deyir, - deyə əksəriyyət qərara aldı ki, başımıza yenidən böyük bir bəla açmaqdansa, bir nəfəri ələ vermək daha yaxşıdır.

Məhəmməd bəy xanın yanına gələrkən onu tutmaq üçün 9 nəfər ən güclü əsgər ayırıb, dərhal onun dalınca adam göndərdilər.

Məhəmməd bəy gəlir. Məhəmmədhəsən ağanın göstərişi ilə qaradəmirçili Əmiraslan bəy onu bu təhlükədən xəbərdar edirsə də, o, dayanmayaraq, nökərlərini həyətdə qoyub, qardaşı Xankişi bəylə birlikdə xanın yanına gəlir.

Vicdan əzabı çəkdiyinə, yoxsa başqa səbəblərə görəmi onu xan əvvəlcə fikirləşdiyi kimi, həbsə almaq haqqında əmr verməyə cəsarət etmir, hətta Məhəmməd bəyin ədəb dairəsindən çıxıb ona qəbahət göstərməsinə də fikir vermir.

Peşman olmuş xan Məhəmməd bəy getdikdən sonra:

- Nə olur olsun, mən heç bir zaman öz igid qardaşım oğlunu ələ verməyə razı olmaram. Lakin indi bəla bundadır ki, əgər o bizim niyyətimizdən xəbər tutubsa, onu heç bir vəchlə inandırmaq mümkün olmayacaqdır. Məhəmmədhəsən ağa, sizə tapşırıram, hər necə olsa, tez onun yanına gedib, bu təhlükə barədə onu xəbərdar edəsən və mənim həmişə ona rəğbət bəslədiyimə Məhəmməd bəyi inandırıb, öz təhlükəsizliyi xatirinə müvəqqəti olaraq uzaq bir yerə getməsini ona məsləhət görəsən.

Lakin artıq gec idi. Məhəmməd bəy, xan çıxan kimi dərhal Şuşadan yola düşmüşdü. Hətta Məhəmmədhəsən ağanın şəhərin 40 verstliyində olan Tuğ kəndinə gəlib, xeyirxahlıq göstərməsi də inandırıcı nəticə vermədi. O hər şeydə bir tələ görür.

Məhəmməd bəy oradan Tərtər çayı sahilindəki Kələntərli malikanəsinə yola düşdü. Beləliklə, vəziyyətinin ağırlığı onun hərəkətlərinə də təsir göstərdi: Məhəmmədhəsən ağanın məsləhəti ilə, İranla ədavət edən Gürcüstana və ya heç olmasa Rusiyaya gedib Qarabağ xanlığının Rusiya təbəəliyinə qəbul edilməsinə kömək etmək əvəzinə, o özünün döyüş meydanındakı keçmiş rəqibi nuxah Kor Məhəmmədhəsən xanın fitnəkar sözlərinə inandı. Kor Məhəmmədhəsən xan and içib, onun yaxın adamlarını inandırdı ki, öz qızını Məhəmməd bəyə ərə verəcək və xanlığın idarə olunmasını da ona tapşıracaqdır, çünki kor olduğuna düşmənləri hər tərəfdən onun üzərinə qalxmışlar.

Bu kələk baş tutdu. Məhəmməd bəy Kür çayını keçib, Məhəmmədhəsən xan tərəfindən qəbul edildi. Lakin Məhəmməd bəyin gəlişinin altıncı günü, toya hazırlıq zamanı xanın əmri ilə onu xaincəsinə həbsə alıb, bütün sərvətini ələ keçirdilər[1].

Sonra onu qandallayıb güclü keşikçi dəstəsi ilə qan düşməni şirvanlı Mustafa xanın yanına göndərdilər. Mustafa xan isə Məhəmməd bəy tərəfindən öldürülmüş atasının, qardaşlarının və başqa qohum-əqrəbasından intiqamını alaraq onu şərəfsizcəsinə öldürdü[2].

## V

Qarabağ xanlığının gələcəkdə müstəqil qalması məsələsini fikrə gətirmək belə mümkün olmadığına görə Şuşada xanın qocalığından istifadə edən əyanlar bütün idarə işlərini öz əllərinə alaraq biri-birinə düşmən olan iki dəstəyə bölünmüşdülər. Bu dəstələrdən biri rusların Zaqafqaziyanın işlərinə qarışmasını gözləyərək heç bir vəchlə İrana tabe olmaq istəmir, digəri isə əksinə, Məhəmməd bəy kimi bir düşmənin aradan çıxmasından sevinərək, İran hökmdarını hər vasitə ilə razı salmağa çalışır. Bu dəfə İran tərəfdarları xanı da

---

1 Məlum olduğu üzrə, bütün Şərq işğalçıları, etibarlı oturaq yerləri olmadığına görə, qiymətli şeylərini həmişə öz yanlarında saxlayırdılar. Buna görədir ki, Məhəmməd bəy Ağa Məhəmmed xanın iqamətgahını ələ keçirərək oradan hədsiz-hesabsız sərvət, o cümlədən qiymətli daş-qaş, qızıl, gümüş, şal, silah və s. tapmışdı. Öz qardaşlarına, bacılarına və İbrahim xana verdiklərindən başqa, qalan qiymətli şeylər Şuşada, şəhərin kənarında, Kirs dağında basdırılmışdı, qalanları isə onun yanında idi; gözü ilə görənlərdən eşitdiyimə görə o, Kələntərliyə 80 yüklə gəlmişdi. Məhəmməd bəyin bu sərvəti basdırması barəsində xalq arasında deyirlər ki, o bu işi ermənilərə gördürür və sonra da onları öldürürdü.

Biz onu şəxsən tanıyan qocalardan bu barədə soruşduqda, onlar bu deyilən böhtanlardan acınacaqlı halda şikayətlənərək cavab verdilər ki, o doğrudan da bu işi gözübağlı ermənilərə və iranlı əsirlərə gördürürdü. Lakin o qədər ehtiyatlı hərəkət edirdi ki, onlardan heç biri sərvətin hansı tərəfdə basdırıldığını müəyyən edə bilməzdi. Lakin o, həmin adamlardan bir nəfərini belə öldürməyi fikrinə də gətirməmişdi.

2 Onun kədərli ölümü barəsində yaranmış çoxlu xalq mahnılarından, Valeh təxəllüslü gülablı Molla Səfinin ən mühüm hadisələr haqqında söylədiklərindən aşağıdakı parçanı misal göstərək:

Məhəmməd bəy kimi cəllad xunfəşan
Görməmişdi hər güzidə bir cahan.
Heyif ki, başadək sürmədi dövran,
Getdi ürəyində arzuman hanı!

öz tərəflərinə çəkərək üstünlük əldə etdilər. Bu dəstənin nümayəndələrindən Mirzəli bəy, Feyzi bəy və başqaları Fətəli şahın iradəsini yerinə yetirərək pişxidmət Səfərəlini Nuxa xanımdan tələb edib[1], onu at kimi nallayaraq, habelə Ağa Məhəmməd xanın tikə-tikə olmuş nəşini zər-zibaya bükərək, bunların hamısını müti bir itaətkarlıqla Tehrana göndərdilər. Bir müddətdən sonra, yenə də Fətəli şahın arzusuna görə, daha böyük bir ixlas ilə xanın oğlu Əbülfət xanı ona girov göndərdilər, xan qızı Ağabəyim ağanı (30) isə onu ərə verdilər. Şaha tam itaətkarlıq göstərmək əlaməti olaraq, Şuşada onun adına 30 qəpik qiymətində olan gümüş pul (1 sahib-qran) kəsməyə başladılar.

Fətəli şah onun ən böyük arzularını yerinə yetirməkdə belə canfəşanlıq göstərilməsi müqabilində mükafat olaraq, xana Qarabağ xanlığının gəlirindən başqa, Qaradağ xanlığının gəlirindən də istifadə etmək hüququ verdi.

1804-cü ilədək vaxt Qarabağda heç bir diqqətəlayiq dəyişiklik olmadan keçdi. Lakin bir müddət ərzində qonşuluqda baş verən çox mühüm hadisələr Qarabağ xanı və onun əyanlarını təfəkkür tərzinə bilavasitə təsir göstərdi.

Çoxdan bəri qonşu dövlət və xalqların basqınlarından əzab çəkən Gürcüstan, hər dəfə münasib fürsət düşdükdə, ona həmməzhəb olan Rusiya ilə birləşmək istəyirdi. O vaxtadək Gürcüstanın bu arzusu ona görə yerinə yetməmişdi ki, Rusiya ilə Gürcüstan arasında müstəqil və hərbçi çərkəz tayfaları yerləşmişdi və rusların onların ərazisindən keçib gürcülərə kömək əli uzatması asan deyildi. Lakin rus qoşunları Qafqaz dağlarının şimal ətəklərini tutduqdan sonra, onların Qafqaz sıra dağlarından keçməsi asanlaşdı. Buna görə də Ağa Məhəmməd xan axırıncı dəfə gürcülərin paytaxtını dağıtdıqdan sonra, onlar qüdrətli Rusiya imperatorunun təbəəliyini qəbul etdilər. Rus qoşunları Tiflisi tutdu və onların sərkərdələri Gürcüstan sərhədlərini düşmən hücumlarından qorumaq haqqında sərəncam aldılar.

Dağıstandakı ləzgilərin, İsveçrədəki kantonlar kimi, federativ cəmiyyət qurmaları və onların bərabərlik əsasında müstəqil olmaları yadların hücumunu ümumi qüvvələrlə, birlikdə dəf etməyə kömək edirdi. Buna görə də nə Çingiz xanın, nə Teymurun, nə osmanlıların və nə də Nadirin qoşunları onları öz zülmünə tabe edə

1 Səfərəlinin bir dustaq kimi Nuxadan aparıldığını, bizə bunu gözü ilə görmüş köçəri İmamqulubəyli Haqverdi kişi söyləmişdir.

bilməmişdilər. Bu rəvayətə və qonşu xalqlara nisbətən onların yuxarıda göstərilən daxili üstünlüklərinə görə, ləzgilər bütün Qafqaz ölkəsində üstünlüyü öz əllərinə almışdılar. Buna görə də onlar rus qoşunlarının Tiflisi tutması xəbərini aldıqda avarlı Ümmə xanın başçılığı ilə çoxlu adam toplayıb Gürcüstan sərhədlərinə soxularaq, rusları tamamilə qovmaq və ya qırmaq istəyirdilər. Bundan xəbər tutan general Lazarev ləzgilərin qarşısına çıxdı və sayca üstün olmalarına baxmayaraq, qanlı döyüşdə onları geri oturtdu (31). Sonra rus qoşunlarının baş komandam knyaz Sisianov[1] ikinci dəfə ləzgiləri cəzalandırıb onların dayağı olan Balakəni dağıtdı (32). İndi növbə ləzgi yırtıcılarına sığınacaq verən gəncəli Cavad xanın idi. Bu vaxta qədər o, rus təbəəliyini qəbul etməyə hazır olduğunu bildirmişdisə də, sonralar İrandan ona tezliklə kömək göstəriləcəyini vəd etmiş İran agentləri tərəfindən şirnikləndirilərək müqavimət göstərməyə hazırlaşırdı. Knyaz Sisianov onu Gəncə qalasında (Yelizavetpol) mühasirəyə aldı və bir ay davam edən mühasirədən sonra, 1804-cü il yanvarın 3-də hücum edib qalanı tutdu. Bədbəxt xanın özü öldürüldü. Bu vaxtlar İrəvan və Naxçıvan hakimləri - Məhəmməd xan və Kalbah xan İran hökmdarı qarşısında nə üçünsə müqəssir olduqlarına görə, İrəvan qalasında möhkəmlənərək, knyaz Sisianovdan tezliklə köməyə gəlməsini xahiş etdilər. Lakin həmin ilin yazında knyaz Sisianov çoxlu qoşunla İrəvana yaxınlaşdıqda, onlar nədənsə öz vədlərindən döndülər və İran vəliəhdi şahzadə Abbas Mirzəni köməyə çağırdılar. Fətəli şah, görünür, hökmən qazanılacaq qələbənin şərəfini öz oğluna vermək istəməyərək, çoxlu qoşunla Abbas Mirzənin ardınca gəldi. Knyaz Sisianov hadisələrin belə bir şəkil alacağını irəlicədən görə bilməzdi; rus qoşunları üçün ərzaq gətirilməsi məsələsi böyük çətinliklərlə əlaqədar olduğuna görə, o bir neçə qanlı vuruşmadan sonra Gürcüstana çəkildi. Lakin rusların iranlılarla bu ilk toqquşmasında bütün ölkə üçün belə bir fakt aydın oldu ki, şah və onun vəliəhdi İranın bütün qüvvələri ilə sayca nisbətən az olan rus dəstəsinin öhdəsindən gələ bilmədilər. Rus dəstələri isə nəinki döyüşə-döyüşə onların düşərgəsini tutmuşdu, hətta onların gözləri qarşısında uzun müddət İrəvanı mühasirədə saxlamışdı. Belə bir şəraitdə, Qarabağda ruslara hüsn-rəğbət bəsləyən Məhəmmədhəsən ağanın dəstəsi üstün gəldi. Həm də qeyd etmək

1 Bizim xalq arasında ona Şıpıxtur, yəni "inspektor" deyirlər.

lazımdır ki, o zamankı İran sərkərdələrinin və o cümlədən şahın özünün rəyinə görə, alınmaz qala olan Şuşa şəhəri iranlılar üçün Zaqafqaziyanın açarı, ruslar üçün isə İranın qapısı hesab edilirdi. Fətəli şah İbrahim xanla qohum olmaqdan başqa onun oğlu Əbülfəti öz yanında böyük hörmətlə girov saxlamasına, xana hər cür hörmət göstərməsinə baxmayaraq, Şuşanın İran qarnizonu tərəfindən tutulmasına təkid edə bilmirdi. Buna görə də onun yeganə çarəsi Əbülfətin əli ilə fitnə-fəsad törədib, belə bir mühüm məntəqəni ələ keçirmək idi. Fətəli şah belə də hərəkət etdi. O, İrəvandan, knyaz Sisianova qarşı yürüşdən geri qayıdarkən Əbülfət xanı güclü qoşun dəstəsi ilə orada saxladı ki, o həm Qarabağ xanlığının özünə irsən çatan hissəsini ələ keçirsin, həm də bu iş baş tutarsa, yeni əməliyyatla asanlıqla gəlib, indiki Zəngəzur qəzasının bir hissəsini ələ keçirsin. Bundan bir az sonra o, xanın Məhəmmədhəsən ağa və başqaları ilə birlikdə Tuğ kəndində olmasından xəbər tutub, güclü dəstə ilə xanı və Məhəmmədhəsən ağanı həbsə almağa cəhd etdi. Lakin bədbəxtlikdən gecə xanın oğlanları Mehdiqulu xan və Xanlar ağa güclü süvari və piyada dəstələri ilə özlərini xana yetirdilər.

Bunların heç birindən xəbəri olmayan Əbülfət xan öz iranlı dəstələri ilə Tuğa yaxınlaşır və onu hər tərəfdən mühasirəyə almaq haqqında əmr verdi. Lakin döyüş başlanarkən iranlılar hər tərəfdən qəti müqavimətə rast gəldilər və geri çəkilməyə başladdar; həm də elə bir nizamsızlıqla geri çəkildilər ki, Əbülfət xan on-on beş atlı ilə birlikdə çətinliklə Arazın o tayına keçə bildi. Onun düşərgəsi və yükləri isə çoxlu əsirlə birlikdə qaliblərin əlinə keçdi.

Bu hadisədən sonra Məhəmmədhəsən ağa öz tərəfdarları ilə birlikdə qəti qələbə çaldı. Onun təkidi ilə bir neçə nəfər adlı-sanlı bəy adından knyaz Sisianova məktub apardılar. Həmin məktubda xan iranlıların pis niyyətlərindən şikayətlənib, rus imperatorunun təbəəliyinə daxil olmaq haqqında özünün, öz əyanları və təbəələrinin qəti arzusunu bildirirdi. Məktubun cavabını bir nəfər qərargah zabiti gətirdi; haman cavabda müqavilə bağlanmasının vaxtı və yeri haqqında əvvəlcədən razılığa gəlmək təklif edilirdi.

Beləliklə, 1805-ci ilin mayında, xanlığın sərhədində, Kürəkçay sahilindəki düşərgədə, Yelizavetpolun (20 verstliyində) knyaz Sisianov Qarabağ xanlığının rus imperatoruna sədaqəti haqqında andını qəbul etdi. Bağlanan şərtlərə görə:

1. Şuşalı və qarabağlı İbrahim xan iranlı və hər hansı bir başqa dövlətdən hər cür vassallıq və asılılıqdan həmişəlik imtina edir və yalnız rus imperatorunun hakimiyyətini qəbul edir.

2. Xan qonşu hakimlərlə heç bir əlaqə saxlamamağı öz üzərinə götürür. Onlardan alınan məktublardan öz məzmunu etibarı ilə daha mühüm olanları baş komandanın həllinə göndərilməli, az mühüm olanları haqqında isə Gürcüstandakı baş hakimin İbrahim xanın yanındakı nümayəndəsinə xəbər verilməli və bu barədə ondan məsləhət alınmalıdır.

3. Onun ərazisində saxlanılan rus qoşunları üçün baş komandan tərəfindən təsdiq edilən qiymətlərlə ərzaq tədarük edilməlidir.

4. Qoşunlar üçün bina ayrılmalı və odun verilməlidir.

5. Yelizavetpoldan Şuşaya gedən yol arabaların rahat getməsi üçün qaydaya salınmalıdır.

6. Sədaqət əlaməti olaraq, xan böyük oğlandan olan nəvəsini həmişəlik Tiflisdə yaşamaq üçün girov verməlidir.

7. Xan hər il 8 min çervon bac verməli və bunu iki müddətdə: fevralın 1 -də, sentyabrın 1 -də ödəməlidir.

Bunun müqabilində xana aşağıdakılar vəd edilmişdir:

1. Onun mülki salamat saxlanılır, xanlığın idarəsi irsi, böyüklüyə görə nəsildən-nəslə keçir və bunu rus imperatoru təsdiq edir; məhkəmə işləri, cəza vermək və vergi toplamaq xanın ixtiyarında saxlamlır.

2. Xanın evində daimi saxlamaq üçün üzərində rus gerbi olan bayraq bağışlanır, xanın əmanət təyin edilən nəvəsinin gündəlik xərci 10 manat gümüş pul ilə müəyyən edilir (33).

İbrahim xanın təkidi ilə həmin yerə, bir qədər bundan əvvəl Nuxa xanlığını idarə etməyə təyin edilmiş kürəkəni Səlim xan da gəlir. O da həmin şərtlərlə və öz himayəsindəki camaatla birlikdə rus imperatorunun təbəəliyini qəbul edir. Həmin il oktyabrın 25-də şuragəlli Budaq-Sultan və dekabrın 25-də şirvanlı Mustafa xan da rus təbəəliyini qəbul edirlər. Bundan sonra Arazın o tayındakı xanların elçiləri bir-birinin ardınca baş komandanın yanına gəlib, eyni şərtlərlə rus təbəəliyinə daxil olmağı təklif etdilər.

Şuşa şəhəri, 1883-cü il
Əhməd bəy Cavanşir

## QEYDLƏR

1. Keçən əsrin sonları dedikdə, XVIII əsrin sonu nəzərdə tutulur.

2. Mirzə Camal (1773-1774-1853) fars dilində yazılmış "Qarabağ tarixi" adlı əsərin müəllifidir.

Mirzə Camalın həyat və fəaliyyəti tarix ədəbiyyatında az işıqlandırılmışdır. XIX əsrin ortalarında məşhur qafqazşünas Adolf Berje "Tarixi-Qarabağ tarixi" əsərini rus dilinə tərcümə edərkən Mirzə Fətəli Axundzadəyə müraciət edərək, Mirzə Camalın bioqrafiyası haqqında məlumat verməsini ondan xahiş etmişdi. Mirzə Camalı şəxsən tanıyan M.F Axundzadə onun oğlu ilə məktublaşıb, atası haqqında məlumat toplayaraq, nəşr olunmaq üçün A.Berjeyə verir (bax: "Kavkaz" qəzeti, 1855-ci il, № 61).

Bu məlumatdan aydın olur ki, Mirzə Camal Cavanşir nahiyəsinin Xocalı kəndində, xan xidmətçilərindən olan Məhəmmədxan bəyin ailəsində anadan olmuşdur. Müəllifin atası Məhəmmədxan bəy öz atası minbaşı Səlif bəyin ölümündən sonra Cavanşir tayfasının başçısı, sonra da Şuşanın qalabəyisi (komendantı) olmuşdur. Mirzə Camal müəyyən təhsil aldıqdan sonra İbrahim xanın arvadı Bikəxanımın işlər müdiri vəzifəsinə təyin olunur və həmin vəzifədə ikən təhsil almaq üçün Dağıstanın Xunzax kəndinə göndərilir. O, burada 6 il qalaraq ərəb dilini öyrənir. Ağa Məhəmməd şahın öldürülməsindən sonra Mirzə Camal Dağıstandan qayıdır və Bikəxanımın zəmanəti üzrə xanın etimadını qazanır. İbrahim xan onun atasının xidmətini nəzərə alaraq, Mirzə Camalı Qarabağ xanlığının vəzir-katibi təyin edir. Mirzə Camal bu vəzifədə İbrahim xanın ölümünə qədər (1806) qahr və sonralar J.L.Nebolsinə bilavasitə tabe olan Məhəmmədhəsən ağanın yanında xidmət edir.

1822-ci ildə Qarabağ xanı Mehdiqulu xan İrana qaçdıqdan sonra o, A.P.Yermolovun göstərişi ilə dəftərxana katibi təyin olunaraq P.İ.Magilevskinin, Madatovun, Reuttun və başqalarının yanında xidmət edir. Mirzə Camal 1840-cı ilə qədər qulluq etdikdən sonra istefaya çıxmış və 1853-cü il aprelin 8-də vəfat etmişdir.

Mirzə Camalın "Qarabağ tarixi" əsərində Qarabağın 1813-cü ilə, yəni Gülüstan sülh müqaviləsi bağlanana qədər tarixi əhatə edilir. Bu əsər qiymətli tarixi faktlarla çox zəngindir.

Mirzə Camalın əsərinin bir hissəsinin rus dilinə tərcüməsi "Kavkaz" qəzetinin 1855-ci il 61, 62, 63, 67 və 69-cu nömrələrində Camal Cavanşir Qarabaği adı ilə dərc edilmişdir. Əsərin çap olunmuş həmin hissələri yeni-

dən 1884-cü ildə "Kavkaz" qəzetinin 139, 150, 154, 167-ci nömrələrində dərc edilmişdir.

3. Mirzə Adıgözəl bəy (1770-1848) Haqverdiyev oğlu Qarabağ bəyləri nəslindən olub, öz dövrünün savadlı adamlarından biri idi. 20 yaşında Tiflisdə gürcü çarının sarayında olan Rusiya naziri Kovalenskinin yanında qulluğa girən Mirzə Adıgözəl bəy sonralar müxtəlif vəzifələrdə çalışmış və rus ordusu kapitanı rütbəsinə qədər yüksəlmişdi. Öz əlinə böyük var-dövlət keçirmiş Mirzə Adıgözəl bəy 1830-cu ildə istefaya çıxır. O, ömrünün son illərində Qarabağ məhkəməsində iclasçı vəzifəsində olmuş və xanlığın bütün siyasi işlərinə qarışmışdı. 1845-ci ildə Mirzə Adıgözəl bəy Tiflisin vitse-qubernatoru podpolkovnik Mixail Petroviç Kolyubakinin tapşırığı üzrə Qarabağın tarixini yazmış və "Qarabağnamə" adlanan bu əsərdə xanlığın 1736-cı ildən 1828-ci ilə qədər siyasi tarixini əks etdirməyə çalışmışdır.

Müqəddimə, on iki fəsil və müəllifin öz yazdığı tərcümeyi-halından ibarət olan bu əlyazması ilk dəfə Azərbaycan və rus dillərində 1950-ci ildə Azərbaycan SSR EA Tarix İnstitutu tərəfindən nəşr olunmuşdur.

4. Mir Mehdi Xəzani (1811-1893) Axund Seyid Mir Mehdi Həşim bəy oğlu Müsəvi Qarabaği "Kitabi-tarixi Qarabağ" əsərinin müəllifidir. O, Zəngəzur qəzasının Mamırlı kəndində anadan olmuş, sonralar isə Tuğ kəndinə köçmüşdür. Ərəb və fars dillərində təhsil alınış Mir Mehdi "Xəzani" təxəllüsü ilə bir şair kimi məşhur idi.

Onun Azərbaycan dilində yazılmış "Kitabi-tarixi Qarabağ" əsəri bu vaxta qədər çap olunmamışdır. Müəllif bu əsərində Mirzə Camaldan və Mirzə Adıgözəl bəydən fərqli olaraq bəzi iqtisadi məsələlərə və Qarabağın xanlıq dövründəki inzibati bölgü məsələlərinə toxunur. Bu əsərdə Şuşa şəhərinin binasının qoyulması, Vaqifin həbs olunması, öldürülməsi və bir neçə mühüm məsələlər yuxarıda adları çəkilən müəlliflərə nisbətən daha ətraflı şərh olunmuşdur. "Kitabi-tarixi Qarabağ" Azərbaycan SSR Elmlər Akademiyasının Respublika Əlyazmalan Fondunda saxlanılır (inv. № 14).

5. Pənah xanın Hülakü xanın (1256-1265) nəvəsi Arqun xanın (1284-1291) nəslindən olması haqqında müəllifin ehtimalını mənbələr təsdiq etmir. Bəzi tədqiqatçılar Cavanşir tayfalarının mənşəyini aydınlaşdırarkən Rzaqulu xan Hidayətin "Rövzətüs-cəfa" əsərinə istinad edirlər. Bu əsərdə deyilir ki, Oşirxan tayfasına mənsub olan Cavanşir elatı Türküstandan gəlmişdir. Oşirxan İldız xanın oğlu, o da Uğuz xanın dördüncü oğludur. Onlar ovşarlar və ya əfşarlar adlamrdılar. Cavanşir tayfası Hülakü xanın 120 minlik ordusunun tərkibinə daxil olmuşdu. Onlar Əmir Teymurun hökmranlığı dövründə ikinci dəfə Rumdan geri qayıdaraq Türküstan, Qəndəhar, Kabul və İrana dağılırlar. Bu tayfanın bir qolu Səfəvilər dövründə (I Şah Abbas)

İbrahim Xəlilağanın başçılığı ilə Qarabağda və Aranda qalmışdı. Nadir şahın hökmranlığı dövründə bu qolun başçısı İbrahimxəlil xan idi. Şah onları Sərəxsə köçürmüşdü. Nadir şahın öldürülməsindən sonra Cavanşir tayfasının bir hissəsi Sərəxsdən Qoryana köçərək həmişəlik orada qaldı. Abdallı Əhməd xan müstəqillik alan kimi Cavanşir əhlini Qoryandan Kabula köçürür. Nəhayət, Pənah xan Kabuldan Qarabağa köçərək Şuşa qalasının bünövrəsini qoyur (bax: "Rövzətüs-səfa", 1270, hicri).

Lakin başqa mötəbər mənbələrdə Cavanşir tayfasının adı monqol hökmranlığı dövründəki tayfalar içərisində çəkilmir. I Şah Abbasın saray tarixçisi İskəndər bəy Münşir tayfa başçılarının adını əsla çəkmir və onları qızılbaş tayfalarına mənsub olmayan müxtəlif tayfa əmirləri sırasına daxil edir (bax: "Tarixi-aləmarayi-Abbasi", litoqrafik nəşr, Tehran, 1314 hicri, səh.762).

XVI əsrdən başlayaraq yerli hakimlər Qarabağda, xüsusən Bərdənin cənubunda yerləşən Azərbaycanın yerli köçəri tayfalarını məcburi olaraq birləşdirirlər. Bu müxtəlif tayfaların süni birləşməsi tarixə "Otuziki" adı ilə daxil olmuşdur. Bu tayfalar içərisində Cavanşir tayfası sayca və qüdrətcə digər tayfalardan seçilirdi. Onun başçısı isə eyni zamanda bütün otuz iki tayfanın başçısı hesab olunurdu. Hazırda İmişli rayonunda "Otuziki" adlı balaca bir kənd də qalmışdır.

6. Bu zərb-məsəlin müxtəlif mənbələrdə müxtəlif variantları vardır. Mirzə Adıgözəl bəy yazır: "Hacı Çələbi qayıdarkən demişdi: Pənah xan bu vaxtacan bir sikkəsiz gümüş idi, biz gəldik, ona sikkə vurduq və qayıtdıq" (bax: bu kitabda, səh.41).

7. Bu məlikin adını Mirzə Adıgözəl bəy Məlik Hüsü yazmışdır (bax: bu kitabda, səh.42).

8. Bu haqda Mirzə Adıgözəl bəy yazır: Nadir şahla osmanlı sərəskəri Köprülü oğlu Abdullah paşa arasında olan müharibədə Məlik Allahqulu çox şücaət və igidlik göstərdi. Nadir şah da məliklik xələtini onun qabiliyyətli vücuduna layiq görmədi, ona sultanlıq rütbəsi və xələti verdi. O (Nadir şah) əmr etdi ki, bundan sonra xas və avam camaat ona məlik deyil, sultan desin. (Bax: bu kitabda, səh.44).

9. Bu məliklər sonralar Gülüstan məlikləri adlandırıldılar. Çünki feodal ara müharibələri zamanı onlar öz iqamətgahını Gəncədən 25 verst cənub-şərqdə yerləşən İnciçayın yuxarısındakı Gülüstan qalasına köçürmüşdülər.

10. Cırmıx - Cıraberdin ixtisar edilmiş adıdır.

11. Əmiraslan xan Nadir şahın qardaşı oğlu, həm də onun hərbi sərkərdələrindən biridir. Təbriz hakimi və Azərbaycan valisi olmuşdur (bax: П.Г.Бутков. Материалы для новой истории Кавказа, I hissə, SPb, 1896, səh.235-236).

12. Əfqanlı Azad xan olmalıdır. Nadir şahın xidmətində olub, uzun müddət Cənubi Azərbaycanda olmuş və Nadir şahın ölümündən (1747) sonra şahlıq uğrunda gedən feodal müharibələrində iştirak etmişdir. Azad xan 1751-ci ildə Təbrizi tutaraq İrəvan üzərinə hərəkət edir, lakin İrəvan xanına köməyə gələn gürcü çarı II İraklinin müqavimətinə rast gələrək (bax: Г.Кикодзе. Ираклий второй. Tbilisi, 1945, səh.35-37) geriyə dönür. 1756-cı ildə Azad xan Mazandaran yaxınlığındakı vuruşmada Məhəmmədhəsən xan Qacar tərəfindən məğlub edilərək Rəştə çəkilir və 1757-ci il yanvarın 31-də baş vermiş vuruşmada ikinci dəfə məğlub olaraq Kürdüstana qaçır. Sonralar Azad xan hərbi ittifaq bağlamaq üçün II İraklinin yanına gəlir, II İrakli isə onu tutub, İran hökmdarı Kərim xan Zəndə verir. Azad xan Şirazda həbsxanada qoca yaşlarında vəfat etmişdir.

12. Müəllif səhv edir, qarabağlı Pənah xan, qaradağlı Kazım xan, naxçıvanlı Heydərqulu xan və gəncəli Şahverdi xan arasında bağlanan ittifaq gürcü çarı II İrakliyə qarşı yox, nuxah Hacı Çələbiyə qarşı çevrilmişdi. Belə ki, Mirzə Adıgözəl bəyin dili ilə desək, bütün Şirvan ölkəsinin hakimi və həmişəlik sahibi-ixtiyarı olan Hacı Çələbi onlarla hesablaşmır və dostluq yolunu düzlüklə getmir (bax: "Qarabağnamə", səh.58).

Müttəfiqlər Gəncə şəhərindən bir qədər yuxarı Qızıl Qaya adlanan yerdə toplaşaraq Hacı Çələbiyə qarşı birgə hərəkət etmək üçün plan tərtib etməyə başladılar. Lakin gürcü çan öz əshabələrinin məsləhəti ilə onları aldadıb yanına gətirdi və dördünü də tutub həbs etdi (Bu hadisə 1752-ci il martın 21 -də olmuşdur. B a x: Описание событий ананимной грузинской хроники. E.S.Tokaysvilinin tərcüməsi. Сборник материалов для описания местностей и племен Кавказа. 21-ci buraxılış, səh.37). Bu xəbəri eşidən Hacı Çələbi II İrakli üzərinə hərəkət edərək Nizami məqbərəsi yanında onu məğlub etdi, yuxarıda adları göstərilən xanları isə əsirlikdən azad etdi.

14. Şuşa qalasının bünövrəsinin 1754-cü ildə qoyulması haqqındakı fikir səhvdir. Bu səhvi birinci dəfə Mirzə Camal buraxaraq, Şuşanın əsasının qoyulmasını 1170-ci il hicri göstərmişdir (bax: Camal Cavanşir. "Qarabağ". A.Berjenin tərcüməsi, "Kavkaz" qəzeti, 1855, N° 61-62). Həmin tarixi Mirzə Adıgözəl bəy də göstərir (b a x: bu kitabda, səh. 131). 1170-ci il hicri, 1756-cı il avqustun 26-da başlanıb 1757-ci il avqustun 14-də qurtarmışdır. Lakin əldə olan faktlar aydın göstərir ki, həmin illərdə Şuşa qalası Qarabağdan çox-çox uzaqlarda məşhur idi, yadelli işğalçılar isə bir-birinin dalınca bu alınmaz qalanın qapılarını döyürdülər. Hal-hazırda əldə etibarlı mənbə olmadığından bu suala cavab vermək çətindir. Hər halda 1751 -ci ildə əfqanlı Azadxan, İrəvanı mühasirə edərkən Şuşa qalası nəinki var idi, hətta orada "Pənahabad" adında pul da kəsilirdi.

15. Kərim xan Zəndin (1658-1779) Mehrəli bəyə, onun Qarabağ xanlığına hakim təyin olunması haqqında fərman verməsi, başqa mənbələrdə təsdiq olunmur. Biz bu fərmanın olması haqqında məlumata, ötəri də olsa, heç bir yerdə rast gəlməmişik. Əksinə, mövcud faktların çoxu göstərir ki, Kərim xan Zənd İbrahim xana fərman verərək onu Qarabağa hakim göndərmişdi (bax: A.Bakıxanov, Gülüstani-İrəm, Bakı, 1926, səh.131). Mirzə Adıgözəl bəy bu haqda yazır: "O, (Kərim xan Zənd - Ş.Ə.*)* İbrahimxəlil ağanı hüzuruna çağıraraq ona qiymətli xələt, cavahiratla bəzədilmiş bir qılınc, qızıl yəhər və yaraqlı bir at bağışladı. Qarabağ vilayətinin xanlıq fərmanını ona verib, evə qayıtmasına izn verdi" (bax: bu kitabda, səh.55).

16. 1174-cü il hicri 1760-1761-ci illərə mütabiqdir. Bu vaxtlar Pənah xan sağ deyildi. Görünür, müəllif bu ili başqa mənbələrdən götürmüşdür. Bizə məlumdur ki, Pənah xanın ölüm tarixi onun Ağdamda olan İmarət adlanan yerdəki qəbrinin mərmər daşı üzərində şeirlə əbcəd hesabı ilə həkk olunmuşdur.[1]

Bu kitabənin axırıncı sətrində (şerin axırı) Pənah xanın ölüm ili (1172) hicri verilir.

Əldə olan məlumata görə, Pənah xan 1172-ci hicri ilinin yayında ölmüşdür. Ona görə də onun 1759-cu ildə ölməsi düzgün hesab edilməlidir. Belə ki, 1172-ci ilə 1758-ci il sentyabrın 4-də başlanmış və 1759-cu il avqustun 24-də qurtarmışdır. Deməli, Pənah xan 1759-cu ilin iyul və ya avqust aylarında ölmüşdür, çünki həmin ilin iyun ayında İrəvan xanı Hüseynəli xan Şuşaya, onun yanına gəlməyə hazırlaşırdı. Eçmiədzin monastırının məxaric kitablarında yazılmışdır ki, Hüseynəli xan Pənah xanın yanına getməyə hazırlaşarkən müqəddəs keşişdən 100 tümən tələb etmişdi. "Lakin biz ona yalvarıb (dedik ki) yoxumuzdur, bizə güzəşt edib 50 tümən aldı. İyun, 1759-cu il" (bax: Б.М.Арутюнян. Крупные монастырские хозяйства в Армении в XVII-XVIII вв., 1940, səh. 12).

17. A.Bakıxanovun verdiyi məlumat daha mötəbərdir: "1199 (1785)-cu ildə Fətəli xan Şirvanda Ağası xan və onun müttəfiqi Məhəmməd xanla müharibə edərkən İbrahim xan qarabağlının yanından qaçan qardaşı Mehrəli bəy onun (Fətəli xanın - Ş.Ə.*)* yanında idi. O (Mehrəli bəy), gecə Bakıdan çıxaraq Fətəli xanın qərargahına gedərkən Ağası xanın oğlu Əhməd bəylə qabaqlaşır və bu vuruşmada öldürülür. Fətəli xan bu hadisədən istifadə edərək onun nəşini böyük ehtiramla Qarabağa göndərir" (bax: A.Bakıxanov. Gülüstani-İrəm, Bakı, 1926, səh.136).

---

1 Qələm rəhmət dəftərinə onun tarixini belə yazdı: "Onun dost və aşnaları xalqın pənahı oldu". (B a x: "Известия Азкомстариса", 3-cü buraxılış, Bakı, 1927)

18. Ağa Məhəmməd xanın şirazlı Seyid Məhəmməd Ürfi təxəllüslü şairin qəsidəsindən seçdiyi bu beyt belə yazılır:

Zi məncəniqi-fələk səngi-fitnə mibarəd,
To əbləhanə girifti miyani-şişə qərar.

19. Bu beytin düzgün tərcüməsi belədir:

Fələkin mancağından fitnə daşı yağır,
Sən axmaqcasına şişə içərisinə sığınmısan.

20. İbrahim xan bu beyti alan kimi vəziri Molla Pənah Vaqifə müraciət edir. O da şaha belə cavab yazır:

Gər nigahdari-mən anəst ki, mən midanəm,
Şişəra dər bağəli-səng nigəh midarəd.

21. Bu beytin düzgün tərcüməsi belədir:

Əgər məni qoruyan mənim bildiyimdirsə,
O, şişəni daşın qoltuğunda mühafizə edər.

22. Şuşanın İran qoşunları tərəfindən mühasirəsi 33 gün davam etmişdir (bax: Грамоты и другие исторические документы XVIII столетия, относящиеся к Грузии. II cild, II buraxılış, 1769-cu ildən 1801-ci ilə qədər. SPb, 1902, sənəd 37, səh. 93).

23. Ağa Məhəmməd şahın qoşunları Tiflisə 1795-ci il sentyabrın 12-də soxulmuşdur (b ax: П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г., II hissə, SPb, 1869, səh. 339).

24. İran işğalçıları Gürcüstan şahzadəsi Davidə görə 3000 əsir (bax: Царевич Давид. Краткие истории о Грузии со времен первого в ней населения. SPb, 1805, səh. 137), P.Q.Butkova görə 10 minəsir (bax: П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г ., II hissə, səh. 340) və Dubrovinə görə 30000 əsir (bax: Qeorqiy XII) aparmışdılar.

25. Zubov Valerian Aleksandroviç (1771-1804) general-mayor rütbəsində 1794-cü il Polşa üsyanının yatırılmasında iştirak etmiş və çöldə hərbi xəritə çəkərkən ayağından yaralanmışdı. Onun həmin ayağını sonralar kəsmişdilər.

26. II Yekaterina 1796-cı il noyabrın 6-da ölmüşdür.

27. Sodom-İordan çayının yuxarısındakı Siddim vadisində yerləşən beş şəhərdən biridir. Rəvayətə görə, bu şəhərin əhalisi əxlaq cəhətdən çox düşkün olduğundan, o biri dörd şəhərin əhalisi ilə birlikdə Allahm qəzəbinə keçmişdi. Göydən düşən od parçası şəhəri yandırmış və onu batırmışdı.

28. Hamarra - qədim Fələstində Ölü dənizin yaxınlığında yerləşən şəhərdir. Əfsanəyə görə, bu şəhərin də əhalisi əxlaq cəhətdən də çox pozğun olduğu üçün Allahın qəzəbinə keçmişdi. Göydən düşən bir od parçası bu şəhəri də yandırıb Yer üzündən silmişdi.

29. Ağa Məhəmməd şah 1797-ci il iyun ayının 11-də öldürülmüşdür (bax: П.Г.Бутков. Материалы для новой истории Кавказа 1722 по 1803 г., II hissə, səh. 430).

30. Ağabəyim ağa - İbrahim xanın gəncəli Cavad xanın qızı Tuti Bəyimdən olan qızıdır. Azərbaycan və fars dillərində yazılmış və çap edilmiş şeirlərin müəllifidir. 1834-cü ildə Fətəlişah Qacarın ölümündən sonra məscidə girərək özünü tərkidünya elan edir və İranın Qum şəhərində ölür. Çar hökuməti onu Rusiya və İran arasında ziddiyyətlər törətməkdə təqsirləndirirdi.

31. Bu döyüş 1800-cü il noyabrın 7-də İora çayının sahilindəki Kakabetu kəndinin yaxınlığında baş vermişdir. Rus ordusuna general-mayor Lazarev komandanlıq edirdi. Ümmə xan (Ömər xan) ordusunun tərkibində, ləzgilərdən başqa, şahzadə İoannanın qəddar düşməni olan şahzadə Aleksandrın başçılığı ilə Ümmə xan tərəfə keçən gürcülər də var idi (bax: General-mayor Lazarevin 1800-cü il noyabrın 8 və 14-də general-leytenant Knorrinkə raportu. Aktı Кафказской Археографической ко миссии, I cild, sənəd 109 və 111, səh. 168, 170-175).

32. Rusiya qoşunlarının Car-Balakənə hərbi səfəri 1803-cü ilin aprelində general-mayor Qulyakovun komandası altında olmuşdur (bax: Knyaz Sisianovun 1803-cü il aprelin 17-də yazdığı raport. AKAK, II cild, sənəd 1387, səh. 685).

33. Н.Дубровин. Закавказье от 1803 г., SPb, 1866.

## MÜNDƏRİCAT

